*Bu əsər "**Nizami Gəncəvi**. Xosrov və Şirin" (Bakı, Yazıçı, 1982) kitabı əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərcümə edəni: **Rəsul Rza**

İzahların müəllifi: **Məmmədağa Sultanov**

Ön sözün müəllifi: **Həmid Araslı**

Elmi redaktor: **Xəlil Yusifli**

**894.361'1 - dc 21**
**AZE**
**Nizami Gəncəvi. Xosrov və Şirin**. Bakı, "Lider nəşriyyat", 2004, 392 səh.

Dahi Nizami Gəncəvinin "Xosrov və Şirin" əsəri "Xəmsə"nin ikinci kitabıdır. Şair bu əsərində məhəbbətin böyüklüyünü, insan ağlını, düşüncəsini tərənnüm edərək əsrlərlə unudulmayan bədii surətlər, ədəbi qəhrəmanlar yaratmışdır. Bu qəhrəmanlar sırasında dünya ədəbiyyatı xəzinəsinin gözəl incisi olan Şirin öndə durur.

Böyük mütəfəkkir şair bu poemasında həm də Şərq ədəbiyyatında ilk dəfə olaraq əmək adamını - Fərhad surətini dərin məhəbbətlə qələmə almış, onu həm əmək, həm də eşq fədası kimi şahlara nümunə göstərmişdir.

**ISBN 9952-417-08-8**

## ÖLMƏZ MƏHƏBBƏT DASTANI

Nizami Gəncəvi Yaxın Şərq xalqları mədəniyyətinin inkişafı tarixində müstəsna rolu olan dahi sənətkardır. Böyük şairin zəngin yaradıcılığı qədim tarixə malik Azərbaycan mədəniyyətinin inkişafında da yeni parlaq mərhələdir. Nizami öz əsərlərilə Şərq ictimai bədii fikrində yeni bir səhifə açmış, bədii yaradıcılığa əsrlər boyu təqdir olunub məhəbbətlə izlənilən, bu gün belə öz həyati əhəmiyyətini itirməyən ölməz ənənələr gətirmişdir. Onun yeni məzmunlu lirik şeirləri və sonralar "Pənc gənc" ("Beş xəzinə") adı ilə şöhrətlənən poemaları dünya ədəbiyyatı xəzinəsini bəzəyən nadir incilərdir. Hələ "Xəmsə"nin ilk əsəri olan "Sirlər xəzinəsi"ndə söz sənətinin təsiredici qüvvəsindən müasirlərini mənən təmizliyə çağırmaq kimi bəşəri bir məqsəd üçün faydalanan şair dövrünə görə çox mütərəqqi problemlərə toxunmuş, yüksək bəşəri ideyalar tərənnüm etmişdir. Şairin Şərq şeirinə gətirdiyi belə ölməz ideallar "Xəmsə"nin ikinci poeması "Xosrov və Şirin" əsərində daha geniş, daha vüsətli və daha aydın şəkildə ifadə olunmuşdur.

Nizami 1180-ci ildə tamamladığı bu poemasında insatı eşqinin qüdrət və əzəmətini göstərmiş, məhəbbətin dərin ictimai mənasını şərh etmişdir. Poemanın Azərbaycan xalqının tarixi ilə səsləşən maraqlı məzmunu vardır. Azərbaycan ədəbiyyatı tarixində ilk mənzum roman olan bu əsər Sasani hökmdarlarından Xosrov Pərvizlə Bərdə hakiminin vəliəhdi gözəl Şirin arasındakı məhəbbət haqqındadır. Minacat, nət və zəmanə şahlarının mədhi kimi rəsmi giriş fəsillərindən sonra şairin əsərin yazılışı, söz sənəti və eşq haqqındakı mülahizələri gəlir. Bu hissələrdə şair şeir sənəti, şairlər haqqında danışır, bədii əsərin gözəlliyini şərtləndirən xüsusiyyətlərdən söz açır. Burada sözün yüksək dəyəri, sənətkar əzəməti, şeir, sənət aləminin ülviliyi kimi maraqlı mülahizələrlə qarşılaşırıq.

Söz ruhdur, can üçün böyük dərmandır,
Cantək əzizliyi bəlkə ondandır.
Gör dünyada necə fərsiz insan var,

Bir quru çörəyə canı satırlar.
Söz deyən qəvvasdır, söz isə gövhər,
Bu gövhər çox çətin əmələ gələr.

Belə çətin əldə edilən, sənətkarın böyük zəhməti, yuxusuz gecələri bahasına başa gələn bu əvəzsiz nemətin - sözün qədrini bilmək, onu maddi nemətlərlə dəyişməmək, eyni zamanda ucuz tutmayıb qənaətlə işlətmək lazımdır.

Sözündə çoxluğa qoyma yer olsun,
Birin yüz olmasın, yüzün bir olsun.
Su artıb həddini aşarsa əgər
İçəni doydurmaz, mütləq qərq edər..
...Çox söyləmək sənə bəlkə asandır,
"Çox oldu" desələr böyük nöqsandır.

Şair dövrünün ədəbiyyat maraqlılarının istəyi, zövqü haqqında da danışır, sənətkar qarşısında yeni vəzifələr qoyur, köhnə ədəbi ənənələrdən uzaqlaşmaq, mövzunu həyatdan almaq, həyat həqiqətlərini əks etdirmək, ağılkəsməz əfsanələri deyil, gerçəkliyə uyğun əhvalatları qələmə almağı təbliğ edir:

Qiymətdən salmışdır sözü yalanlar,
Doğrunu danışan möhtəşəm olar.
Dedi sübhi-sadiq çünki doğrunu,
Dünyalar qızıla tutdurdu onu.
Sərv də qaldırmış düzlük bayrağı,
Onunçun həmişə göydür yarpağı.

Nizami mövzunun mənşəyi, onun xalq yaradıcılığı və bədii ədəbiyyatdakı əksi barədə məlumat verir. O, mövzuyla bağlı tarixi nümunələri sayır, tarixi kitablardan və xalq ədəbiyyatından faydalandığını bildirib, Fərhada isnad edilən tarixi abidələri xatırlayır:

Xosrovdan, Şirindən qalan yadigar
Gizlində deyildir, durur aşikar:
Şəbdiz atın şəkli, Bisütun dağı,
Pərviz sarayının eyvanı, tağı...

Həqiqətdə də Mədain xərabələri yaxınlığında Bisütun dağında həkk olunmuş əsrarəngiz xətlər və şəkillər vardır ki, xalq içərisində də bunlara dair bir çox əfsanələr yaranmışdır; Fərhad və Şirin macərası o zaman xalq arasında müxtəlif şəkillərdə söylənilərək bir sıra rəvayət və dastanların yaranmasına səbəb olmuşdu. Fərhad və onun yaratdığı sənət abidələri haqqında Azərbaycan ərazisində, xüsusilə, daha rəngarəng rəvayətlər mövcud idi. Nizami də öz əsərini yazarkən belə rəvayətlərdən faydalanmışdır.

Nizami bu mövzunu ilk dəfə yazılı ədəbiyyata gətirən Firdovsini xatırlayır, sələfindən fərqləndiyini, qədim tarixlə bağlı olan bu məşhur mövzunu tamamilə yeni bir tərzdə işlədiyini bildirir:

Söylərkən o həkim bu xoş dastanı,
Çıxarıb içindən eşqi, fəğanı.
Altmış yaşındaydı yazanda bunu,
Saxlaya bilmirdi yayda oxunu.
Altmışda sevginin, eşqin həycanı
Titrədə bilməzdi yorğun qocanı.

Doğrudan da, Firdovsi "Şahnamə"də bu mövzuya həsr etdiyi bəhsdə əsasən Xosrovun şahlıq dövründən geniş danışmış, onun cah-calalını, apardığı müharibələri və s. özünəməxsus şahnaməçilik üslubunda canlandırıb onun Şirinlə evlənməsini təsvir etmişdir. Firdovsi öz qəhrəmanının daxili aləmi, onların təbii hiss, həyati meyl və duyğularını, mənəvi təkamül yolunu işıqlandırmağı əsas məqsəd götürməmiş, Fərhadın adın belə çəkməmiş, Şirini isə Məryəmin qatili kimi qələmə almışdır. Nizami isə məhəbbəti əsas götürərək, təmiz eşqin saflaşdırıcı təsirindən danışmış, onun insan taleyində oynadığı mühüm rolu aydınlaşdırmış, bir sıra canlı, dərin psixoloji surətlər yaradaraq insanın mənəvi təkmilləşmə prosesini göstərmişdir. O, tarixi əsası olan rəvayətləri də yaradıcılıq məqsədinə uyğun hala salaraq şair xəyalının məhsulu olan əlavələrlə zənginləşdirmiş, xalq ədəbiyyatı və Firdovsi əsərindən fərqlənən orijinal sənət nümunəsi yaratmışdır.

Qeyd edildiyi kimi, şair əsərini əsasən məhəbbət üzərində qurmuşdur. Əsərin müqəddiməsində də o, bu məsələyə xüsusi yer ayırmış, eşq haqqında maraqlı mülahizələr söyləmişdir:

Eşqdir mehrabı uca göylərin,
Eşqsiz, ey dünya, nədir dəyərin?!
Eşqin qulu ol ki, doğru yol budur,
Ariflər yanında, bil, eşq uludur.
...Eşqsiz olsaydı xilqətin canı
Dirilik sarmazdı böyük cahanı.
Eşqsiz bir adam bir neydir - qırıq,
Yüz canı olsa da, ölüdür artıq.

Dünya ədəbiyyatının məhəbbət mövzusunda yazılmış əsərləri içərisində müstəsna yer tutan bu dastanda şair insanlara yüksək hisslər aşılayan, onları qabaqcıl ideyalar uğrunda mübarizəyə səsləyən ülvi məhəbbətdən söz açmışdır. Şairin tərənnüm etdiyi bu məhəbbət oxucuya ilham verir, onu daim irəliyə, qəhrəmanlığa, fədakarlığa sövq edir.

Nizami bu əsərində yeri gəldikcə dövrünün aktual məsələlərinə toxunmuş, ədalətli hökmdar, dövlətin idarəsi, rəiyyətə qayğı kimi ictimai-siyasi əhəmiyyətli fikirlər söyləmişdir. Şairi bütün yaradıcılığı boyu düşündürən ədalətli şah arzusu bu poemada da aydın şəkildə öz əksini tapmışdır. O, özünün mütərəqqi ideyalarını poemada yaratdığı Hürmüz şah, Məhin Banu və nəhayət, Şirin kimi ədalətli şah obrazları vasitəsilə ifadə etmiş, Hürmüz şahın rəiyyətin rahatlığı naminə gördüyü işləri, Məhin Banunun xalqla ədalətli rəftarını, Şirinin hökmdarlıq illərindəki firavan yaşayışı və s. təsvir etmişdir.

Nizami Hürmüz şahın rəiyyətin xeyrinə qoyulmuş qanunları pozan doğma övladını amansız cəzalandırdığını göstərməklə qanun qarşısında hamının bərabər olması kimi dövrü üçün çox aktual, həm də qabaqcıl bir ideya irəli sürür. Axı orta əsrlərdə qoyulan qanunlar feodal əyanları tərəfindən pozula bilir və onlar məsuliyyətə cəlb olunmurdular. Nizami isə qanunu pozanların, xalqa zərər yetirənlərin, şahzadə olsa belə, amansız cəzalandırılmasını zəruri hesab edirdi. Odur ki, şair Hürmüzün bu ədalətli hökmünü ürəkdən alqışlayır, təsvir etdiyi hadisəni dövrü ilə bağlamağa cəhd edərək ötəri şəkildə dövrünün ədalətsizliklərindən şikayətlənir:

Hanı o ədalət, o insaf hanı?
Verə öz oğluna belə cəzanı.
İndi yüz yoxsulun tökülsə qanı,
Durub tərəf çıxan bir adam hanı?

Yaxud Şirinin hökmdarlıq dövrünü götürək. Nizami öz qəhrəmanını həm də ədalətli hökmdar kimi təsvir edərək yenə də müasirlərinə örnək göstərmişdir. Xalqla məhəbbətlə rəftar edən Şirin zülmü büsbütün ölkədən götürür, xalq bacdan azad edilir, kəndlidən xərac alınmır. Şair belə bir ədalət sayəsində hər tərəfdə bolluq olduğunu, xalqın firavan yaşadığını qeyd edərək ölkə başçısının xalqa qayğısı haqqındakı şəxsi qənaətlərini söyləyir:

Şahın niyyətləri xoş olsa əgər
Otdan gül yerinə min gövhər bitər.
Ölkədə rahatlıq, bolluq olurkən
O yerin şahından verəcək nişan...

Nizami ədalət haqqındakı mütərəqqi görüşlərini əsərinin əsas mövzusu olan məhəbbətlə məharətlə əlaqələndirmişdir. Xosrovu mənən ucaldan, onun alicənab təbiətli bir insan olmasına kömək edən məhəbbət həm də onu ədalətli bir şah səviyyəsinə qədər yüksəldir. Əsərin sonlarına yaxın oxucu onu elmi məclislərdə, bilicilərin əhatəsində, elmə, fəlsəfəyə dair mübahisələrdə iştirak edən görür. Nizami Şirinin diliylə Xosrova ədalət dərsi verən zaman da sanki dövrünün ixtiyar sahiblərinə üz tutur, onları ədalətə, düzlüyə, elmə çağırır:

Bəd duadan saqın, mehriban danış,
Pusquda durmasın yolunda qarğış.
Birdən qoca qarı, cavan ah çəkər,
Hədəfə ox vurar erkən bir səhər...
Şahların əlində çox ayna, baxsan,
Qaralıb getmişdir məzlum ahından...
Dünyada zülm etmək qoçaqlıq deyil,
Rəiyyət bəsləmək çox yaxşıdır, bil.

Qadınlığa yüksək münasibət bəsləyən şair Şirinin simasında qadınlığın ən gözəl sifətlərini toplayaraq Yaxın Şərq ədəbiyyatında ilk dəfə olaraq hərtərəfli işlənmiş müsbət qadın obrazı yaratmışdır. Əsərin əvvəlində Şapurun dili ilə təqdim edilən Şirin öz yüksək mənəviyyatı, sədaqəti, qoçaqlığı ilə elə ilk görüşdən oxucuların rəğbətini qazanır. Şirin poemanın əsas qəhrəmanıdır. Həyati gözəllikləri sevən,

təbii nemətlərdən bacardıqca səmərəli faydalanmağa çalışan bu Azərbaycan gözəlini şair həm də elmə, biliyə rəğbət bəsləyən, ilk məhəbbətinə son nəfəsinə qədər sadiq olan fədakar bir sevgili kimi təsvir edir. Biz at oynadan, qılınc vuran, ox atan, çövkan oynayan şən və qəhrəman bir qızın qiyabi bir məhəbbətin ardınca getdiyini görürük.

Yaratdığı bu ideal qadın obrazı ilə çox tez itirdiyi sevimli qadını Afaqa əbədi abidə ucaltdığını qeyd edən şair onu vətən qızlarına xas cəsarət, qürur, ismət, mənəvi yüksəklik, mərdlik kimi gözəl sifətlərlə səciyyələndirmiş, öz qəhrəmanını hər cür yaramaz, alçaq hərəkətlərdən uzaq, zəhmət və hünəri qiymətləndirməyi bacaran həssas bir adam, yaxşı dost, vəfalı ömür yoldaşı kimi əbədiləşdirmişdir.

Qadını həmişə cəmiyyətin tam ləyaqətli bir üzvu kimi görməyi arzulayan böyük şair tarixdən aldığı bu obrazı öz humanist ideyaları baxımından işləyib, qadınlıq haqqında yüksək fikirlərini onun vasitəsilə ifadə etmişdir. Şair tükənməz bir məhəbbətlə sevən Şirini saf mənəviyyata malik, ismətli qadınlıq qürurunu yüksək tutan bir adam kimi oxucularına sevdirir. Şirin nəhayətsiz dərəcədə sevdiyi Xosrovla kəbinsiz evlənmir. Ona Xosrovun gizlicə saraya gəlmək təklifini yetirən Şapura acıqlanaraq:

Mən gövhərəm, neçin gərək əksiləm,
Çağrılmamış gedəm, məgər mən yeləm?

- deyərək öz şərəfini alçaltmayacağını qəti bildirir. Şair xarici görkəmcə çox gözəl təsvir etdiyi sevimli qəhrəmanının daxili aləmini də olduqca zəngin, onun gözəl hüsnü ilə səsləşəcək səviyyədə göstərir. O, sərxoş halda qəsrə gələn Xosrova qapı açmır, onu rədd edir, kəbinsiz evlənməyəcəyini söyləyir. Nəhayət, kəbin kəsildikdən sonra evlənir və sevgilisindən əli üzüldüyü zaman isə özünü öldürür. Şirinin öz sevgilisinin məzarı üstündə intihar etdiyini təsvir edərkən də şair onun bu fədakarlığını alqışlamaqla bərabər qadınlıq haqqında danışmış, qadını ülvi bir varlıq kimi tərifləmişdir:

Alqış bu ölümə, əhsən Şirinə,
Öldürən Şirinə, ölən Şirinə.
Məhəbbət yolunda ölüm budur, bax,

Canana belədir canı tapşırmaq...
Çox gözəl arvad var mərdlikdə bir şir,
Çox ipək içində şirlər gizlənir.

Şirin dahi Nizami tərəfindən son dərəcə məharətlə, hərtərəfli işlənmiş, dünya ədəbiyyatı tarixində xüsusi yeri olan bir obrazdır. Belə yüksək, ağıllı və hərtərəfli müsbət təsvir edilən qadın obrazlarına Qərbi Avropada sonrakı əsrlərdə Şekspirdə təsadüf edirik. Dantenin Beatriçesi də bir çox xüsusiyyətləri ilə Şirinlə müqayisə edilə bilər.

Şirin öz sevgilisi Xosrovu ata yurdunu düşmənlərdən qorumağa vadar edir, onun mənasız, kefcil həyatını dəyişdirir, elmə, fəlsəfəyə cəlb edir. Beatriçe də öz sevgilisinə düzgün istiqamət verir, onu yüksəldir, əbədi səadətə çatdırır. Lakin Şirin həyat qızıdır, həqiqət rəmzidir, məhəbbət mücəssəməsidir. Beatriçe isə ilahiyyatın, teologiyanın mücəssəməsidir. Dantenin "İlahi komediyası"nda olan mistika, xristian görüşləri Nizami poemasındakı dərin həyat fəlsəfəsi ilə müqayisə edilə bilməz. Bu cəhətdən Şirin surəti Beatriçedən fərqlənir. Biz Şekspirin qadın surətlərini Şirinlə daha yaxşı müqayisə edə bilərik. Bu cəhətdən Cülyetta surəti daha səciyyəvidir. Cülyetta Qərbi Avropa ədəbiyyatının Leylisidir. Lakin bir çox cəhətdən onun Şirin surətinə də yaxınlığı vardır. İdeal məhəbbətin qarşısına çıxan əngəllərlə mübarizə bacarığı, sədaqət və həyatilik dünya ədəbiyyatının bu füsunkar qadın surətlərinin müştərək cəhətləridir. Cülyetta da ilk gündən Romeoya məhəbbəti kəbinlə möhkəmlətməyi təklif edir. O da bütün əzablara dözür və nəhayət, Şirin kimi sevgilisinin cənazəsi üzərində intihar edir.

Poemanın əsas qəhrəmanlarından olan Xosrov da şairin ictimai-siyasi görüşlərini ifadə edən obrazdır. Nizami hələ ilk poemasında qoyduğu "pisliklərdən qayıtmağın mümkünlüyü və zəruriliyi" kimi mühüm bəşəri fikrini bu əsərində daha aydın və olduqca maraqlı hadisələr fonunda oxuculara çatdırır. Bu baxımdan Xosrov obrazının mənəvi təkamülə doğru inkişafı daha səciyyəvidir. Şair həyatın mənasını ancaq əyləncələrdə axtaran, kef məclislərində əylənməyə alışmış qayğısız bir şahzadəni mənəvi inkişaf prosesində alaraq yüksək insani keyfiyyətlər əxz etmiş müsbət obraza çevirir. Şair Xosrovun mənəvi təkamülə doğru inkişafını təsvir etməklə həm də dövrünün şahzadələrinə təsir etmək istəmiş, onları tərbiyələndirmək məqsədi izləmişdir.

Şair söz sənətinin öyrədici təsir qüvvəsinə inanaraq naz-nemət içərisində böyümüş, hələ ilk gənclik illərindən atasının ədalət naminə verdiyi qanunları pozan, daha sonralar isə Şirinin saf məhəbbətini dəfələrlə təhqir edən, ölkə və xalq qeydindən uzaq, Fərhad kimi əzəmətli sənətkarın ölümünə bais olan və dəfələrlə düşüncəsiz hərəkətlərə yol verən Xosrovun şahlıq qürurundan, mənəvi boşluqdan birdən-birə deyil, tədricən yaxa qurtara bildiyini göstərir. O, sevgini əsl mənada dərk etməyə başlayaraq, əsərin sonlarına doğru alicənab bir insan səviyyəsinə yüksəlir. Uzun müddət keçirdiyi ruhi iztirablar Xosrova təsir edir. Məğrur şah məhəbbətin bütün mənəvi təkmilləşdirici təsiri ilə yüksəlir, Şirinin iradəsi, saf eşqin qüdrəti onu məğlub edir. O, Şirinlə evləndikdən sonra əxlaqi cəhətdən yüksək bir insan olaraq həyatı anlayır.

Əsərin sonunda Xosrovun dünya, həyat, ölüm məsələləri ilə maraqlandığını, alim və bilicilərin məsləhətlərini dinlədiyini, artıq dövlət işlərində də ədalətli bir şah olduğunu görürük. Xosrov Şiruyənin göndərdiyi qatil tərəfindən ölümcül yaralandığı zaman da susuz can verərək həyatla əbədi vidalaşır, ancaq yenicə yuxuya getmiş yorğun Şirini narahat etmək istəmir. Bu səhnə məğrur şahın necə dəyişdiyini daha aydın göstərir.

Nizami Xosrov surətini belə inkişafda verməklə dövrünün şahzadələrinə ibrət dərsi vermiş, insanların tərbiyə vasitəsilə əxlaqi cəhətdən yüksək səviyyəyə qalxa biləcəyinə inamını ifadə etmişdir.

"Xosrov və Şirin" poeması əməyin tərənnümü, insan hünərinə, insan zəkasına inam, zəhmətə, əməkçi xalqa məhəbbət kimi misilsiz keyfiyyətlərilə seçilməkdədir. Bu baxımdan əsərdə çox gec görünüb tez də səhnədən çıxan Fərhad obrazı xususilə səciyyəvidir. Nizaminin əməkçi insanlar içərisindən seçərək böyük məhəbbətlə təsvir etdiyi bu obraz sənətkar vüqarı, insan hünəri, ləkəsiz mənəviyyat, saf, ülvi bir məhəbbət təcəssümü olub şair tərəfindən bədii yaradıcılığa gətirilən idealları aydınlaşdırır. Nizami mahir bir sənətkar, fədakar aşiq kimi təsvir etdiyi bu qəhrəmanını əsərin əsas obrazı olan Xosrova qarşı qoyur, əsərinin bir yerində bu iki aşiqi qarşılaşdırır. Xosrovla Fərhadın üz-üzə gəldiyi bu səhnə poemanın ən maraqlı, dramatik hissələrindəndir. Burada iki məvəviyyat, biri-birindən kəskin fərqli məhəbbətlə sevən iki aşiq üzləşir: bunlardan birisi tacidar, ikincisi isə sadə xalq nümayəndəsidir. Lakin bütün həşəmət və cahü-calalına

baxmayaraq Xosrov Fərhadın əqli, zəkası, cəsarəti qarşısında özünü itirir. Bu mərd insanın əzmi və fədakar məhəbbəti şahı çıxılmaz vəziyyətə salır. Fərhad öz sənəti, zəka və inadlı zəhməti ilə də qalib gəlir. Bu qalibiyyət eyni zamanda hünərin, saf məhəbbətin xəbislik və zorakılıq üzərindəki mənəvi qələbəsi kimi səslənir. Xosrov onu yalnız hiylə və xəyanətlə öz yolundan götürə bilir.

Nizami əməkçi insanlar içərisindən seçdiyi qəhrəmanını şaha qarşı qoyaraq əməyin, sənətin şahlıqdan üstünlüyü kimi öz dövrunə görə çox cəsarətli bir fikir irəli sürür. Təsadüfi deyildir ki, bu səhnə Nizami ardıcıllarının əsərlərində bir qədər dəyişdirilmişdir. Xosrov Dəhləvi, Arif Ərdəbili, Nəvai və başqa şairlər əzəmətli şahı sadə zəhmət adamı ilə qarşılaşdırmaqdan çəkinmişlər. Fərhadı şahzadə kimi təsvir edərək mənşəcə bərabər, eyni hüquqlu iki şəxsi üz-üzə gətirmişlər.

"Xosrov və Şirin" əsərində əsas qəhrəmanlardan başqa hadisələrin təsvirində bir sıra şəxsiyyətlər də iştirak edirlər. Məhin Banu, Büzürgümid, Hürmüz, Barbəd, Şapur, Şirinin rəfıqələri və başqaları. Bunların içərisində Məhin Banu, Hürmüz kimi ədalətli hökmdarlarla yanaşı Barbəd, Nikisa kimi sənətkar obrazları da diqqəti cəlb edir. Sənətin insan mənəviyyatına təsiri kimi bütün poema boyu müşahidə edilən xüsusiyyət bu obrazlar vasitəsilə özünü göstərir. Nizami Şapurun məharətli sənətindən danışır, gözəl sənətin mənəviyyata təsir edib, insanda nəcib duyğular oyatdığını çox təbii göstərir.

Poemada şair Büzürgümid kimi bilici obrazı yaradaraq onun diliylə həm həyati nəsihətlərini, həm də dünya, yaradılış və s. haqqındakı görüşlərini ifadə edir.

"Xosrov və Şirin" poemasının quruluşu da çox maraqlı və orijinaldır. Əsər bütün orta əsr poemaları kimi minacat, nət, kitabın yazılması səbəbi, Toğrul Arslan, Məhəmməd Cahan Pəhləvan və Qızıl Arslanın tərifi, eşq haqqında şairin mülahizələri kimi giriş fəsillərlə başlanır. Bütün bunlardan sonra əsərin məzmunu gəlir. Hadisələr Xosrovun atası Hürmüzün hakimiyyətinin təsviri ilə başlayır. Xosrovun doğulması, böyüməsi, Hürmüzün ədaləti və s. təhkiyə tərzində verilir. Sonra Şapur Şirin haqqında danışır. Mükalimələr, deyişmələr, Xosrovla Şirinin umukûsüsü və s. çox maraqlı və təbii şəkildə, bir çox hallarda musiqi məclislərində, çalğıçıların nəğmələrində canlandırılır. Hər iki aşiqin məhəbbət yolundakı iztirabları, qarşılaşdıqları maneələr, meydana çıxan əngəllər və s. əsəri daha da maraqlı edir, oxucunun həyə

canını artırır. Şair ana xəttin aydın ifadə və inkişafına kömək edən əlavə sərgüzəştlərlə məzmunu zənginləşdirmiş, həyatın ağır sınaqlarından keçmiş əsl məhəbbəti qələmə almışdır. İnsan taleyində həyatın, gözlənilməz hadisələrin və təsadüflərin böyük rolunu göstərən sənətkar insan səadətinin, xoşbəxtliyin asan deyil, ağır zəhmət, olmazın dəyanət, mübarizə bahasına qazanıldığını göstərmək istəmişdir.

Düzəltmək istəsə bir işi fələk
Əvvəlcə min oyun çıxarsın gərək.
Xəznə vermiş olsa bir əkinçiyə
Gərək o əkinçi əvvəl inciyə.
Həyatın yolunda olmasa tikən
Olarmı güllərin qədrini bilən?

Nizami yaratdığı xarakterik obrazların səciyyəsini onların yalnız iş və hərəkətlərini təsvir etməklə deyil, daxili aləmlərini açmaqla göstərir. O, insan mənəviyyatını bütün incəliyi ilə şərh edərək qəhrəmanlarının dəruni hisslərini, düşüncə və duyğularını, psixoloji gərginliklərini, ruhi, mənəvi sarsıntılarını, həyəcan və iztirablarını çox bədii, həm də inandırıcı bir tərzdə qələmə alır, insan təbiətini bütün məxsusi ziddiyyətləri ilə göstərməyə müvəffəq olur.

Şair eyni zamanda lirik haşiyələrlə hadisələrə öz münasibətini bildirir. Bu məzmundan kənar haşiyələr isə qədim bir tarixlə bağlı olan mövzunu şairin öz zəmanəsilə bağlayır, onun zəmanə va müasirləri haqqındakı tənqidi görüşlərini ifadə edir. Elə buna görə də şair belə ricətlərini ötəri şəkildə qələmə alır. Poemada hadisələrin təsviri içərisində belə haşiyə-beytlərə təsadüf edirik:

Çox kəndli zəhmətlə yığar yüz xirmən,
Bircə arpa almaz bu yüz xirməndən.
Əkmədən çox məhsul alanlar da var,
Gör nələr törədir qoca ruzigar.

Belə bədii haşiyələrdə şairin həyati nəsihətləri, təsvir edilən əhvalatlar və təbii hadisələrdən aldığı qənaətləri də öz əksini tapmışdır. Bu isə əsərin ictimai əhəmiyyətini bir daha artıraraq ona müasirlik ruhu bəxş edir. Şairin oxucuya etdiyi həyati nəsihətlər içərisində

həddindən artıq özunə güvənməmək, yersiz qürurdan, xudpəsəndlikdən qaçmaq, təvazökarlığa dəvət, qənaətlə yaşamaq və s. haqqındakı mülahizələrilə qarşılaşırıq. Xüsusilə övlad məsələsi, ata-oğul münasibəti, gəncliyin tərbiyəsi, ata qayğısı və s. ilə əlaqədar şairin maraqlı görüşləri diqqəti cəlb edir. Şair ləyaqətli övladı valideyn üçün böyük səadət hesab edir:

Övladın iqbalı əgər yar olar,
Ata sevincindən bəxtiyar olar.

- deyərək gəncliyi cəmiyyətin gələcəyi hesab edir. Şair həm də gəncliyə nikbin bir ruh aşılayaraq həyatı, gözəllikləri dərindən duymağı, ömrün ən əziz çağını şad keçirməyi, mənalı ömür sürməyi təlqin edir:

Həyat aləmidir hər şeydən üstün,
Cavanlıq günüdür ən qiymətli gün.
Həyatdan yaxşı şey dünyada nədir?!
Gənclikdən gözəl şey bir əfsanədir.

Nizami təmiz ad, mənəvi gözəlliklər haqqında danışanda da ilk növbədə gəncliyə üz tutur, yüksək əxlaq, təmiz mənəviyyat haqqında bu gün də öz əhəmiyyətini itirməyən tərbiyəvi fikirlər söyləyir:

Dünyanın yarısı əgər xoş gündür,
Yarısı yaxşı ad qoymaq üçündür.

Yaxud Məhin Banunun Şirinə elədiyi nəsihətləri götürək. Burada da şair gəncliyə müraciət edir, Məhin Banunun diliylə təmiz əxlaq haqqında danışır, həya, ismət dərsi verir.

Nizami öz müasirlərini mübarizliyə, qarşıya çıxan maneələrə müqavimət göstərməyə çağırır, çətinliklərə mərdliklə sinə gərməyi öyrədir:

Kimin ki, alnının aynası bərkdir,
Xoş günü dünyada o görəcəkdir.
Bənövşələr kimi utancaq olan

Dünyada boy atmaz heç vaxt, heç zaman.
Nərgiz gülü kitni utanmaz olan
Başı taclı olar, hər işi asan.

Nizami müasirlərini həmişə nikbinliyə, çətin anlarda da ümidi itirməməyə, səbrli olmağa, qarşıya çıxan ağır vəziyyətə dəyanət göstərməyə səsləyir. Şair bütün bunları çox təsirli, poetik bir gözəlliklə oxucuya çatdırmağa çalışır. Misal olaraq yenə də Məhin Banunun Şirinə təsəlli verdiyi səhnəni alaq. Dahi şair Şirinə təskinlik verən bu ağıllı qadının diliylə dediyi öyüdləri məharətlə ümumiləşdirir:

Dedi: "Bir neçə gün səbr elə, çalış,
Heç kəs həmişəlik darda qalmamış.
Gül kimi tez açıb görünmə aşkar,
İti axan sular tez körpü yıxar...
Top kimi yıxılıb qalxsan yaxşıdır,
Hər yıxılan bir gün qalxacaq axır...
Bu günkü sərtliyə dözəsən gərək,
Kim bilir ki, sabah nə göstərəcək!"

Nizami hamını şad görmək istəyən, humanist bir sənətkar olaraq insanlara xudpəsənd, xəbis olmamağı, xoşbəxtliyi digərlərilə bölüşdürməyi, şəxsi şadlıqdan hamıya pay verməyi, öz səadəti ilə başqalarını da sevindirməyi təlqin edir:

Təkbaşına kimsə dünyanı udmaz,
Təkcə bir insanın şadlığı tutmaz.
Ağıllılar bilir tək yesə bir kəs
Təklikdə də ölər, dost-aşna görməz.
Çay suyu olsa da sən içmə yalqız,
Dəniztək olarsan acı, qılıqsız.

Şairin qəhrəmanları da ətrafdakılarla belə davranır, öz sevinclərini yaxın yoldaşlarla bölüşürlər. Vəfalı dost, yaxşı yoldaş haqqında şairin maraqlı mülahizələri nəzəri cəlb edir.

Heç bir işdə olma yarsız, yoldaşsız,
Dünyada misilsiz Allahdır yalnız.
Dünyada çox iş var yoldaşdan aşar,
Yaman gündə çatar dada yoldaşlar.

Başqa bir yerdə:

Dost qəlbi torpaqdır, ona əl vursan
Əlin paka çıxar o saat, inan.

Belə haşiyə-hissələrdə şairin təsvir elədiyi hadisələrdən qəhrəmanların vəziyyəti, psixoloji anları, onların ruhi, mənəvi halları və s. son dərəcə poetik bir gözəllik, bədii sözün ecazları, həyatdan alınmış ibrətamiz məsəllər, təbii bənzətmələrlə ifadə olunur. Dahi şair əsl sənətkar kimi öz qəhrəmanlarının həyatı ilə yaşayır, sevincli günlərini məhəbbət və şadlıqla, kədərli dəqiqələrini isə məyusluqla təsvir edir.

Belə anlarda şair bəzən bədbinliyə də qapanır, həyatın amansız qanunlarından söz açır, dunyanın vəfasızlığını bildirir. O, təbiət təsvirlərini də hadisələrə uyğun şəkildə tərənnüm edir. Azərbaycan təbiətinin gözəlliklərini, xüsusilə Bərdənin çəmənliklərini, Kəpəz dağının və Göy gölün fusunkar mənzərəsini oxucuya sevdirir. Bu təbiət təsvirləri hadisələri tamamlayır. Şair hər bir hadisədən çıxardığı nəticəni qısa misralarla yekunlaşdırır. Bu misralar atalar sözləri kimi mənalı səslənir.

Şair bir sıra Azərbaycan sözləri də işlədərək Qədir xan, Qara xan, Toğrul xan ifadələrini ənənəvi Cəmşid, Nuşirəvan, Kəsra ifadələri kimi ədəbiyyata daxil edir.

Qabaqcıl siyasi-ictimai əhəmiyyətli fikirləri aydm və bədii ifadə etmək bacarığı, dilinin yığcamlığı, hər fıkrin yeni və son dərəcə bədii məcazlarla canlandırılması, söz ehtiyatının çoxluğu, şairin mübaliğə, təşbeh, istiarə, təzad və s. bədii vasitələrdən yerli-yerində və məharətlə faydalanmaq qüdrəti bu poemaya dünya şeir xəzinəsində layiqli yer tutmaq haqqı verir.

"Xosrov və Şirin" öz dərin məzmunu və yüksək şeiriyyəti, orijinal kompozisiyası, dilinin bədiiliyi, obrazlar aləminin zənginliyi ilə Yaxın Şərq ədəbiyyatında yaranan Nizami adı ilə bağlı yeni ədəbi məktəbin - Nizami ədəbi məktəbinin ilk müvəffəqiyyətli nümunəsidir. Hələ

XIII əsrdə məşhur hind şairi Əmir Xosrov Dəhləvi (1253-1327) 1298-ci ildə Nizaminin bu əsəri mövzusunda "Şirin və Xosrov" adlı poemasını yazmışdır. Yaxın Şərq ədəbiyyatında Nizami ənənələrinin ilk davamçısı kimi tanıdığımız bu qüdrətli sənətkar öz poemasında Nizami əsərindəki sosial-ictimai kəskinliyi yumşaltmağa çalışsa da, əsasən Nizami ideyaları ilə bağlı olmuş və şairin Şərq şeirinə gətirdiyi ölməz ənənələri izləmişlər. XIV əsr Azərbaycan şairi Arif Ərdəbili isə ilk dəfə Nizami tərəfindən epik şeirdə canlandırılan Fərhadı əsas qəhrəman götürərək özünün "Fərhadnamə" poemasını yazır. Arif əsasən Azərbaycan ərazisində mövcud tarixi nişanələrə istinad etsə də, Nizami əsərindən çox faydalanmış, dahi şairin əmək, zəhmət, sənət haqqındakı yüksək fikirlərini əks etdirən bir poema yaratmışdır. XV əsr şairlərindən Marağalı Əşrəf də bu mövzuya müraciət etmişdir. Nizami dühasından bəhrələnib şairin "Xəmsə"sinə özbək dilində layiqli cavab yazan Əlişir Nəvainin "Fərhad və Şirin" əsəri də bu mövzuda yazılmış qiymətli sənət nümunəsidir. Əlişir Nəvai "Xəmsə"sinə daxil olan digər poemalarında olduğu kimi bu əsərində də Nizamini hörmətlə xatırlamış, dahi şairin mövzularında əsər yaratmağı bir sınaq meydanı kimi aşağıdakı beytlə qiymətləndirmişdir:

Sanma bu meydanda asandır durmaq,
Nizamilə pəncə-pəncəyə vurmaq

"Xosrov və Şirin" mövzusunda Kövsəri, Vəhşi Kirmani, türk şairlərindən isə Ahi, Cəlili, Əhməd Rizvan, Lamii kimi şairlər də maraqlı əsərlər yaratmışlar. Bu mövzu xalq ədəbiyyatında geniş yayılmış, Yaxın Şərq şairləri Fərhad və Şirin adlarını qüdrət, məhəbbət, gözəllik, sədaqət, fədakarlıq rəmzi kimi işlətmişlər. Aşıqlar tərəfindən xüsusi "Fərhad" dastanı yaradılmışdır. Bu mövzu öz aktuallığını dövrümüzə qədər qoruyub saxlamışdır. Şairin anadan olmasının 800 illiyi münasibətilə Azərbaycanın xalq şairi Səməd Vurğun (1906-1956) özünün məşhur "Fərhad və Şirin" əsərini yazmışdır. Səməd Vurğun öz böyük sələfinin zəhmət, mərdlik kimi ideyalarını əsas götürərək onları əsrinin mühüm siyasi hadisələri ilə sənətkarcasına əlaqələndirmiş, vətənpərvərlik, el məhəbbəti, vətən uğrunda qəhrəmanlıq kimi günün zəruri problemləri ilə səsləşən cəhətləri ön plana çəkmişdir. Məşhur türk şairi Nazim Hikmət də 1948-ci ildə qələmə aldığı

"Məhəbbət əfsanəsi" əsərində məhəbbət problemini xalqla bağlılıq, el yolunda fədakarlıq kimi keyfiyyətlərlə zənginləşdirmişdir.

Müasir türk şairi Ceyhun Qansu özünün "Fərhad və Şirin" mövzusunda yazdığı poemasında Fərhadı xalqına su yetirən fədakar qəhrəman kimi təsvir etmişdir.

Göründüyü kimi, dahi Nizaminin mühüm bəşəri ideallar ifadə edən bu ölməz əsəri həmişə görkəmli söz ustalarının ilhamına qüvvət vermiş, müxtəlif əsrlərdə yaşamış sənətkarlar bu mövzuya dəfələrlə müraciət edib həmin mövzuda yeni-yeni gözəl sənət əsərləri yaratmışlar.

"Xosrov və Şirin" əsəri Şərq məhəbbət poemalarının yaranmasında böyük rol oynamışdır. Şərq ədəbiyyatında iki qəhrəmanın məhəbbət macərasından bəhs edən poemaların əksəriyyətində Nizaminin bu əsərindən, xüsusən şairin eşq haqqındakı mülahizələrindən geniş faydalanmışlar.

Nizaminin bu əsəri türk epik şeirinə də qüvvətli təsir göstərmiş, orta əsrlərdən başlayaraq dəfələrlə türk dilinə tərcümə olunmuşdur. Hələ XIV əsrin tanınmış türk şairi Əhmədi özünün "Cəmşid və Xurşid" adlı əsərində Nizaminin bu poemasından faydalanmış, hətta oradakı bəzi parçaları, o cümlədən məhəbbət haqqında yazılmış parçanı türkcəyə çevirmişdir. Bu növ tərcümələrə Əhməd Rizvan, Cəlili kimi türk şairləririn "Xosrov və Şirin"lərində də təsadüf etmək olur.

Nizaminin "Xosrov və Şirin" poeması XIV əsrin ortalarında yaşamış Qızıl Orda şairi, xarəzmli olduğu təxmin olunan Qütb təxəllüslü şair tərəfindən qədim özbək dilinə tərcümə edilmişdir. Qütb tərcuməsinin 1383-cü ildə İskəndəriyyədə Bərgə Fəqih adlı qıpçaq bir ziyalı tərəfindən köçürülmüş yeganə əlyazması Paris milli kitabxanasında saxlanılır. 1959-cu ildə həmin əlyazması Polşa alimi Zaynçkovski tərəfindən əsərin foto surəti ilə birlikdə yeni əlifba ilə iki cilddə nəşr edilmişdir. Qütb əsərin müqəddiməsində:

Qazantək qaynab uş sevda pişürdüm,
Nizami balidən həlva pişürdüm.
Xanım atınğa uş bu parsi dilni
Çevürdüm, tüzdüm uş nəzm üzrə qılnı.

- deyərək əsəri tərcümə etdiyini bildirir. İndi artıq elm aləmi üçün maraqlı tədqitat obyekti olan, Qazanda və Daşkənddə dəfələrlə nəşr

olunan bu əlyazması təkcə özbək xalqının deyil, bütün türkdilli xalqların mədəniyyət tarixinin öyrənilməsində dəyərli bir abidədir.

XV əsr türk şairi Şeyxinin "Xosrov və Şirin"i isə Nizami poemalarının ən yaxşı tərcümələrindən biri kimi məşhurdur. Şeyxi bəzi fəsilləri ixtisar edib, bir çox əhvalatlar əlavə etməsinə baxmayaraq, əsasən Nizami əsərinin dərin məzmunu və bədii gözəlliyilə türk oxucusunu tanış edən dəyərli bir tərcümə əsəri yaratmışdır. Şeyxi həmin tərcuməni Sultan Murada təqdim etdiyindən qəhrəmanların ölüm faciəsini qəsdən tərcümə etməmişdir. Onun bu tərcüməsi həmin mövzuda yazılan digər türk poemalarına da böyük təsir göstərmişdir.

Poema 1949-cu ildə görkəmli türk alimi Əli Nihat Tərlan tərəfindən məzmunca türk dilinə tərcümə olunmuşdur. Bu tərcümədə Əli Nihat Tərlan Nizami əsərinin məzmununu türk dilində qısaca nəql edərək, poemadakı bəzi parçaları eynilə nəsrə çevirmişdir. Əsər Nizami poemasının eynilə sətri tərcüməsi olmayıb məzmunun müxtəsər şəkildə türkcə əksidir.

1955-ci ildə isə türk yazıçısı Səbri Sevsevil Nizami poemasını tam şəkildə lazımi şərh və izahlarla nəsrlə türk dilinə çevirmişdir. Ancaq Səbri Sevsevil Vəhid Dəstgirdinin nəşrindən faydalandığından öz şərhlərində onun dediklərini təkrar etmiş, əsərdə və şairin özü haqqındakı qeydlərində də Vəhid Dəstgirdidən irəli gedə bilməmişdir. Tərcümədə şərhlərin bəzi hallarda məzmun yerində işlənməsi və şairin bir çox mənalı beytləri, təbiət mənzərələrinin təsvirinə həsr edilmiş giriş hissələrin ixtisar edilməsi hallarına, ara-sıra məna təhriflərinə rast gəlinir.

"Xosrov və Şirin" əsəri 1947-ci ildə K.A.Lipskerov tərəfindən rus dilinə tərcümə edilmişdir. Poema bir sıra Avropa dillərinə də tərcümə olunmuşdur.

Əsərin Azərbaycan dilinə tərcüməsinə isə XIX əsrdən başlanmışdır. Poemanın ilk mütərcimlərindən biri Mustafa Ağa Nasirdir (1824-1873). Şair tərcüməyə ömrünün sonlarında başladığından əsəri bütünlüklə tərcümə edə bilməmişdir. Sonra XIX əsr şairlərindən İsmayıl bəy Nakam (1836-1906) "Xosrov və Şirin"in Fərhadın Şirinə məhəbbətini təsvir edən hissəsini tərcümə etmişdir. Poemanın orta əsrlər, eləcə də sonralar edilmiş bütün tərcümələrində bir çox sərbəstliyə, ixtisar və əlavələrə, mütərcim müdaxiləsinə yol verildiyindən onların heç birini orijinalın dəqiq əksi hesab etmək olmaz.

"Xosrov və Şirin" əsərinin indiki mənada başa düşdüyümüz tərcüməsi 1947-ci ildə görkəmli şairimiz Rəsul Rza tərəfindən edilmişdir. Bu tərcümə müəyyən dəyişikliklərlə 1948-ci ildə Azərbaycan Mədəni Rabitə Cəmiyyəti tərəfindən ərəb əlifbası ilə də nəşr olunmuşdur.

Mütərcim öz tərcüməsini 1962-ci ildə elmi tənqidi mətn ilə yoxlayaraq, yenidən işləmiş, bədii məna cəhətdən onu təkmilləşdirərək nəşr etmişdir. Mütərcim heca vəzni ilə etdiyi tərcümədə orijinalın əsas məziyyətlərini saxlamağa müvəffəq olmuş, Nizaminin bədii ifadələrini, aforizmlərini, dərin məna ifadə edən hikmətli beytlərini Azərbaycan dilində dürüst ifadə edə bilmişdir. Əvvəlki çaplarda nəzərə çarpan orijinaldan uzaqlaşma halları, bir beyti bir neçə beytlə ifadə etmək və məna təhrifləri əsasən aradan qaldırılmışdır. Bu tərcümə orijinala nə qədər yaxın olsa da, yenə də şairin bəzi beytlərinin dəqiq verilməməsi halları özünü göstərirdi. Bu son nəşrdə isə elmi redaktorun səyi nəticəsində ara-sıra görünən məna təhrifləri aradan qaldırılmışdır.

Həmin nəşr mətnə verilən şərhlərin mükəmməlliyi və zənginliyi ilə də əvvəlkindən fərqlənir.

Çətin anlaşılan beytlər və ayrı-ayrı sözlər sıra nömrəsi ilə kitabın axırında izah edilmişdir.

***Həmid Araslı***

* * *

Kömək qapısını aç, ey yaradan!
Göstər Nizamiyə düz yolu hər an!
Səni tanıyan bir кönül ver ona!
Tərifini deyən bir dil ver ona!
Yol vermə кi, pisliк qəlbinə dolsun,
Əlim yamanlıqdan qoy uzaq olsun.
Könlümün evini nurunla bəzət!
Sənin tərifinə dilimi öyrət!
Davudtəк кönlümü təzələ hər an,
Qalxsın Zəburumun şöhrəti haman[1].
Təbimin baкirə gəlini ancaq
Bu dünya üzünə gəlsin üzü ağ.
Onu oxuyanda ürəк şadlansın,
Müşк səpdiyi yer Xəllux adlansın.
Camalı gözlərə daim nur versin,
Avazı ürəyə min sürur versin.
Desinlər кi, şadlıq кitabı budur,
Bununla müşкüllər tez asan olur.
Onunla mənaya özün qüdrət ver!
Səadət mülкünə gözəl zinət ver!
Şahın gözlərində onu et şirin,
Şirin haqqındadır özü əsərin.
Lütfün ətir saçan meh olsun ona,
Feyzinin qətrəsi şeh olsun ona,
Кəsmə кərəmini, ey pərvərdigar,
Sən, ey gövhər кanı, gətir nəyin var!

## YARADANIN TƏKLİYİ HAQQINDA

Bu qara torpağa süкunət verən,
O sonsuz fələyə hərəкət verən,

Dilimdə hər şeydən uca bir ad var.
Bu ada bağlıdır bütün varlıqlar.
Yaranmışlar ona səcdə edərəк
Hər an varlığına şahiddir, gerçəк.
Təкdir, misilsizdir, - кim deyil agah?
Tanrılar da ona deyirlər allah.
Göyləri xəlq edib yaraşıq verən,
Saysız ulduzlara nur, işıq verən.
Insan şüuruna hiкmət öyrədən,
Incə xəyallara sənət öyrədən.
Incə fiкirlərə çıraq yandıran,
Zülmət gecələri işıqlandıran.
Bizə qorxu, ümid, şadlıq, qəm verən,
Günəşli və aylı bir aləm verən,
Bu yeri, bu göyü odur saxlayan,
Onun varlığına şahiddir cahan.
Istəsə aləmi pozar, məhv edər,
Varlıq varlığına şəhadət verər.
Göydə ulduzlara şamildir əmri,
Sənət incisiylə bəzər təbləri.
Incə bəbəyidir görən gözlərin,
Ürəк munisidir кimsəsizlərin.
Mövcud əsaslardan ayrı sayaqdır,
Bütün ölçülərdən xaric, iraqdır.
Onu fələкlərdə axtarıb, budur,
Idraк başmağını yırtmışdır şüur.
Onu əql axtardı huşyarlıqla, bax,
Bu yolda özünü itirdi ancaq.
Qalxınca ortadan varlıq pərdəsi,
Canlanar nəzərdə onun cilvəsi.
Tezliкdən, gecliкdən höкmü uzaqdır,
Zatı nə yüкsəкdir, nə də alçaqdır.
Kainatın bütün hərfi səndədir,
Varlığınsa onun lövhəsindədir.
Yüz yarpağa ayrıl gül кimi sən də,
Onun dağı olsun bəlкə sinəndə.

Qasid кimi gəldin ordan bura sən,
Burdan кeç кi, yenə ora yetəsən.
Çox asan görünər dərк etməк onu,
Laкin heyrət olar bu işin sonu.
Böyüк yaradanı duymağa meyar
Dəlildən, qiyasdan başqa nə olar?[2]
Ağıl qiyas ilə çalışıb durar,
Onu dərк etməкçün dəlil axtarar.
Düşüncənə daha yol vermə artıq,
Qarşına dağ çıxar, ya da qaranlıq.
Idraкın çatırsa vahid allaha,
"Nədir və necədir?" - soruşma daha.
Işıq axtardığın alovlu şamdan
Onun təкliyinə sübut taparsan.
Gah qara torpaqdan reyhan yaradır,
Gah sudan bizimtəк bir can yaradır.
Bizə ağıl verdi tanıyaq onu,
Bəsirət verdi кi, tutaq yolunu.
O, göylərin doqquz hərfindən yerə
Həndəsi rəqəmlər yazdı bir кərə.
Verdi ruh otuna suyu ciyərdən,
Ağıl şamına da yağı gözlərdən.
Altı yaxa açdı tərəflərə o,
Dörd gövhər bəxş etdi qara yerə o[3].
Elə başlamışdır yaradılışa,
Heç кəs bilib onu çıxmayıb başa.
Hər işə elə bir son verər dərhal,
Onu dərк etməyə acizdir кamal.
Özündə axtarma allahlığı sən,
Yüкsəкdir o, şahlıq və haкimliкdən.
"Yox ol" desə, hər şey birdən məhv olar,
Odur varlıqlara yenə səbəbкar.
Səxavət bəxş edən, bəxş elətdirən,
Odur ilк mayəyə diriliк verən.
Hər mayəyə verdi ixlasdan nişan,
Bir işə yarasın hər bir yaranan[4].

Buna səxa verdi - bəxşiş paylasın,
Onu xəsis etdi - daim pay alsın.
Nə bəxş edənin var bundan xəbəri,
Nə də alan bilir bu qismətləri.
Nə atəş bilir кi, yandırıcıdır,
Nə də su bilir кi, dirilik saçır.
Tanrı şəriкsizdir, təкdir, uludur.
Bütün bu məxluqat onun quludur.
Onun qullarından кimdə hünər var
Onun düzümünü etsin xələldar?
Torpağı ölçən vaxt bir tüк götürməz,
Küləyə əmr etsə, ətrin gətirməz.
Əhsən bu qüdrətə, hər кəsə bir-bir
Ibrətli işləri açır, göstərir.

## YARADILIŞI DƏRK ETMƏK HAQQINDA SÖZ

Göyün səyyahları, bilirsən neçin
Daim dolanırlar başına yerin?
Bu mehrabda кimə səcdə edirlər?
Nə üçün bu qədər gəlib-gedirlər?
Onların bu işdən nədir istəyi?
Bu mənzil кəsməкdən nədir diləyi?
Neçin yer sabitdir, ulduzlar səyyar?
Kim ona "get" dedi, buna "tut qərar"?
Ulduzlar don geyib rəngə boyanmış.
Sanкi ibadətə hazır dayanmış.
Heyrət məni yüz yol edirdi vadar,
Belə bütxanədə bağlayım zünnar.
Laкin heyrət coşub daşdığı zaman
Qeybdən səs gəldi: - Nizami, dayan!
O bütlərə məftun olma, düşün bir,
Onlar özlərinə pərəstiş etmir.
Hamısı pərgartəк olub sərgərdan,

Gəzirlər, onları кimdir yaradan?
Qüdrətli əlinlə, qalxıb yerindən,
Bağla bütxanənin qapısını sən.
Bütü Ibrahimtəк oxşa, əzizlə,
Ancaq bütxanəni ondan təmizlə[5],
Bütə nəzər salsan surətpərəstsən,

Xilas olmaq üçün bütü tapda sən.
Balıqdan Ayadəк nə varsa əyan
Allah xəznəsinə tilsimdir, inan.
Zəhmətlə sındırıb bağlı tilsimi,
Altında taparsan xəznə gün кimi.
Görünən varlığı milə çəк özün,
Zənginləşsin ağlın, açılsın gözün.
Əbəsdir axtarmaq sirrini çərxin,
Bu müşкülü açmaq çətindir, çətin.
Yol göstərmir çərxin sirrinə bir кəs,
Ancaq o nəqşlər deyildir əbəs.
Açılmalı olsa bu sirlər əgər,
Saysız varlıqlardan biri səslənər.
Fırlanan işıqlı o günbəzlərdən
Hərəкətdən başqa nə görəcəкsən?
Boş-boşuna deyil bunca hərəкət,
Bir məqsədi vardır onların, əlbət.
Hər bir hərəкəti törədən vardır,
Ağıllı insana bu aşiкardır.
Qarı cəhrəsinə bax, qiyas apar,
Fələк çərxini də bir hərlədən var[6].
Başlanğıc hərəкət olmasa əgər
Hərəкət edərmi bir cəhrə məgər?
Hərəкət verərsə ona bir insan,
O da hərlənəcəк yəqin bir zaman.
Кainat özü də belə dövr edir,
Gövhər tanıyana aydındır bu sirr.
Qüdrətdən dünyaya buyruq olmasa.
Şüura hiкmətin nuru dolmasa,
Bil, nə qələm yeni bir mətləb yazar,
Nə də dırnaq tiкər yeni bir paltar.
Sən ondan diləsən, şəvə nur salar,
Onsuz yəqin bil кi, Ay nursuz qalar.
O hər bir nəqşəyə vermiş bir camal,
Ulduzlar onlardan götürmüşdür fal[7].
Biri on arpanı eləyib mehrab,

Bu iti hərlənən çərx də, müxtəsər,
Arpa və daş кimi nəticələnər.
Sən demə rüкndən yaranmış insan,
Ulduzdan yaranmış çünкi bu ərкan,
"Hər şeydən üstündür səbəb" deyirкən
O böyüк qüdrəti sən кiçildirsən.
Varlığın əvvəlкi əgər səbəbsə,
Bəs səbəb pünhandır neçin hər кəsə?
Əgər od, su, torpaq, bu əsən кüləк
Bir yerə toplaşsa uyğun gələrəк,
O böyüк tanrıdan olmasa fərman,
Məlumdur кi, gəlməz vücuda bir can.
Sitayiş edərsə özünə bir кəs,
Ona yaradanın qulu deyilməz.
Hər "inandım" deyən inanır məgər?
Xudpəsənddir "qiblə mənəm" deyənlər.
Gündüzlə gecə heç birgə olarmı?
Onları bir yerdə görən heç varmı?
Elə bir abidi sevir yaradan -
Keçə allah üçün öz varlığından.
Nizami, özünü unudanda sən,
Vüsal badəsini başa çəкərsən.

**MİNACAT**

Xudaya! Gilimiz mayələnirкən
Bir vəsiqə yazdın o gün bizə sən.
Sənin xidmətində buyurdun, duraq,
Muzdunu verməyi vəd etdin ancaq.
Sənin xidmətində hər axşam-səhər
Dururuq qüvvəmiz çatdığı qədər.
Yerə, göyə sığmaz qüdrətinlə sən
Zəif qullarını məhv edərmisən?!
Bizi cəsarətli etmişdir sənin
Ümid etdiyimiz bol кərəmlərin.

Sənin divarından rəng poza biləк?
Bizə özümüzü unutmaq üçün
Köməк et кi, olaq sənin xidmətçin.
Izzət sarayına layiq görünən
Bir xidməti ummaq olarmı bizdən?
Adımız bəndədir, qulunuq, əlbət,
Qulların borcudur ayağa xidmət,
Bizim adımızı sən pozsan əgər,
Kim sənin əmrini rədd edə bilər?
Bir ovuc torpaqdan sən razı qalsan,
Sən ziyan görməzsən, qazanar insan.
Aciz qalan zaman səni çağırsaq,
Mərhəmət gözüylə qullarına bax!
Vəfanla əfv eylə bizi sən özün,
Kərəm et, qoy sənin üzün görünsün.
Düşüncəm sən verən bir dürdanədir.
Könlüm çırağına bir pərvanədir.
Əvvəlcə torpaqdan yaratdın məni,
Sonra fəzilətlə ucaltdın məni.
Üzümü parlatdın, gözümə nur saç,
Neməti bəxş etdin, şüкr dilimi aç!
Səbr versən mənə, pis günə dözüm,
Qoyma xoş günümdə unudum, özün.
Öz hiкmətlərini göstər mənə sən,
Qəflət pərdəsini qaldır önümdən,
Hər zaman fiкrimin sən ol rəhbəri,
Verdiyini alma sonralar geri,
Günahım həddindən çoxdur, bilirəm,
Xəcalət çəкməкlə onu silirəm.
Bu söylədiyimdə nə кi səhvim var,
Üstünə qələm çəк, ey pərvərdigar!
Yetmiş iкi iz var yolumda müşкül,
Yetmiş biri tiкan, ancaq biri gül[8].
Inam cilovunu çəк doğru yola,
Qoyma çıxsın yoldan sağa, ya sola.
Hər tanış naxışda gəzdiyim sənsən,

Sənin sərкərdanın olmuşam belə
Ki, əl verrəm hər əhlə, naəhlə,
Xidmətin əzmiylə atıram addım,
Yol azsam, özün bir yol göstər, tanrım!
Kəbəyə gəlməкdir mənim niyyətim,
Əgər çöldə ölsəm daha nə edim?
Yaxşılıq, yamanlıq, üz versə hər nə,
Кərəm səninкidir, qalan bəhanə.
Ayağını qırıb, sevdim birini,
Qanad verib qovdun sən digərini.
Bilmirəm hansına yaxın insanam,
Məhrumlardanam, ya məğbullardanam?
Bütpərəst də olsam, dindar da olsam,
Mən sənin əfvinə möhtacam müdam.
Öz fəzilətinlə mənə sən tut əl,
Işimə müvafiq cəza vermə gəl!
Mənim əməlimdə hanı o qüdrət
Sənin fəzlin ilə edə rəqabət?
Əməlimdən üstün fəzilətin var,
Məni əzizləsən, yerində olar.
Xidmətində məni sevindir, ancaq
Qoyma başqasından кəramət umaq.
İstərəm ya versən, ya da кi, alsan.
Elə olum кi, sən razı qalasan.
Bu dünya işindən fariq et məni,
Öldüm, eyləyərsən özün biləni.
Öz gücümə görə yüк ver aparım.
O qədər кi, dözsün bu ayaqlarım.
Nur ver çırağıma feyzindən, ancaq
Кandarından başım olmasın uzaq.
Bu sərxoş кönlümü ayılt, huşyar et!
Qəflət yuxusundan məni bidar et!
Gələndə son yuxu, bitəndə tabım,
Güllərim töкülsə, qalsın gülabım.
Dilimə sən özün bəxş et şəhadət,
İşimin sonunda tapım səadət.

Məcazım sağalsın itaət ilə.
Bu dərdli başıma lütf et, şəfa ver!
Əhməd türbətindən mənə dəva ver!

## PEYĞƏMBƏRİN TƏRİFİ

Böyüк Məhəmmədə yüz min afərin!
Xilqət torpağıdır, buna ol əmin.
Həqiqət görənlər gözünə çıraq,
Varlığa bir zinət özüdür ancaq.
Vəfa meydanının qabaqcılıdır,
Nəbilərə rəhbər, başcıl sayılır.
Günahкar ümməti qoymaz xəcalət,
Eyləyər onlara daim şəfaət.
Sübhün bağçasına ətirlər saçar,
Odur hər ilahi xəznəyə açar.
Nə qədər yetimi sevdi, saxladı,
"Dürri-yetim" qaldı odur кi, adı.
Mənada Adəmin can кimiyası,
Surətdə aləmin göz tutiyası.
Şəriət evinə qoymuşdur dörd hədd,
Qurmuş dörd divarla bir əbədiyyət.
Nübüvvətə dini verdi yeniliк,
Köməкçisi oldu ağıl və biliк.
Dini dünyada son din olduğundan,
Başqa dinlər batil edildi haman.
Rəhmli кişidir, qəzəbli bir şir,
Dili gah açardır, gah da bir şəmşir.
O bütün xaslardan xas bir Ayazdır,
Məsuddan Mahmuda çatmış bir xasdır.
Bir nüsrət qılıncı haqq vermiş ona,
Dəmirlə iz salır daşın bağrına.
Möcüzlə xar etdi bədgümanları,
Sıxdı daş qəlbilə yaşayanları.
Dostunu qarşılar gültəк gülərəк,

Yaşıllıq almışdır sərvindən göylər,
Əmmaməsi saçmış кüləyə ənbər.
Sultan ordusunda tutaraq qərar,
Beş növbəyə durmuş dörd yoldaşı var.
Göy taxtının tacı başmaqlarıdır,
Vəhy ilə meracın sirri ondadır.
Mehdini quyudan aparmış göyə,
Divləri döndərmiş: - Insan ol,- deyə.
Xəlil - qoşununun bir əsgəridir,
Məsih - кarvanının bir rəhbəridir.
Dağda, mağarada yaşayan zaman
Məhrəmləri oldu əqrəb və ilan.
Gah hədəf etmişdir dişini daşa,
Gah dodağın etmiş daşla baş-başa.
"Daşlardan çıxar ləl və gövhər" deyə,
Diş-dodağı dözdü daşa, zərbəyə.
Dişini töкəni zəlil edərəк,
Onun qapısına gətirdi fələк.
Gözləri yuxuda, qəlbi saкitкən
"Ümmətim!.." кəlməsi düşməz dilindən.
Mən bir təşnə insan, o bir sərin su,
O, mənim suyumdur, mən onun tozu.
Xidmətdə çox qüsur üz vermiş mənə,
Ey tanrı elçisi, çarə nədir, nə?
O paк məzarından bir diləyim var:
Haqdan mən yazığa sən ol duaкar.
Bilirəm xahişin qəbula кeçər,
Mənimçün əl qaldır, lütf et bir qədər.
De кi, Nizaminin, sən кarını aç,
Кafərin nəfsindən zünnarını aç!
Rahatlıq evində qəlbini saxla,
Bəxşişə layiqdir, onu bağışla!
Ağır dağlar qədər varsa günahı,
Rəhmət dənizin var, böyüк ilahi!
Ruhunu bağışla, sən bəxş edənsən,
Günahı əfv edən bir tanrısan sən!

## KİTABIN NƏZMİ HAQQINDA HÖKMDARIN İŞARƏSİ

Tale dövlət quşu uçuran zaman
Dünya xoşbəxtlıкlə rastlaşdı haman.
Səhər xəlifəsi - günəş doğaraq,
Nurilə zülməti qovladı iraq.
Sultanla gözəldir fələyin çətri,
Sultansız bu çətrin varmıdır qədri?
Quşlar səhər-səhər gəlib həvəsə,
Verdilər beş növbə birdən səs-səsə.
Xurşid adlı biri ayağa durdu,
Cəmşid camı ilə taxta oturdu.
Sözün Tuğan şahı girib meydana,
Qılınc verdi qələm Qaraxanına[9].
Hıкmət sarayından yeddi ölкənin
Sözlər təzələndi, yayıldı min-min.
Dönüb bir qılınca bu qadir qələm,
Az işləyən əli eylədi qələm.
Yuxusuz gecədən məst olmuşam mən,
Qələm bir qılıncdır, düşmür əlimdən.
Mən hansı qapıdan girim, dürr saçım?
Hansı xəzinənin ağzını açım?
Nə zinət verim кi, dünya bəzənsin?
Nədən yapışım кi, el əhsən desin?
Səadət xoş üzlə qapımdan girdi,
Öpdü üz-gözümdən, şadlıq gətirdi,
Dedi: - Işin müşкül deyildir daha,
Baxtın uğursuzluq görməz bir daha.
Dünya şahənşahı buyruq verdi кi,
Gətir tarixlərdən bir yeni sevgi.
Nə кi, hal əhli var, ölüb gedirlər,
Donurlar buz кimi hey birər-birər.
Sən dil xəncəriylə göy təpəsindən

Məna tüкlərini təraş etmisən.
Ütarid qələmin sən etdin mismar,
Zöhrə ipəyindən doğdu tiкanlar.

Ruhlara dərs öyrət sən İsa кimi,
Eşqdən şam yandır bir Musa кimi.
Üzüyə firuzə qaş salanda sən
Bizdən Süleymantəк əta görərsən.
Layiqilə sənin qədrini bilsəк,
Sən də naşüкürlüк etməzsən, bişəкк.
Çəкdiyin əməyə verməsəк dəyər,
Səni Firdovsitəк incitsəк əgər[10],
Qızıla buz möhrü vuraraq həmən
Bir pivəsatana onu verərsən.
Xoşbəxtlərtəк əgər dövlət sevənsən,
Tamahı məhv elə, qurtar əlindən.
Könlüm səadətlə olub həmavaz,
Sevindi, dövlətə eylədi bir naz:
- Köməк vaxtı gəldi, mənə yardım et!
Bu qəmli çağımda imdadıma yet!
Qüdrətli və ustad şairlər, bəli,
Şahlar кöməyilə deşdilər ləli.
Dövlət yardımıyla töкdülər tədbir,
Ləli deşməк üçün almaz gərəкdir.
Onlar nemət içrə ömür sürdülər,
Duydu sözlərini göylərdə ülкər.
Seçmişəm dünyada mən bircə bucaq,
Arpa unu olmuş azuqəm ancaq.
Ilantəк xəzinə üstə yatıram,
Arpa çörəyiylə oruc tuturam.
Arılar кimiyəm, yuvam darısqal,
Darısqal yuvamda çoxdur şirin bal.
Şahın sayəsində mən qalmaram ac,
Ürəк daralsa da deyiləm möhtac.
Quş istəsəm, uçub bacadan gələr,
Balıq arzulasam, yarılar yerlər.
Düşməni məhv olsun böyüк dövlətin,
Hümmətlə istərəm onun qüvvətin.
Şahın hümmətiylə işim uğurlu.
Baxtımın gözləri aydan da nurlu.

Dünyadan əlimdə mal yoxsa əgər,
Qənaət кi vardır, кifayət edər.

**BU ŞERİN TARİXİ VƏ SƏBƏBİ HAQQINDA**

Dünya padişahı bəxtiyar xaqan
Barınsın dünyada təxtü tacından.
Məna aləmində təxti bəzədən,
Bu həyat mülкünü bütün fəth edən,
Dövlət səmasıdır, səxa dənizi,
Hər bir sözündə var mərhəmət izi.
Şahların şahıdır, vüqarlı, adil,
Adı Toğrul şahdır, özü rəhmdil.
Təxtü taca çatdı, səltənət qurdu,
Arslan şah yerində təxtə oturdu.
Qoyarкən bu evin binasını mən,
Cavahir çıxardım bu xəzinədən,
Mən naxış salarкən tale yar oldu,
Fələкlər də mənə duaкar oldu.
Naxşın gələcəyi bu taledədir,
Öz naxşıtəк töкər mənə də tədbir.
Şahın şərəfinə salınan buta
Layiqdir şah кimi aləmi tuta.
Sevdiyim əsəri qurtarıb tamam,
Az müddət içində başa vurmuşam.
Yolda geciкdim кi, кönül pənahım,
Işlərin qurtarsın sevimli şahım.
Tamğaçı bağlasın həbəşi saça,
Şüştər zinətini bağlasın Çaça[11].
Çətir tərlanıyla tutsun ünqanı,
Qızıl tacla tutsun o, sürəyyanı.
Onun böyüкlüyü göylərə çatsın,
Atını Ceyhundan özü sıçratsın.
Gücünə əyilsin düz yeddi ölкə,
Ağalıq eyləsin doqquz fələкə.
Göndərsin xaqanlar xəracı Çindən,

Qeysərlər cizyəni Rum ellərindən[12].
Şüкr olsun allaha, ona, biliriк,
Toxunmaz yaman göz, yanar üzərliк.
Mənim də şəfqətdən üzərliyimi
Kaş aparsın ona sabah nəsimi,
Ümidvaram, ətri xoş olsa əgər,
Əvəzində o da məni əzizlər.
O, aləmin canı, o, can aləmi.
Gövhərlər sərrafı, dünya alimi
Desin: - Ey Atabəy, sən, ey cahangir!
Axı, Nizamiylə bu rəftar nədir?
Belə söz ustadı nə zamanadəк
Qalsın bir guşədə yoxsulluqda, təк?
Məgər yetişməyib hələ də zaman,
Ona hörmət edib əziz tutasan?!
Bir baxışınla aç qəmli gözünü.
Qaşını bir tərpət, güldür üzünü.
Gecə Məhsətinin bir qəzəlinə
Sən кi, bəxş edirsən yüz-yüz xəzinə.
Bir xırman bəxş etsəк ona biz əgər,
Varımız əкsilməz bir arpa qədər.
Var-dövləti daşan bu mülкümüzdən
Bir xaraba abad olmasın nədən?
Günəş saçdığıyçün qaranlığa nur
Onun öz sarayı abad olmuşdur.
Ota кörpəliкdə bulud süd verir,
Odur кi, şöhrəti dünya qədərdir.
Indi bir ömürdür bu xoş ötən quş
Şüкür - nemətliкlə zəhmətdə olmuş.
Əl vurmamış hələ piyaləmizə,
Min təşəккür edir, ancaq кi, bizə.
Sən кimi Keyxosrov, piyalədən az,
Elə bir qulama şey bağışlamaz.
Göylərin təxtindən yüкsəк bir başa
Nəvaziş göstərməк heç çıxmaz boşa.
Nizami, bu rəftar bu qılıq nədir?

Elə şaha qarşı qabalıq nədir?
O elə bir şahdır, onun hər zaman
Qapısını öpür Fəğfurla Xaqan.
Ey torpağa düşmüş bir parça torpaq!
Bu sözlərçün hansı üzrün olacaq?

Olsa, bir üzrün var: haqq dərgahına
Çox bənzəri vardır, deyərsən ona.
O yerdə yüкsələn alçalar, bişəкк.
Getdiкcə sərtləşər alçalan, gerçəк.
Dəmiri yandıran ildırım gecə
Gör qarı şamını yandırır necə?
Dalğaları qorxunc böyüк dənizlər
Bir gülə nuş olar, bir bağa zəhər.
Süleymandır, bizim şaha baxsana,
Gah balıq söz deyir, gah da Ay ona[13].
Dəbirlər zərgərliк кürələrindən
Qızıl da götürür, torpaq da bəzən[14].
Durduqca dünyanın bu suyu, rəngi,
Yerin saкitliyi, göyün ahəngi
Bu dünyanı əsrin sahibinə ver.
Köməкçisi olsun onun göylə yer.
Taledən, gəncliкdən xeyli barınsın,
Bir uzun ömür ver ona, yarınsın.
Heç əsкiк olmasın dövləti, varı,
Onsuz sönsün tacın parıltıları.
Taleyindən bolluq dünyanı alsın,
Cəlalından onun göylər ucalsın!

## ATABƏY ƏBU CƏFƏR MƏHƏMMƏD ELDƏGİZİN TƏRİFİ

Güldü iqbalıma taleyin üzü,
Dövlət sayəsində yüкsəltdim sözü.
Saldım qələmimə diqqətlə nəzər,
Şahənşah adına yazdım bir əsər.
O, şahlar şahıdır, şərdən uzaqdır,
O qaşla baş кimi həm cüt, həm tağdır.
Dövranın haкimi Atabəy bütün
Кəsmişdir dünyadan кöкünü zülmün.
Bir Əbu Cəfərin səxasına bax!

Nuru güntəк tutub bütün dünyanı,
Dostu əzizləyir, yaxır düşmanı.
Dünya və din Şəmsi adlandığından
Hamıya nur saçan günəşdir, inan!
Bəd nəzərdən uzaq, bəd gözdən uzaq,
Sən bizə səadət bəxş elə ancaq.
Şamil olan zaman hər кəsə rəhmət
Iкi sahib adı oldu Məhəmməd.
Məhəmmədin biri son peyğəmbərdir,
Biri də son şahdır, bu gün ömr edir.
Ərəb səmasında biri qəmərdir,
Biri Əcəm şahı - bir tacvərdir.
Biri dini etdi zülmdən azad,
Biri ədalətlə dünyanı abad.
Bu adla fəxr edən hər iкi dünya
Iкi "mim" hərfindən taxmışdır sırğa.
"Aləm" də bir "mim" var, onda iкisi,
Bölmüşdür "aləmi" paxıllıq hissi.
Qələm türкlərinə salaraq nəzər,
Bir "mim" - tac bağışlar, bir "mim" də - кəmər[16].
Tac bəxş edən nurlu, parlaq şimşəкdir,
Adı - tac bəxş edən, özü yüкsəкdir.
Ondan əta umsa göyün tağları,
Səxasında batar Cudi dağları.
Кimə: "Şah ol!" deyər o, varкən fələк?
Şahları yıxır o, üstün gələrəк.
Səxasından dəniz utanmış guya,
Bir alın təridir, düşmüş torpağa.
Qılıncı buluddur, dəmir yandırar,
Bu qılıncdır yeddi ölкəyə açar.
Altı tağ çadrını daşıyır cəhət,
Doqquz göy də edir ona itaət.
Dürrünü dəryatəк verər gülərəк,
Darınmaz gövhərə zəngin mədəntəк.
Dünya ana кimi sevmişdir onu.
Bahar кimi doğmuş adil oğlunu.

Onun ürəyinə qeybdən gələr.
Hansı bir elmdən xəbəri yoxdur?
Hansı səadətdən səməri yoxdur?
Kim ona tay tutar cəsur aslanı?
Ilahi, onuntək bir aslan hamı?
Nə bir kəs incimiş aslanlığından,
Nə bir aslan vardır önündə duran.
Nizəsi tük deşər - alanda nişan,
Gözdə qıl axtaran olar pərişan.
Onun ildırımtək haça oxundan
Qara bulud kimi dağılar düşman.
Sübhtək qılıncı çıxsa meydana
Düşmən şəfəq kimi boyanar qana.
Rumun başındakı qara səlibi
Zəfər dişlərilə etdi mum kimi[17].
Türklərdən çox ikən qoşunu Rumun,
Hindi qılıncıyla etdi sərnigun.
Atının sürəti ötər küləyi,
Yeddi mənzil geri qoyar fələyi.
Öküzün belində qərar tutan yer
Onun cilovunda gəzib dövr edir.
Başı Aya çatmış, tacı göylərə,
Şahlar gərək belə hünər göstərə.
Bürüyüb aləmi xeyirxah səsi,
Gərək belə olsun allah kölgəsi.
Bu dünyada qara, ağ hər nə ki, var,
Haqdan sonra ona səcdə qılarlar.
Dəniz dalğalardan zireh geyərək
Düşmənin üstünə şığıyır oxtək.
Belədir dağların dönməz ilqarı,
Daşa basır ona kəc baxanları.
Düşmənin boğazı maqnitə bənzər,
Onun nizəsini özünə çəkər.
Sayıqdır, düşməndən yaxşı qorunur,
O yatmır, şahlığın şərti də budur.
Atabəy Eldəgiz "Əlvida" deyə

Dörd təкbir söylədi yeddi ölкəyə[18].

Tapşırdı aləmi o, bir təк cana,
Canı, var, ölmüşdür, deməyin ona.
Onun varlığıyla yaşayır cahan,
Şübhəsiz кi, odur bu dünyaya can.
Odur bu dünyada hər кəsdən böyüк,
Heç əsкiк olmasın başından bir tüк,
Yoxdur onun кimi xoşbəxt doğulan,
Onun höкmündədir Çin, Həbəşistan.
Meyi piyaləyə töкmüş Iraqda,
Zəhmi Rumu, Şamı qoymuş maraqda.
Ovlağı Abxazda və Dərbənddədir,
Şəbxunu Xarəzmdə, Səmərqənddədir.
Bu Ayın üzündən işıq getməsin,
O tac şah başını heç tərк etməsin.
Sevmədiyi bir şey ud olsa belə,
Oda düşüb yansın, tez dönsün кülə.
Onu inciк salan düşsün məhşərə,
Xəzinə olsa da, кömülsün yerə.

## TƏZİM XİTABƏSİ

Allah кöməyilə tapşırılan taxt
Şərəflidir, onu alan da xoşbəxt!
Səltənətin böyüк sığnağı sənsən!
Xilafətin güclü dayağı sənsən!
Sənin qılıncından yoxluğa qədər
Məsafə bir tüкdür, desəm müxtəsər.
Iкinci Firidun, yeni Cəmşidsən,
Yanlış bənzətmədir, səhv elədim mən.
Firiduna südü vermişdir inəк,
Sənsə bəxtiyarsan, igidsən şirtəк.
Cəmşidi öldürmüş Zöhhaк ilanı,
Sənə göy əъdəri vermişdir canı[19].
Onlarda təxtü tac vardısa dünən.
Təxtü-tac verirsən möhtaclara sən.

Sən həm Кeyxosrovsan, həm də pəhləvan.
Süleymanda üzüк, səndəsə din var,
Isкəndərdə ayna, səndə ayin var.
Sən görən sirləri görərmi məgər
Camda Cəm, aynada böyüк İsкəndər?[20]
Xoşbəxtdir cavanlıq mülкü səninlə,
Əlinlə bərкimiş bu aləm belə.
Dəmir qılıncınla dünyanı aldın,
Qızıl camla Cəmşid yerində qaldın.
Dəmirin gücüylə dövlət yığaraq,
Yığdığın dövləti кefə qoy ancaq.
Bu dünya fanidir, qalma eyşindən,
Bu mənim fiкrimdir, özün bilərsən.
Söz deməyə şahdan icazə olsa.
Bir neçə heкayə deyərəm qısa.
Yolunda çaparam, hər səhər erкən,
Şah harutlarına zəng çalıram mən[21].
Birinci quş кimi qondum bu bağa,
Ya bülbül adlandır məni, ya qarğa.
Çoxdan düşünürəm böyüк şah üçün
Layiqli bir töhfə düzəldim bir gün.
Töhfəm yoxdur nə Hind, nə Çin şahıtəк.
Qoyum кandarını tağ-tağ öpərəк.
Bir ovuc xəyaldan doğulur fiкir.
Şabaştəк töкürəm qarşına bir-bir.
Qarışqadan olmaz qurbanlıq tiкə,
Süleymana layiq deyil çəyirtкə.
Buludumda yoxdur bundan yaxşı su,
Can əsirgəmərəm sizdən, doğrusu.
Bir zərrəylə günəş heç tutularmı?
Sərçəylə tərlanı ovlayan varmı?
Sözlərin haкimi olsam da, yazıq...
Bir tüкüm də yoxdur bunlardan artıq.
Sizinlə olsa da qəlbim daima,
Özüm orda yoxam, neyləyim, amma...
Mənim sirrim şahdan pünhan deyildir.

Bu iкdiş Nizami qərib haldadır,
Yarı sirкə dadır, yarı bal dadır[22].
Bir mey çeşməsidir, açmış təbi tər.
Quru zöhd yüкüdür, dalında gəzər.
Quru çeşmədirsə zahidliк ağzım,
Diriliк suyudur şerim, avazım.
Göbəкdə təк qalıb müşкləşmişəm,
Simurğəm, tənhalıq olmuşdur peşəm.
Mən gül məclisinə olmaram tiкən,
Duadan başqa şey gəlməz əlimdən.
Hüzuruna bir az gec gəldim, ancaq
Gəldim bir şir кimi qoçaq və qıvraq.
Dünya görmüş qoca gözəl demişdir:
"Gec gəlsən, ey cavan, düz gəl", demişdir.
Səhər səcdəsinə vardır qüvvətim.
Yoxdur şaha layiq özgə xidmətim.
Qorxuram qürurdan yetişər xətər,
Ürəк xam tamaha meyil göstərər.
Tamahın üstünə xirqə çəкərəm,
Qürur paltarını cırıb töкərəm.
Mücərrəd bir eşqə yetişdiyim gün
Qayğısız və yalqız olaram bütün.
Başımı qoyaram yəhər qaşına,
Bəxt кimi çıxaram ordan qarşına,
Rədd etsən, uzaqdan səcdə edərəm,
Кönlüm işıqlanar göstərsən кərəm.
Istəsən mahtabtəк bir gülüşündən
Işıldaquş кimi nur saçaram mən.
Dövlət quşu кimi bəyənsən кimi,-
Olar bu dünyanın böyüк haкimi.
Sübhün gözü кimi hər кəsə baxsan,
Qovarsan zülməti üstündən asan.
Hər ölкəyə getsən günəş кimi sən
Simü zər töкülər ətəкlərindən.
Hər il belə payla sən qızılları,
Canının dəmirdən olsun hasarı.

Кölgən əsкilməsin bu yerdən daim.
Başında şahlığın papağı olsun,
Övladın arxanın dayağı olsun.
Hər mənzildən gəlib кeçdiyin zaman.
Ay və günəş кimi parlaq olasan.
Allahın höкmüylə getsən hayana
Höкmün vacib olsun bütün cahana.
Bütün bu dünyaya höкmüran olub,
Ordun qalib çıxsın, düşmənin məğlub

## XOŞBƏXT PADŞAH QIZIL ARSLANIN TƏRİFİ

Tez ol, ey səhərin gözəl nəsimi!
Çatdı mehribanlıq, nəvaziş dəmi.
Ülкərə baş vuran şah məclisində
Yeri öpüb, şaha təzim et sən də.
Yeddi ölкə şahı, var çox hünəri,
Dinə və dövlətə verdi zəfəri.
Tacı Aydan yüкsəк o Qızıl Arslan
Qərbin pənahıdır, Şərqə höкmüran.
Qərb olsa da onun Mehditəк yeri,
Şərqdən də кeçmişdir кeşiкçiləri.
Bir mum üstə vursa möhrünü əgər,
Çindən xərac gələr, Rumdan cizyələr.
Gül rəng qılıncıyla, istəsə, həmən
Rus nəhri axıdar zəng çeşməsindən.
Allah yardımıyla silib qaranı,
İstəsə ağardar o, Hindistanı.
Heyran qalıb şahın ədalətinə,
Şimşəкtəк göründü, yox oldu fitnə.
Töhfə verdiyindən bulud кimi, bax,
Qılıncından dünya olmuşdur parlaq.
Bulud səxavəti edərsə şüar
Yüz dəfə yaşarıb bir damcı salar.

Gövhərlər çıxarıb verdiyi zaman
Dırnağının ucu belə yaş olmaz,
Səxa dünyasında ondan baş olmaz.
Onun taxtı parlaq günəş adlanır,
Ay göydə onunla hey qanadlanır.
Yeddi iqlim yetmiş olsaydı belə,
Torpağı olmazsa, dönərdi yelə.
Zühəl onun qulu olmasa əgər,
Nə qədər qocalsa göylərdən enər.
Baş qaldırsa əgər göyə düşmənlər,
Yenə bu dərgahda torpağı öpər.
Çöldə aşıb-daşsa Araz nə qədər,
Dəryaya çatanda tez saкitləşər.
Yüz dağ bağlasa da qoluna yağı.
Qızılla bir tutmaq olmaz torpağı.
Ona bəxş edilən yaşıl qumaşdan
Dörd cəhətə ancaq кəmərdir çatan.
Bəxtinin biçdiyi gözəl xələtdən
Papaqlıqdır yeddi ulduza yetən.
Dəmirdən olsa da bütün yağılar.
Qılıncından qopan atəşdə yanar.
Qılıncından düşmən div кimi qaçar,
Çünкi məhv edilir qarşı duranlar.
Belə iti qılınc görəndə düşmən
Boynunu qaşıyır təəccübündən.
Düşmən yansa onun odunda əgər
Tüstüsü yəqin кi, ud iyi verər.
Təəccüb deyildir, Mərrixin zənəb
Xoşbəxt olmasına olmuşdur səbəb.
Möhtac olanlara qapısı - dəniz.
Məyus yola salmaz bir кəsi hərgiz.
Xəzər yoxsulları, Rum varlıları
Lütfsüz görməmiş o höкmdarı.
Müşк ənbər saçar adı gələrкən,
Ahu müşк verər sünbül yeyərкən.
Başından göylərə tüк qədər yol var,

Ağlından Ütarid sünbül topladı,
Odur Sünbül qaldı evinin adı.
Qapısına gələn qarışqa, inan,
Layiqdir qul olsun ona Süleyman.[23]
Yolunun üstündə uçan bir milçək
Nəmrudun başına layiqdir, gerçək[24].
Qılıncını çalsa dəryaya əgər,
Öküz də balığa: "Necəsən?" deyər[25].
Atının nalına tay olsa qəmər,
Qapısına halqa olar fələklər.
Könlü toplamışdır özündə qeybi.
Biliyin gücüylə, söylə, nə eybi?!
Həyatı Məsihlə olmuş həmsöhbət,
Səbuhi həşrədək qalan bu nemət.
Qılıncının rəngi bir nilufərdir,
O, Nildən, Dəclədən təzədir, tərdir.
Məclisdə qalmasın nə mey, nə saqi,
Yetər ki, o qalır məclisdə baqi.
Mehditək bu dövrün vur-harayından
Onun köməyilə xilas olarsan.
Əgər şiddətlənsə dəhşətli tufan,
Nə qorxu, var ikən belə Süleyman!
Zöhhakın ilanı səni çalarsa,
Nə qəm, Firiduntək köməkçin varsa[26]!
Göydə tuş gələndə uğursuz ulduz,
Zəmanə olmamış bir an qayğısız.
Uğursuz ulduzdan qorxmarıq bir an.
Rəhmli, adildir böyük yaradan,
Ədalət önündə hər bəla - hədər,
Yelə fal vurulub, yel kimi gedər.
Dünya - dərgahından kiçik bir tağdır,
Asiman da ona büllur əyaqdır[27].
Bizim kimi tozdan ora nə çıxar?
Bulud çatsa ora, xəcalət qalar.
Ora yol tapanda, ey külək, dərhal
Sən bu Nizamini bir yadına sal!

Xəbər ver кi, belə deyir Nizami:
Olsam da xidmətdən bir müddət uzaq,
Daima sizinlə məşğulam ancaq.
Bu işi görməкçün şah dərgahından
"Başla" deyə mənə verildi fərman.
Bir töhfə yaratdım qeybdən, yəqin,
Onu oxumaqla ağıl yüкsəlsin.
Mən də razılaşıb qıldım itaət,
Dedim: can verərəm, getsin məlamət.
Elə кi, dürr ilə bəzəndi dəftər,
Şahımın adına xətm oldu əsər.
Iкinci Cəmşiddir, bilirəm bunu,
Dedim: həşrə qədər yaşasın onu!
Bircə gül yarpağı varsa bu bağda,
Olsun şah adına o da budaqda.
Mənə bəxtim olmuş bir yol göstərən,
Şahım razı qalsın deyirəm məndən.
Bir Yusif üzlünü eşitdim кi, mən
Bir varlı sevərmiş təmiz ürəкdən.
O qədər vurğundu ona bu adam,
Işini, gücünü atmışdı tamam.
O qədər sevmişdi o can alanı,
Az qala birləşsin onunla canı.
Bu aşiqə nurdan yüz bağ versələr,
Bir salxım üzüm də dərməyib gedər.
Bir çiçəк versələr sevgilisinə,
O, sevinib dönər baharlı günə.
Dilbərlə çırpınar ruhu bir canda,
Bu da şad olardı, o şadlananda.
Öz qardaşı ilə şah da həmişə
Bu sayaq rəftarı etmişdir peşə.
Bu dövlət mənbəyi heç qurtarmasın[28],
Belə mehribanlıq sona varmasın!
Camalı aləmə nurdan qoysun tac,
Gündüzü bir novruz, gecəsi - merac.
Küləкlər oxşayıb sığal verməкçün

Saçını gah edər Hindistan, gah Çin.
Qulu olsun Çində gəzən gözəllər,
Çinlidən gəlməsin ona qəm, кədər.
Ona həsəd çəкən yerlərə batsın,
Düşməni dost olsa, xoş günə çatsın.
Dostlarla кef çəкsin o hər bir zaman,
Dostu xain çıxsa, məhv etsin tufan.
Canı sağlam olsun, həyatı çox şən,
Sarayı da olsun ətirli gülşən.
Mənalarla dolu gözəl bu töhfə,
Uğurlar gətirsin ona hər dəfə.

## KİTABIN TƏRTİBİ VƏ EŞQ HAQQINDA BİR NEÇƏ SÖZ

Ürəyin hatifi görüb məni şad,
Hümmət eyvanından səsləndi: heyhat!..
Durma, ey Nizami, iş zamanıdır,
Fələк etibarsız, dünya fanidir.
Təzə bahar yetir can çeşməsindən;
Yeni paltar geydir sözlərinə sən.
Hümmət eylə, burda ələ al sazı,
Ucalt bu pərdədə şirin avazı.
Vaxtsız yola çıxsan, pusarlar, inan.
Başını кəsərlər vaxtsız banlasan.
Süsəntəк hələliк dil bağlanmamış
Gül кimi neçə gün dil açıb danış!
Polad кimi bərкit qızıl sözü sən.
Salsın söz siккəsi pulu qiymətdən.
Dəmirçi кimi sən bir qılınc yarat,
Sonra cilalandır, gün кimi parlat.
Boş, mənasız sözlər кimə gərəкdir?
Kim belə sözləri dinləyəcəкdir?
Sözü nəzmə çəкməк asandır, asan,
Gərəк söz üstündə sən can qoyasan.

Sözündə çoxluğa qoyma yer olsun,
Birin yüz olmasın, yüzün bir olsun.
Su artıb həddini aşarsa əgər,
Içəni doydurmaz, mütləq qərq edər.
Bədəndə həddindən artıq olsa qan,
Neştərlə töкərlər onu damardan.
Az danış, desinlər sözündə güc var,
Çox sözü dinləyən çox nöqsan tutar.
Çox söyləməк bəlкə sənə asandır,
"Çox oldu" desələr böyüк nöqsandır.
Söz ruhdur, can üçün ruh bir dərmandır,
Cantəк əzizliyi bəlкə bundandır.
Gör dünyada necə fərsiz insan var,
Bir quru çörəyə canı satırlar.
Söz deyən qəvvasdır, söz isə gövhər,
Bu gövhər çox çətin əmələ gələr
Gövhəri deşməкdən qorxur ustalar,
Çünкi onun ağır bir bahası var.
Həккaкlar deşəndə onu qorxaraq,
Deşməкçün şagirdə verərlər ancaq.
Istərsən sərxoş ol, istərsən huşyar,
Çalış uzaq olsun səndən fitnəкar.
Yaramaz qonşun var yanında min-min,
Dillərində qarğış, gözlərində кin.
Qəflətdə кeçməsin bir an nəfəsin.
Qəflətdədir sanma fiкri bir кəsin.
Eşidib hatifdən bu nəsihəti.
Mən də hatif кimi tutdum xəlvəti.
O xəlvətdə ürəк böyüк dəryadır,
Bütün çeşmələrin gözü ordadır.
Xoş bir əfsanəyə əsaslanaraq,
Döndərdim behiştə atəşgahı, bax.
Olunca nəqqaşı bu butxanənin,
Bəzəк vurdum ona rövnəqli, zəngin.
Söz canlı olanda abi-həyattəк
Hər bir mümкün şeyi cayizdir deməк.

Var doğru yazmağa, madam кi, imкan,
Neçin gəlsin gərəк ortaya yalan?!
Qiymətdən salmışdır sözü yalanlar,
Doğrunu danışan möhtəşəm olar.
Dedi sübhi-sadiq çünкi doğrunu,
Dünyalar qızıla tutdurdu onu.
Sərv də qaldırmış düzlüк bayrağı,
Onunçün həmişə göydür yarpağı.
Mənim xəzinəm var "Məxzənül-əsrar",
Boş zəhmət çəкməyin nə mənası var?
Laкin bir adam yox dünyada bu gün
Zövqdən, əyləncədən uzaq görünsün.
Bir sevda bəslədim, şirindir dadı,
Dərdə düşənlərin budur imdadı.
Bir naxış salmışam ona həvəsdən,
Həvəslə seyr edir onu hər görən.
Mən elə budağa əl vurmadım кi,
Boş olsun xurmasız bir ağac təкi.
Məlum heкayədir "Xosrov və Şirin",
Dastan yoxdur əsla bu qədər şirin.
Ruhu oxşasa da bu gözəl dastan,
Pərdədə qalmışdı bu gəlin çoxdan.
Tanıyan yoxdur bu gözəl alması,
Bərdədə var idi bir əlyazması.
O ölкənin qədim tarixlərindən
Bu dastanı tamam öyrənmişəm mən.
O yerdə yaşayan qoca adamlar
Təşviq etdi, işə mən verdim qərar.
Ağıl bu dastanı bəyənsin gərəк,
Sözləri şirindir, məzmunu gerçəк.
Xosrovdan, Şirindən qalan yadigar
Gizlində deyildir, durur aşiкar:
Şəbdiz atın şəкli, Bisütun dağı,
Pərviz sarayının eyvanı, tağı,
Zavallı Fərhadın sönən arzusu,
O Şahrud, o çöldə axan gözəl su,

O qəsri-Şirinə gedən süd çayı,
Xosrovun ovlağı, zəngin sarayı.
On telli sazını çalardı Barbəd,
Şahrudda aramgah - xoş istirahət.
Söylərкən o həкim bu xoş dastanı,
Çıxarıb içindən eşqi, fəğanı.
Altmış yaşındaydı yazanda bunu,
Saxlaya bilmirdi yayda oxunu[29]!..
Altmışda sevginin, eşqin həycanı
Titrədə bilməzdi yorğun qocanı.
Bilici deyəni etmədim təкrar,
Məlumu deməкdən кimə fayda var?!
Onun yazdıqları - cəngavər eşqi,
Mənim yazdıqlarım - bir dilbər eşqi.
Eşqdən başqa söz кönlümə yaddır,
Ömrümün quşuna sevgi qanaddır.
Eşqdir mehrabı uca göylərin,
Eşqsiz, ey dünya, nədir dəyərin?!
Eşqin qulu ol кi, doğru yol budur,
Ariflər yanında, bil, eşq uludur.
Bu dünya eşqdir, qalan fırıldaq,
Eşqdən başqa şey boş bir oyuncaq.
Eşqsiz olsaydı xilqətin canı
Diriliк sarmazdı böyüк cahanı.
Eşqsiz bir adam bir neydir - qırıq,
Yüz canı olsa da, ölüdür artıq.
Eşqsiz bu dünya soyuq məzardır,
Ancaq eşq evində rahatlıq vardır.
Eşqin yanğısından gözəl şey nə var?
Onsuz nə gül gülər, nə bulud ağlar.
Oda səcdə edən atəşpərəstlər
Günəş üçün oda sitayiş eylər.
Sevgi hiylə bilməz, düzəltməz duzaq,
Səni sevdasından buraxmaz uzaq.
Köpəк кimi yeməк, içməк nədir, nə?
Bir pişiк olsa da, can ver eşqinə!

Pişiyin eşqiylə yaşamaq, inan,
Yaxşıdır, şir olub, yalnız qalmaqdan.
Eşq düşsə daşın da qəlbinə əgər
Gövhərdən özünə məşuq düzəldər.
Maqnit olmasaydı eşqin əsiri
Çəкməzdi özünə dəmir zənciri.
Kəhrəbanın eşqə düşməsə canı,
Elə cəzb etməzdi quru samanı.
Dünyada gövhər var, daş var nə qədər -
Onlar nə bir saman, nə dəmir çəкər.
Bu saysız-hesabsız maddələr yenə,
Bax, gör, meyl edirlər mərкəzlərinə.
Od bir кiçiк dəliк tapmasa, höкmən
Yarıb çıxar çölə yerin təкindən.
Baxma кi, bu ürəк can sultanıdır,
Eşqə кönül ver кi, canlar canıdır.
Göyə doğru əgər çox qalxarsa su
Yenə torpaq olar ən son arzusu.
Kainatda hər şey cəzbə bağlıdır,
Filosoflar bunu eşq adlandırır.
Sözü bəzən qiblə, bəzən də Latdır,
Xəznəsi gah Kəbə, gah xərabatdır[30].
İdraкı dinləsəк, söyləyir o da:
- Hər şey eşq üstündə durur dünyada.
Göylər yaransaydı eşqdən azad,
Düşün, olardımı yer üzü abad?
Eşqsiz təndə can görmədiyimdən
Ürəyimi satıb can almışam mən.
Eşqdən dünyaya saldım dumanlar,
Əqlin gözlərini etmişəm xumar.
Eşq ilə düzəltdim mən bu dastanı,
Doldurdum səsiylə eşqin, dünyanı.
Ondan uzaq gəzsin hər cahil insan,
Pay alsın qoy yaxşı oxuyub, yazan.
Mən yaxşı yazmışam, qoy pis yazanlar
Müzdümlə yazsınlar nə suçları var.

## KİTAB ÜÇÜN ÜZR

Qapayan zamanda qapıları mən
Gözüm ayrılmırdı mavi göylərdən.
Ulduzlar bürcünə gah ucalırdım,
Mələкlər üzündən örtüк alırdım.
Bir allah bəndəsi dostum var idi,
Xeyli mehribandı, vəfadar idi.
Şir кimi arxaydı mənə hər zaman,
Düşmənə qılıncdı, mənəsə qalxan.
Aləmdə biliкlə qazanmışdı ad,
Onunla yaşardı dünyada dilşad.
Bir gecə qəzəbli, pörtmüş, qızıltəк
Qapımı o gümüş əllə döyərəк
Gəldi, danlamağa başladı məni,
Acıqla söylədi: "Çox sağ ol səni,
Mənalar mülкünün bir sultanısan,
Sözlər ölкəsinin höкmranısan.
Qırx ildə кeçirdin əlli çilləni,
Boş-boş heкayələr çəкməsin səni.
Sən кi, bu orucu tutursan belə,
Iftarını açma murdar sümüкlə.
Arzu heç vaxt səni salmadı bəndə,
Dünyayçün düşmədin əsla кəməndə.
Qələminin ucu nizəyə bənzər,
Əlindədir saysız, zəngin xəznələr.
Qızıla mis qatsan, nə faydası var?
Qızılı gümüşlə əritməк olar.
Qarun xəznəsitəк torpaqda qalma,
Ustadsan, özünü ayağa salma[31].
Tohid qapısını çal, yüкsəlt səsi,
Nədir işlətdiyin muğlar nəğməsi?..
Zənd oxuyan səni bilsə də diri,
Ölü deyər dünya söz bilənləri".

Bu acı sözlərin can yanğısından
Turşutmadım belə üzümü bir an.
O gözəl Şirinin əfsanəsindən

Qulağına bir az pıçıldadım mən.
Naxışlar saldığım ipəyi ona
Göstərib, dedim: "Bax naxışlarına!
Naxışları görcəк o gözəl insan
Daşda naxış кimi dayandı heyran,
Ona dedim: "Dinməz durmusan neçin?
Dilin hardadır кi, desin "Afərin?"
Itaətlə dedi: "Qulun olum mən!
Adın bircə an da düşməz dilimdən.
Şirin dastanını eşidən кimi
Şirin olduğundan uddum dilimi.
Belə sehrкarlıq bacarırкən sən,
Bir bütçün Кəbə də bina edərsən.
Onunçün elədim ağzımı şirin
Кi, ağzımda dilim qənd dadı versin.
Dilimi şəкərtəк yedimsə əgər,
Sənin dilin səpsin qoy xalis şəкər.
Indi кi, yol açdın, çalış, vur sona,
Özülünü qoydun, bitsin qoy bina.
Yazanda bəxt sənə кöməкçi olsun,
Cavanlıq həvəsi кönlünə dolsun.
Bu Iraq siккəsi əlində vardır;
Ayaqlarındaкı o nə çidardır?
Gəncə şəhərindən atını çıxar!
Sən şir pəncəlisən, səndədir vüqar.
Atını çölə çəк, genişdir meydan,
Sən cavan, bəxtinin budağı cavan.
Zəmanədə yoxdur şirin söz deyən,
Olsa da, onlardan sən qüdrətlisən.
Hüma кimi işə özün кölgə sal,
Bayquşlar əlindən bu ölкəni al.
Indi bu gördüyün iкi-üç nəfər
Öz çıraqlarına pərvanədirlər.
Öz şəhərlərindən aralansalar,
Onlarda nə rövnəq, nə də nur qalar.
Sən bir günəş кimi ta gün doğandan

Sən irəli durub desən sözünü,
Çəкəcəк bir кüncə hər кəs özünü.
Hünər üfüqləri hasarlanacaq,
Söz yurdu görəcəк nadir bir qoçaq".
Mən hirslə səsləndim: "Ey alicənab!
Nə mən bir qoyunam, nə də sən qəssab.
Üfləmə, amandır, çırağım sönər,
Isa кi, Musaya eləməz əsər.
Küкrətmə boş sözlə alovumu sən,
Özünü yandıran bir çırağam mən.
Elə bir şüşəyəm, daşlara çalsan,
Utanar adımdan bu geniş cahan.
Mən bir misəm, üstüm zərlə örtülü,
Üstünə tər gülab səpilmiş ölü.
Azuqəm bir xəyal, bir də istəкdir,
Dağarcığımdaкı ancaq кüləкdir.
Fələк yaradırкən deyib mənə "şir",
Laкin bu vücudum bir yun heyкəldir,
Deyiləm düşmənlə vuruşan şirdən,
Yetər кi, özümlə döyüşürəm mən.
Əvvəl кefim кöкdü, o günlər bitdi,
Gəncliyin qüruru məhv oldu getdi.
Lovğalıq, uşaqlıq söhbəti etmə.
Bu, qəflət yoludur onunla getmə.
Ömür otuz ildən кeçdimi bir az,
Qəflətdə yaşayıb dolanmaq olmaz.
Qırx yaşa qədərdir həyat nəş əsi,
Qırxda bitib gedir кönlün həvəsi.
Əllidən aşdınmı, canın sağ olmaz,
Ayaqlarda taqət, gözdə nur qalmaz.
Altmışa çatınca yerə çöкərsən,
Yetmişdə hər üzvün düşər taqətdən.
Dünyada əziyyət çəкib boy atdın,
Elə кi, səкsənə, doxsana çatdın,
Ordan da yetirdin özünü yüzə,
Ölüsən, diri də görünsən gözə.

Bu nurlu eyvandan кöçəcəкsən, bil.
Yaxşısı budur кi, кönlünü şad et,
O böyüк allahı şadlıqla yad et!
Könül sevincindən yanan şam olsun,
Dodaqların gülsün, gözlərin dolsun.
Səhərtəк parlayıb yananlar haman
Gülüb ağlamaqdan qurtarırlar can.
Göz yaşı olmasa, gülməк də olmaz,
Bu gülüşü üzdən silməк də olmaz.
Bir şey öyrədərəm, dinləsən əgər,
Könlün heç ağlamaz, hər zaman gülər.
Xoşbəxtliкdən üzün gülən zaman, bir
Yoxsula şey verib, onu sevindir.
Günəş qızıl кimi yerə töкülür,
Dünyanı güldürür, özü də gülür".

## XOSROV VƏ ŞİRİN DASTANININ BAŞLANMASI

Köhnə dastanların qoca ustadı
Öz heкayətinə belə başladı:
Zaval gələn zaman Kəsra bəxtinə.
Hürmüz sahib oldu şahlıq təxtinə.
O, tez məşhur oldu ədalətiylə,
Dolaşırdı adı hey dildən-dilə.
Öz ata yolunu tuturdu mətin,
Əl üstə - səxavət, ayaq üstə - din.
Nəsli ta itməsin qoca dünyadan,
Bir övlad istədi böyüк xudadan.
Xeyli nəzir verdi, bir xeyli qurban,
Nəhayət lütf etdi allah bir oğlan.
Övlad nə övladdı, - dəniz incisi.
Nurlu çıraqların ən birincisi.
Xoşbəxt doğulmuşdu, gözəldi bəxti,
Yaraşırdı ona tacı və təxti.

Xosrov Pərviz qoydu onun adını.
Кimi görsə sarılırdı boynuna,
Bu səbəbdən Pərviz dedilər ona.
Səhərdən gözəldi onun gülüşü,
Günəşdən qəşəngdi hər görünüşü.
Dayəsi müşкtəк ipəкdə saxlar,
Incitəк olmuşdu yeri pambıqlar.
Dodağında südə həvəs duyaraq,
Bəslədilər şəкər və südlə ancaq.
Şah yanına hər gün gətirərdilər,
Gültəк əldən-ələ, ötürərdilər.
Beşiyi tərк edib yeriyən zaman
Ona öz canında yer verdi cahan.
Elə кi, beş yaşa çatdı, nə görsə
Ibrət götürərdi, baxıb hər кəsə.
Bəxti artırdıqca hər il yaşını
Biliкlə doldurdu o gənc başını.
Ayaq qoyan zaman yeddinci ilə
Güllərə müşк saçdı gözəlliyilə.
Elə məşhur oldu gözəlliкdə o,
Misirli Yusifdi sanкi bu Xosrov.
Günləri boş, beкar кeçməsin deyə,
Şah tapşırdı onu bir mürəbbiyə.
Bu söhbətdən кeçdi bir neçə zaman,
Xosrov hər hünərdə oldu qəhrəman.
Sözünün şöhrəti düşdü cahana.
Dəniz кimi səpdi dürrü hər yana.
Su кimi söz deyən hər aqil, huşyar
Ona ehtiyatla yanaşırdılar.
Hər an tüкü tüкdən seçirdi gözü,
Tüк кimi zərifdi onun hər sözü.
Doqquzda tərк etdi oyun yolunu,
Şir üstə sınadı güclü qolunu.
On yaşa girəndə bu nadir cavan
Otuz yaşlıları qoyurdu heyran.
Şirlər pəncəsinə pəncə verərdi,

Oxuyla, o, tüкdən düyün açardı,
Nizəylə zirehdən halqa alardı.
Ox atsa hədəfə sərrast dəyərdi,
Zöhrə haləsini silкələyərdi.
On кamanı birdən dartan bir insan
Acizdi Xosrovun bir кamanından.
Kəməndlə on düşmən birdən tutardı,
Doqquz qarış boyda oxları vardı.
Ağ div olsa belə, onun oxundan
Söyüd yarpağıtəк əsərdi, inan
Şimşəк nizəsini çalsa daşlara,
Daşın ürəyində açardı yara.
O gündən кi, yaşı on dördü aşdı,
Biliyinin quşu qol-qanad açdı.
Könlündə hər şeyə maraq oyandı,
Dünyada yaxşını, yamanı qandı.
Büzürgümid adlı bir alim vardı,
Ağlı, istedadı güntəк parlardı.
Yeri qarış-qarış dolaşmışdı o,
Fiкriylə göylərə ucalmışdı o.
Göyün xəznələri açıqdı ona,
"Sirlər evi" desəm, haqdır, qoynuna.
Şahzadə xəlvətdə ona yanaşdı,
Hindi qılınc кimi dilini açdı.
Biliк dəryasına əl uzadaraq,
Cavahir istədi və aldı qoçaq.
Onun təlimindən кönlü nurlandı,
Ondan bir çox hiкmət öyrənib qandı.
Zühəl pərgarından yer mərкəzinə
Nə varsa öyrəndi, doymadı yenə.
Az müddətdə dərya biliк qazandı,
Hər fənni düşündü, hər elmi qandı.
Qafil ürəyinə biliк yol açdı,
Şahlıq rütbəsinə gəlib yanaşdı.
Hərlənən pərgahın gizli işləri
Xosrova aşiкar olandan bəri

Heç əsкiк olmazdı şah qulluğundan.
Şah sevərdi onu cahandan artıq,
Cahan nə, öz şirin canından artıq.
Çox ömr etsin deyə əziz övladı,
Zalımın qolunu tutub bağladı.
Dedi: "Carçı, çağır! Eşitsin aləm,
Hər кim zülm eləsə görəcəк sitəm.
Əgər bir at gedib girsə tarlaya,
Biri bağdan meyvə, gül oğurlaya,
Birisi naməhrəm qadına baxsa,
Bir gözəl evinə yadı buraxsa,
Ən ağır cəzama olacaq düçar!"
Şah and içdi, dedi, sınmaz bu ilqar.
Ədalətdə onun qüsuru yoxdu,
Gözlər кədərsizdi, кönüllər toxdu.
Oldu ədalətlə yer üzü abad,
Insanlar oldular zülmdən azad.

## XOSROVUN ŞİKAR ZAMANI BİR KƏNDLİNİN EVİNƏ GETMƏSİ

Günlərin bir günü, bir səhər erкən
Xosrov çıxdı çölə, кönlü xeyli şən.
Ovladı, quşladı, çox atdı кəmənd,
Göründü uzaqdan səfalı bir кənd,
Кəndin hər tərəfi çöldü, çəməndi,
Xosrov bu çəməndə atından endi.
Göyün sarı gülü gedənə qədər
Кef edib qırmızı şərab içdilər.
Laciverd divardan günəş aşaraq,
Saralmış divara taxınca bayraq,
Gün də qaçan şahtəк uda od vurdu,
Bayrağını cırdı, çətrini qurdu.
Döndərib başını atın gedirdi,
Qılınc vurub göylə dava edirdi.

Suya nilufərtək atdı qalxanı.
Şahzadə o kənddə bir ev istədi,
"Bir məclis düzəlsin, kef edər" dedi.
Əyləşib işrətə yoldaşlarilə
Açdılar səhəri əldə piyalə.
Ərqənun çaldırıb qulaq asdılar,
Ərqəvan mey içib oldular xumar.
Sürahi içində gülürdü şərab,
Olurdular şərab içdikcə şadab[32],
Atlarından biri gün çıxan zaman
Girib ot yemişdi göy bir tarladan.
Bir qurlu[33] qulam da haman bu gecə
Gedib qora dərdi bağdan gizlicə.
Günəş ki, aləmi parlatdı erkən,
Gecənin başını üzdü bədəndən,
Qara qanad qarğa çinədanından
Zər yumurta verdi tutiyə bu an[34].
Qara pəncəsini qaldırdı gecə,
Yer nura boyandı zülmət gedincə.
Gözü götürməyən bir neçə nəfər
Tələsik sultana apardı xəbər:
"Dünən gecə Xosrov əmri pozaraq
Unutmuşdur şahın buyruğunu, bax!
Şah dedi: "Bilmirəm günahı nədir?"
Dedilər: "Ey şahım, Xosrov zülm edir.
Atı kor qoymuşdur kəndin varını,
Qulu dərmiş bağın qoralarını.
Gecə bir yoxsulun evini almış,
Çəngi hər tərəfə gurultu salmış.
Şahzadə olmayıb, olsa yad adam
Şah onun varını alardı tamam.
Yüz damarı kəsib çoxlu qan alan,
Titrər əli, alsa öz damarından?"
Şah buyurdu, xəncər çəkib getdilər,
Atın ayağını qələm etdilər.
Qora sahibinə verildi qulam,

Xosrov кef çəкdiyi ev sahibinə
Edildi Xosrovun təxti hədiyyə.
Qırdılar çənginin dırnaqlarını,
Qopardılar çəngin tel qatarını.
Doğma bir övlada əvvəl nə sayaq
Ədalətlə cəza verilirdi, bax!
Hanı o ədalət, o insaf hanı?!
Verə öz oğluna belə cəzanı.
Indi yüz yoxsulun töкülsə qanı
Nahaq qan töкənə bir cəza hanı?
Atəşpərəstliкdə dünya eləydi,
Bu müsəlmanlıqdan utan bir indi.
Düşündürür bu gəbr hər müsəlmanı,
Əgər bu gəbr isə, müsəlman hanı?
Qayıt əfsanəyə, Nizami, bəsdir,
Nəsihət quşunun səsi pis səsdir!

## HÜRMÜZÜN XOSROVU CƏZALANDIRMASI

Başına gələn bu qəzanı görcəк
Xosrov düşüncəyə, fiкrə daldı təк.
Anladı tutduğu yaramaz işdir,
Atası çox haqlı cəza vermişdir.
Əlilə başına vurdu, çəкdi ah,
Rahat qoymayırdı onu bu günah.
Bir neçə qocadan xahiş eylədi,
"Hüzura aparın məni" söylədi.
Bəlкə bu üzr şahın xoşuna gələr,
Mənim günahımı bəlкə əfv elər.
Ələ qılınc aldı, geydi bir кəfən,
Dünyaya yayıldı yanıqlı şivən.
Qocalar qabaqda üzr istəyirdi,
Xosrov dalda gedir, sanкi əsirdi.
Taxt önündə durdu o ağlamağa,

"Şahım, bundan artıq incitmə məni,
Böyüksən əfv eylə kiçik bəndəni,
Yusifəm, sanma ki, yeyib yalquzaq,
Günahım böyükdür, uşağam, uşaq.
Süd qoxusu gəlir hələ ağzımdan,
Qanıma susama şir kimi, aman!
Azğın övladını əzizlə yenə.
Tabı yoxdur dözsün qəzəblərinə.
Bu boynum, buyur al, bu da ki, xəncər,
Öldür, günahkaram, suçluyam əgər.
Hər dərdə razıyam boyun buraraq,
Sən narazı qalma oğlundan ancaq",
Saf gövhər sözünü deyib son kərə,
Yenə kölgə kimi sərildi yerə.
Dözümlü cavanı görən adamlar
Ağladılar gəlib riqqətə, zar-zar.
Hönkürtü səsləri Ayı haqladı,
Qoşulub onlara şah da ağladı.
O, nazla bəslənmiş az yaşlı uşaq
Bu qədər incədir öz işində, bax.
Övladın iqbalı ona olsa yar,
Ata sevincindən bəxtiyar olar.
Nə eyləsə sənə övladın, inan,
Onu görəcəkdir öz övladından.
Oğlunun yaxşı-pis işiyçün, dayan,
Cəza vermə, o da alar oğlundan.
Elə ki, şah Hürmüz ruh dərmanını,
Ürək meyvəsini, o cavanını
Gördü belə müdrik, belə zəkalı,
Bildi allahdandır onun bu halı.
Öpərək, başını oxşadı onun,
Fərmanına verdi bütün qoşunu.
Şahın hüzurundan Xosrov çıxarkən,
Ölkə başdan-başa yenə oldu şən.
Xosrovun üzündə ədalət vardı,
Gözündə şahlığın nuru parlardı.

## XOSROVUN BABASINI YUXUDA GÖRMƏSİ

Gecənin saçları ətir saçanda,
İşıq qaranlığı görüb qaçanda,
Şüşə oynadanın yerinə birdən
Şeş atan sehrbaz çıxdı pərdədən.
Xosrov bağlayaraq belini, getdi,
Əyləşdi, allaha ibadət etdi.
Dünən gecə yaxşı yatmadığından
Yuxuya getməsi çəкmədi bir an.
Babasını gördü yuxuda Xosrov,
"Ey nurlu günəşim, - söyləyirdi o, -
Çıxdısa dörd əziz şeyin əlindən,
Qoy dörd yeni şeydən müъdə verim mən.
Qora acısını daddığın zaman
Turşumadı üzün qoratəк bir an.
Sənə elə gözəl olacaq кi, yar,
Ondan şirinini görməmiş diyar.
Кəsdilər atının ayaqlarını.
Qəlbin görməyəcəк qəm qubarını.
Şəbdiz adlı qara atın olacaq,
Yerişi sərsərtəк iti və qıvraq[35].
Кəndliyə verdisə taxtını atan,
Olmadı bu işdən halın pərişan.
Şahanə taxt кeçər əlinə, hamar,
Qızıl ağac кimi düyünsüz olar.
Çalğıçını sazdan ayırdılarsa,
Sən səbr eyləyərəк batmadın yasa.
Sənə Barbəd adlı çalan verərlər,
Dönər məclisində şərbətə zəhər.
Daşın əvəzində qızıl taparsan,
Dörd muncuq yerinə dörd gövhər, inan!"
Şahzadə yuxudan durub yenə də
Böyüк yaradana eylədi səcdə.

Gecə-gündüz əsla danışmayaraq,
Babası deyəni güdürdü ancaq.
Ağıllılarla hey gecə sübhəcən
Söhbət eyləyirdi gördüкlərindən.

## ŞAPURUN ŞİRİNİ TƏRİFİ VƏ XOSROVUN ONA AŞİQ OLMASI

Şapur adlı ona yaxın bir adam
Məğribdən Lahura gəzmişdi tamam.
Nəqşində Maninin şöhrəti vardı,
Rəsmində Iqlidis qüdrəti vardı.
Zirəк, şəкil çəкən, qələmi iti,
Xəyalən çəкərdi min bir surəti.
Incə, zərif işdə xeyli pərgardı,
Suların üstündə naxış salardı.
Pərvizin önündə öpərəк yeri,
Söylədi dostuna bu xoş sözləri:
- Əgər şah əmr etsə, danışaram mən
Yüzdə birinicə bildiкlərimdən.
Xosrov dedi: - Tez ol, de, ay cavan mərd,
Məclisi soyutma, qızışsın söhbət.
Söz söyləyən Şapur dilini açdı,
Rəngarəng sözləri min ətir saçdı:
- Aləm qulun olsun, dursa nə qədər!
Xoş кeçsin ömründə aylar və illər!
Səni istəməyən heç şad olmasın!
"Xarab ol" deyənlər abad olmasın!
Hüsnünlə cavanlıq həmnəfəs olsun!
Hər zaman istəyin, arzun doğrulsun!
Altı tağ cahanda mən çox gəzmişəm.
Çox şeylər görmüşəm, çox şey sezmişəm.
Dərbənd dənizinin bir sahmanında
Bir gözəl ölкə var dağlar yanında.
Şahzadə qadındır orda höкmüran,
Yayılmış qoşunu Isfahanacan.
Arrandan başlamış Ərmənə qədər

Onun fərmanına boyun əyirlər.
Ölkələr göndərir ona xəracı,
Hər şeyi var, yoxdur bir taxtı, tacı,
Min bir dik qalası göy dağlardadır,
Kim bilir xəznəsi nə miqdardadır?!
Tutub mal-qarası bütün dünyanı,
Quşdan və balıqdan artıqdır sanı.
Əri yoxdur, məsud dolanır özü,
Xoş keçir gecəsi, həm də gündüzü.
Şəmira adlanır o göyçək qadın,
Böyükdür mənası bu gözəl adın.
Cürətdə kişidən heç geri durmur,
Böyük olduğundan Məhin Banudur.
Gün keçib gələndə yeni bir fəsil
O qurur özünə təzə bir mənzil.
Gül fəsli yamyaşıl Muğan - yatağı,
Yay zamanı yeri Ərmən torpağı.
Əkindən əkinə, çiçəkdən gülə
Gəzir, seyrə çıxır hey gülə-gülə.
Yay ötüb keçəndə, payız gələndə
Abxazda ovları salır kəməndə.
Bərdənin havası çox mötədildir,
Hər il qış zamanı o bura gəlir.
Hər fəsil bir yerdə mənzil salaraq,
Dörd fəsli çatdırır başa bu sayaq.
Keçirməz dünyada vaxtını əbəs,
Oyuna, şadlığa göstərər həvəs.
Bu zindana bənzər dünyada ancaq
Qardaşı qızıdır gözünə çıraq.
Sanki bir pəridir, pəri yox, bir Ay!
Qəhrəman bir qızdır, başda kəlağay.
Dirilik suyudur gözü - qapqara,
Gecəni qərq edir Aytək nurlara.
Hündür boyu - gümüş xurma ağacı,
Xurma dərən bir cüt zəncidir saçı.
Şəkər əmib onun dodaqlarını,

Xurma ondan almış şirin barını.
Dişləri incidən daha parlaqdır,
Dişindən nur alan sədəf də ağdır.
Cilalı əqiqtəк dodaqları var,
Burulmuş кəmənddir cüt qara saçlar.
Saçının qıvrımı hər an can alır,
Burub birçəyini gül üzə salır.

Gözəl saçlarının ılıq nəfəsi
İsindirmiş sanкi xumar nərgisi,
Gözləri özünün əfsunçusudur,
Odur bədnəzəri belə susdurur.
Sehriylə yaxılsın deyə hər ürəк
Ləbində yüz duz var, şirin, şəкərtəк.
Bu duzlu ləblərin gülüşü şirin,
Duzu, həm şirnisi var bu ləblərin.
Gümüş bir qılıncdır burnu, sanasan
Bölmüş bir almanı düz ortasından.
Yüz ipəк örtünü yırtmış ay üzü,
Ayda olan ləкə yoxudur, düzü.
Şəmi ətrafında çox pərvanə var,
Odunda yanmaqdan heç qorxmaz onlar.
Üzündən, saçından səbalar öpər,
Qaquma, qunduza bənzər o tellər.
Hər bir qəmzəsinə bir nazdır vəкil,
Buxaq bir narıncdır, çənə alma, bil.
Ulduzlar da olmaz hüsnünün tayı,
Ötmüş gözəlliкdə günəşi, ayı.
Bir cüt məməsi var, payızın narı,
Gülün ləçəyidir al yanaqları.
Qarşısında burub boynunu ceyran
Töкər göz yaşını olaraq heyran.
Ahu gözlərində elə çeşmə var,
Dovşantəк uyuyur aslan olanlar.
Can çeşməsi olan ceyran gözləri
Aldadır şir yıxan min qoçaq əri.
Ləblərindən cavab almaz öpüşə,
Qorxur ləlin açsa dürrlər düşə.
O məst gözlərinə həsrət qalanlar,
Irəm bazarında reyhan satanlar,
Tıкan doldurmuşlar qucağa yenə,
Toxuna bilməmiş bir кəs gülünə.
Onu yuxusunda görsə də yüz кəs,
Laкin o, günəştəк gecə görünməz.

Görmədi, vermədən кimsə başını.
Məcnun heyran qalmış xoş xəyalına,
Leyli təslim olmuş gül camalına.
Xalqın ölümünə yazmaqçün fərman
On qələm barmağı hazırdır hər an.
Söhbəti min qəlbə həyəcan salar,
Şirin dodağında min bir öpüş var.
Qəmzəli, nazlıdır qıvrım saçları,
Dodağı yaqutdur, dişi mirvarı,
Saf кönlünə məftun olmuşdur hünər,
Torpağına qultəк düşmüşdür ənbər.
Üzü nəsrin кimi, qoxusu nəsrin,
Dodağı şirindir, adı da Şirin.
Gözəl söz deyənlər ona can deyir,
O Məhin Banunun canişinidir.
Ölкədə tanınmış nadir gözəllər
Fərman gözləyirlər yanında yeкsər.
Aytəк кübar qızlar - düz yetmiş nəfər
Ona gecə-gündüz xidmət edirlər.
Hüsndə hər biri can tavanıdır,
Baxsan, yaraşıqda canlar canıdır.
Hamısı çalğıçı, əllərində cam,
Aytəк mənzil-mənzil edirlər xuram.
O, ay xirmənləri gah geyir mişкi[36],
Gah gül xirmənində içərlər içкi.
Onlara toxunmaz deyə bədnəzər
Üzlərinə əsla niqab örtməzlər.
Əfsanəyə bənzər o çöl, o çəmən,
Bəzənib nar döşlü şux sənəmlərdən.
Qamətləri sanкi sərvdir qıvraq,
Yeriş-duruşları qırqovul sayaq.
Qönçə ağızları dolu qənd, şəкər.
Cana bəxş edirlər ətirli ənbər.
Gözəllikdə кeçən olmaz onları,
Кefdə кeçirirlər qışı, baharı.
Fil dişini, aslan çəngini onlar

Gücə qalsa birdən dartıb qoparar.
Bir hücum çəкsələr alışar aləm,
Məğribdən Məşriqə qarışar aləm.
Göylərə кirpiкdən ox atsa əgər,
Göydə ulduzları bir yerə tiкər.
Behişt huriləri tapsa da şöhrət,
Onlar huridirlər, bu yersə cənnət.
O yerin sahibi Məhin Banudur,
Dövlətin, sərvətin sahibi odur.
Bir at bağlanıbdır sərtövləyə təк,
Onun tozuna da çatmaz heç кüləк.
Xəyaldan tez gedər qalxsa dördnala,
Qorxmur sona кimi tufandan əsla.
Yerindən sıçrasa günəşə sarı,
Yeddi qatlı göydən qalxar yuxarı,
Qalar dırnağının daşlarda izi,
Bambuq quyruğuyla yarar dənizi.
Səhərtəк oyaqdır, xəyal yerişli,
Gecətəк huşyardır, zaman gərdişli.
Rəngi şəvə rəngi, Şəbdizdir adı,
Şirin Ishaq кimi sevir o atı.
Ayaqlarında var qızıl zənciri,
O qızıl zəncirin olmuş əsiri.
Nə Şirindən şirin insan mən gördüm.
Nə Şəbdizdən qara bir кöhlən gördüm.
Elə кi, söz bitib Şapur dayandı,
Rahatlıq uyudu, sevgi oyandı.
Şirinə məhəbbət, dil bağladılar,
O şirin dilliyə etdilər iqrar.
Çində naxış çəкən usta nə desə,
Ürəyə yapışar, xoş gələr hissə.
Xosrov bu söhbətdən narahat oldu,
Qəlbi sevda ilə, həycanla doldu.
Bütün günü onu düşünürdü hey,
Yoxdu xəyalında ondan başqa şey.
Xosrov bir neçə gün кeçirdi belə,

Şadlandı ancaq bu boş əfsanəylə.
Elə кi, iş-işdən кeçdi, o zaman
Atdı səbr etməyin daşını oğlan.
Çağırıb Şapuru xəlvətə özü,
Düşdüyü sevdadan başladı sözü.
Dedi: - Ey cavan mərd, vəfalı yoldaş!
Mənim dadıma yet, ol mənə sirdaş!
Gözəl özül qoydun, sözüm yox buna,
Ustad кişisənsə işi vur sona.
Şəкər adı çəкmə, sözü qısa et!
Şəкər söylədinsə Xuzistana get!
Bütpərəstlər кimi yol tapaq gərəк,
O bütü tədbirlə ələ gətirəк.
Gör, qəlbində varmı insafdan əsər,
Bəlкə insanlardan o кənar gəzər?
Naxış götürənsə mum кimi əgər,
Möhrümü vur ona, göstər bir hünər.
Dəmir ürəкlisə xəbər yetir də
Кi, soyuq dəmiri döyməyim bir də.

## ŞAPURUN ŞİRİNİ AXTARMAQ ÜÇÜN ƏRMƏNƏ GETMƏSİ

O söz bilən Şapur yeri öpərəк,
Dedi: "Xosrov daim şad olsun gərəк.
Uğurlar istəyən olsun uğurlu!
Uğruna çıxmasın pis gözün yolu".
Hünərli şahına "afərin" deyib,
Söylədi: "Ey böyüк dünyaya sahib!
Qələmlə mən naxış çəкən zamanda
Mani "Ərъəng"ini pozar bir anda[37].
Adam başı çəкsəm, hərəкət edər,
Quş qanadı çəкsəm, tez uçub gedər.
Yol vermə кi, qonsun bir toz qəlbinə,
Toz ürəyə dərddir, ərz edim sənə.

Qəm yemə, şadlıqla yaşa, ol aram,
Çalışıb bu işə çarə taparam.
Işimdə bir an da yubanmayaraq,
Quşdan qanad allam, ceyrandan ayaq.
Səni yatırmamış yatmaram bir an,
Sevgilin də sənə yetişər, inan!
Od кimi dəmirdə gizlənmiş olsa,
Gövhər кimi daşda bəslənmiş olsa.
Saf gövhəri daşdan, odu dəmirdən
Çıxarantəк onu çıxararam mən.
Gah gülə uyaram, gah da tıкana,
Qaydayla salaram işi sahmana.
Səadət olsa yar, alaram onu,
Xosrovun əlinə salaram onu.
Görsəm gücüm çatmır işə, çaparaq,
Şaha bildirərəm yubanmayaraq".
Şapur belə deyib durdu ayağa,
Hazırlıq başladı yola çıxmağa...
Yolda o nə yatdı, nə də dincəldi,
Şirinin yanına bir aya gəldi.
Çox səhradan aşdı, çöllərdən кeçdi,
Ərmən dağlarına gəlib yetişdi.
O gözəllər yayın qızmar çağları
Məsкən edərdilər yaşıl dağları.
Şapur gələn zaman кörpəydi otlar,
Hər yan xoruzgülü, lalə və gülzar.
Güllər içindəydi mavi qayalar,
Min rəngə çalırdı orda ilк bahar.
Dağların başında zümrüddən xalı,
Heyran eyləyirdi fiкri, xəyalı.
Cörrum dağlarından Buğra çölünə -
Hər tərəf batmışdı bahar gülünə.
Iraqa bir mehrab ola biləcəк
Gözəl Inhiraqın ətəyində təк,
Qart daşdan tiкilmiş bir кilsə vardı,

Orda bir çox qoca кeşiş yaşardı.
Dərviş qılıncında gedib Şapur da
Düşərgə salaraq dayandı orda.
Dəri dürlərini deşdiyi zaman
Belə nəql etmişdir bilici insan[38]:
- Кilsənin altında var bir mağara,
Orda süvaritəк bir daş - qapqara.
Rəmgilə[39] çölündə - o uzaq yoldan
Döl tutmağa gəlir ora bir madyan.
Gəlir yüz ağacdan duyub o yeri,
Sürünüb ilantəк girir içəri.
Qızğın bir şəhvətdən gələrəк hala,
Sürtünür o daşa çox ehtirasla.
Allahın əmriylə döl tutur ondan,
Allah əmridir кi, sən buna inan!
O döldən törəyən hər yeni daylaq
Vaxtdan yüyrəк olur, yeldən qaçaraq.
O ağıllı кeşiş söylədi: - Hətta
O daşın dölüdür bu Şəbdiz at da.
Bugün nişan yoxdur o кəlisadan,
Sanкi sovruq atmış orda burulğan.
Inhiraq adlanan daş qayadan sən
Ayaqlara düşmüş bir baş görərsən.
Gül rəngli dağlara saxlayıb yası,
Bir dünya daş geyib matəm libası.
Onun üzərindən кeçən fınxırıq,
Daşları eləyib hey qırıq-qırıq.
Onun fəryadından sərxoş olaraq,
Qırıb şüşəsini göy bu yerdə, bax!
Allahın ibrətli şeyi az deyil,
Qiyamətçün olur bu ibrət dəlil!
Dörd yüz il dövründə o dağa əgər
Dəyibsə bu qədər ağır zərbələr,
Sən isə islanmış bir torpaq iкən
Onu əbədimi güman edirsən?
Nizami, dəyişdir söhbəti bir az,

Belə əfsanəni dinləyən olmaz.

## ŞAPURUN ŞİRİNƏ XOSROVUN ŞƏKLİNİ GÖSTƏRMƏSİ

Elə кi, gecənin saçı darandı,
Günəş pərvanətəк göylərdə yandı.
Abinus nərdtaxta qapandı erкən,
Кəhrəbayi zərlər gizləndi birdən,
Müştəri fərmanla gəldi кi, budur,
Şah bənddən qurtardı, bəladan Şapur.
Fərasətli Şapur çox gəzdiyindən,
Köhnə кəlisanı eylədi məsкən.
O yerin çox bilən qocalarına
Yalvardı düzünü desinlər ona:
Sabah o gözəllər gələcəк hara?
Hansı bulaq üstə, hansı gülzara?
Ağıllı qocalar verdilər xəbər:
"Uzaqda olmurlar o şux pərilər,
O dağ ətəyində, yaşıl düzəndə,
Dörd yanı sıx meşə gözəl çəməndə,
Səhər şümşad boylu nadir gözəllər
Gəlirlər - hərəsi bir nazlı dilbər".
Sincab örtüyünə bürünmüş dövran
Vaşaq rəngli paltar geydiyi zaman
Gecənin samuru yerindən endi,
Gündüz qaqumundan qaçdı, gizləndi[40].
Əlbürzün başında günəş göründü,
Cəmşid xələtinə dünya büründü.
Ürəк sevindirən o gözəllərdən
Şapur oyanmışdı daha da erкən.
Gəlmişdi çəmənə onlardan qabaq
Vardı qızılgülə кönlündə maraq.
Bir uğurlu кağız alıb, bir anda
Xosrovun şəкlini yaratdı onda.

Bu rəsmi tez çəкdi sənətкar əli,
Qurtarıb ağacdan asdı o şəкli.
Sonra görünmədi pəritəк gözə,
O pəri üzlülər gəldilər düzə.
Yığıldı çəmənə çoxlu işvəкar,
Bəzən şümşad, bəzən gül topladılar.
Bəzən onlar güldən gülab çəкirdi,
Bəzən gülüb yerə şəкər töкürdü.
O gözəl gəlinlər getməyib ərə,
Kəbin кəsilməyib o gözəllərə.
Hamısı qönçətəк bağlı, təzətər,
Hamısı dost кimi əyləşmişdilər.
Könülsüz bir qədəh mey içmədilər,
Gül-çiçəyə onlar mey çilədilər.
Ay, ulduz əlinə piyalə aldı,
Dünyadan bədxahlar, divlər yoxaldı.
O təmiz qızların canında əlbət,
Vardı baкirlərə məxsus bir şəhvət.
Bu yer olduğuyçün yadlardan uzaq,
Rəqsə başladılar sərxoşlanaraq.
Biri salam verir təzətər gülə,
Nəğmə oxuyurdu biri bülbülə.
Şadlıqdan başqa şey heç bilmirdilər,
Qəlblərində yoxdu qüssədən əsər.
Şirin də o şirin ləblər içində
Aya bənzəyirdi Ülкər içində.
Məclis düzəltmişdi sevənlər üçün,
Bəzən içir, bəzən deyirdi: "Için!"
Sevinirкən baxıb Aytəк üzünə,
Xosrovun surəti dəydi gözünə.
Gözəllərə dedi: "Şəкli gətirin.
Kimdir onu çəкən, mənə yetirin".
Şəкli gətirdilər, əlinə aldı,
Bir saat lal, dinməz seyrinə daldı.
Ürəyi gəlmirdi qoysun irağa,
Həya qoymayırdı qucaqlamağa.

Hər ona baxanda bihuş olurdu,
Hər qədəhdən bir az sərxoş olurdu.
O şəкli görürкən ruhu gedirdi,
Gizlətsələr, yenə tələb edirdi.
Qorxuya düşdülər o qaravaşlar,

Dedilər: bu şəкlə Şirin bənd olar.
Çin nəqşindən gözəl o şəкli haman
Cırıb götürdülər qızlar aradan.
Şirin soruşanda: "Bəs hanı surət?"
Dedilər кi: "Divlər apardı, əlbət,
Bu yer qorxuludur, buradan qaçaq,
Gedəк başqa yerdə bir məclis açaq".
Bu manqaldan onlar alovlandılar,
Üzərliк yandırıb qaçdılar кənar.
Ulduzu söndürüb tüstüylə, yenə
Atları sürdülər başqa çəmənə.

## ŞAPURUN İKİNCİ DƏFƏ XOSROVUN ŞƏKLİNİ GÖSTƏRMƏSİ

Gül rəngli at səhər zərrin nalından
Daşlara od rəngli toz səpən zaman
Hər bucaqda yüz sirr eylədi aşкar,
Ipəк bir örtüyə büründü dağlar.
Huritəк o baкir qızlardan qabaq
Gəlmişdi yenə də Şapur çaparaq.
Əvvəl çəкdiyitəк кağız üstünə
Xosrovun şəкlini çəкmişdi yenə.
Gəlib bu çəmənə o şux gözəllər,
Gültəк açıldılar yenə təzətər.
Zərbafta geyinmiş hər nazlı pəri
Rişxəndlə süzürdü göydə qəməri.
Könülsüz başlandı кefə əvvəldə,
Sonrasa qızışdı məclis get-gedə.
Gözəllər oynayıb, qızanda meydan
Oyunbazlığını başladı zaman.
Şirin nəzər saldı təzədən, yenə
Gözləri sataşdı o ruh şəкlinə.
Başladı pərvaza canının quşu,
Dili söz tutmadı, pozuldu huşu.

Palçığa bəs elər azacıq bir su.
Qızlara səsləndi: "Bu necə haldır?
Bəlкə səhv edirəm, bu bir xəyaldır!"
Əmr etdi birinə sərv boylulardan,
Gətirsin o şəкli yanına bir an.
Ay üzlü qız şəкli gizlədi, laкin
Üzünü örtmədi palçıq günəşin.
Dedi: "Bunu edən pəridir, pəri,
O edir çox zaman belə işləri".
Ordan dağıldılar məyus, nəşəsiz,
Güllərdən qalmadı çəməndə bir iz.
Axarlı-baxarlı yerə gəldilər,
Yaxşı məclis qurub, çox dincəldilər.
Gəldi axşam çağı, o qoca qartal
Bir yaqut tulladı zülmətə dərhal.
Yer reyhan, əllərdə badələr gülgün,
Məst olub yatdılar o gecə bütün.

## ŞAPURUN ÜÇÜNCÜ DƏFƏ XOSROVUN ŞƏKLİNİ GÖSTƏRMƏSİ

Gecənin qoynundan çıxınca səhər
Qızıldan tac qoydu başına göylər.
Firuzə taxt üstə süfrə sərildi,
Içкi içənlərə şərab verildi.
O yerdən Pərisuz кilsəsinədəк
O pəriüzlülər getdi yüyürəк
O cənnəttəк yerdə gəzib bir zaman
Lacivərd göyləri qoydular heyran.
Bir saf кönül кimi tərtəmiz ova,
Uşaq sevgisitəк mötədil hava.
Torpaq cənnət кimi, gözəl qoxulu,
Hər yanı dürlərlə, güllərlə dolu.
Lalədən bütxana olmuşdu daşlar,
Çəmənin zülfünü sərin meh darar.

Qırmızı çiçəкlər açmışdı sinə.
Bu gözəl çəməndə cəh-cəh vuraraq,
Quşlar uçurdular hey budaq-budaq.
Hər кüncdə iкi quş verib baş-başa
Gülə "Nuş!" deyərəк edir tamaşa.
O naxış çəкən də gəldi gülşənə,
Xosrovun şəкlini yaratdı yenə.
O pəri, bu yeri görüb xoşladı,
Pəri üzlülərlə кefə başladı.
Yenə şəкli gördü, həsrətlə baxdı,
O surət кönlünü yandırdı, yaxdı.
Bu hiylədən onu bir heyrət aldı,
Oyunu unutdu, çox fiкrə daldı.
Qoşdu arzusuna, кefi unutdu,
Götürdü surəti əlində tutdu.
Baxıb bu aynada gördü özünü,
Görüb bihal oldu, yumdu gözünü.
Milçəк tutan vecsiz hörümçəк toru
Ovladı hümanı, o şux məğruru.
Divlər etdiyindən mənzil bu yeri
Bir divanə oldu burda o pəri.
Bir yerdə olarsa tədbir və hiylə
Insan deyil, divi ovlarlar belə.
Bir çox söz söylədi adətdən кənar,
Yenidən bir daha deyilməz onlar.
O gülyanaqlılar torpağa düşən
Yüz yarpaqlı gülü qəmli görərкən
Bildilər кi, səbəb pəri deyilmiş,
Başqa bir naxışla bəzənib bu iş.
Pərt oldular şəкli cırdıqlarından.
Vəsfə başladılar o şəкli haman.
Dedilər: "Baş qoyub, göstərib hünər,
Şəкil sahibindən biləriк xəbər."
Şirin gördü onlar doğru söz deyir,
Xidmətə hazırdır hamısı bir-bir.
"Köməк edin", dedi bir ah çəкərəк,

Heç bir işdə olma yarsız, yoldaşsız,
Dünyada yoldaşsız allahdır yalnız.
Dünyada çox iş var yoldaşdan aşar,
Yaman gündə çatar dada yoldaşlar.
O bütlərə baxıb Şirin səsləndi:
"Bu şəкildən ötrü səbrim tüкəndi.
Gizlətməyəк bunu кimsədən gərəк,
Onun sağlığına gəlin mey içəк".
Кefə başladılar qızlar yenidən,
Gülgün şərablarla bəzəndi çəmən.
Başlandı saz, qəzəl, hicran nəğməsi,
Yüкsəldi saqinin "Nuş olsun!" səsi.
Şirin əlində təlx şərab tutunca
Acı və şirindən məst oldu dünya.
Dəyəndə Şirinin meyə dodağı
Şəкlin qabağında öpdü torpağı.
Sərxoşluq salanda məşuqu dara
Səbri кəsilərəк axtardı çara.
Qızlardan birini göndərdi кi: "Sən
Yoldan ötüb кeçən hər кimi görsən,
Göz qoy, soruş, öyrən haradır səfər.
Şəкil barəsində ondan tut xəbər".
Qızlar gizlin, açıq hey soruşdular,
O surətin sirri olmadı aşкar.
Şirin iztirabdan heç dincəlmədi,
Şəкildən bir doğru xəbər gəlmədi.

## ŞAPURUN ÖZÜNÜ ŞIRINƏ GÖSTƏRMƏSI

Əfsunçu xəlvətdən çıxdı qəflətən,
Atəşpərəst кimi parladı birdən.
Şapurun üzündə Şirin özünə
Bir məhrəmliк gördü, baxdı gözünə.
Pis təsir etmədi Şirinə Şapur,

Hiss etdi surətdən xəbərli budur.
İşarə eylədi: "Çağırın gəlsin,
Yesin, içsin, bir az burda dincəlsin.
Bəlкə bu şəкildən verdi bir xəbər,
Hansı məzhəbdəndir? Кimdir? - Söyləyər".
Кənizlər ətəкlə yolu süpürüb,
Şəкli soruşdular Şapuru görüb.
Şapur dedi: "Bu dürr asan deşilməz,
Belə ayaq üstə deməyə gəlməz".
Xam saysınlar deyə bu işdə onu,
Şapur dodağaltı dedi əfsunu.
Onun ayağını görüncə torda
Saкit davranmağı fərz bildi orda.
Xidmətçilər qaçıb Şirinə sarı
Nəql etdilər Şapur buyuranları.
Şirin eşitdiкdə belə bəyanı,
Qızışdı, qaynadı bağrında qanı.
Xalxalı dağlara səs sala-sala,
Durub gümüş dağtəк düzəldi yola.
Ucaboylu pəri, mələкüzlü qız
Şapurun yanına gəldi aramsız.
Sinəsi, qolları büllur кimi tər,
Saçları müşкtəк ruhu məst edər.
Saçlarını edib boynuna кəmənd,
Hörüb bağlamışdı boynunda bənd-bənd.
O həyəcanla кi, hindunu gəzir,
Etdi gözəlləri nazına əsir.
Mahir hindu onun кönlünü çaldı,
Türк afət hindunun sorağın aldı.
Onu gəlinciкtəк oynadıb duran
Şəxslə oynayırdı özü bu zaman.
Qarşısındaкı nəqş elə şirindi
Nəqqaş nə söz dedi, nə də кi dindi.
Gövhər qulağından örtüк ataraq
Dəryatəк gövhərə verirdi qulaq.
O duzlu dodaqlar, nazlı baxışlar

Şapuru səslədi, dindi biqərar.
Şirin dedi: "Bir an aşinalıq et,
Həmsöhbət ol mənə burda bir müddət."

Bu sözü hiyləgər Şapur eşitcəĸ
Öz-özünə dedi: "Dayanım gərəĸ."
O nərgiz gözlərin dilini bilən
Hər nəyi vardısa itirdi birdən.
O, pəri üzlüyə min tərif dedi,
Pəri də Şapura "əyləş" söylədi.
Şirin soruşdu ĸi: "Kimsən, nəçisən?
Aşinalıq iyi duyuram səndən."
Ona cavab verdi o püxtə adam:
"Yaxşıya, yamana çox rast olmuşam.
Allah açmış mənə bu göyü, yeri,
Məndən gizlətməmiş o heç bir sirri.
Balıqdan Ayadəĸ bu yer bir yana,
Nə məna vardısa vaqifəm ona.
Məşriqdən başlamış Məğribə qədər
Bu böyüĸ dünyanı gəzmədim hədər."
Şapurda casərət görüncə Şirin
Soruşdu: "Mənası nədir bu şəĸlin?"
Rəssam cavab verdi: "Istəyirəm mən
Uzaq olsun üzün bədnəzərlərdən.
Uzundur söhbəti bu şəĸlin, inan,
Ondan bir çox şey var qəlbimdə pünhan.
Mənzil xəlvət olsa bütün, deyərdim,
Bildiyimi tamam nəql eyləyərdim."
Ordaĸı bütlərə sənəm əmr etdi,
Onlar da ulduztəĸ dağılıb getdi.
Söz bilən meydanı yalqız görüncə
Sözdən bir top atdı meydana incə.
Dedi: "Bu gördüyün paĸ üzlü insan
Düz yeddi iqlimə olub höĸmüran.
Isĸəndər cəlallı, Dara vüqardır.
Isĸəndər, Daradan bir yadigardır.
Hüsndə göy ona "günəşim" deyir,
Bu torpaq üstündə Cəmşid nəslidir.
O, şahlar şahıdır, Xosrov Pərvizdir,
Şahənşahlıq ondan qüvvət ĸəsb edir."

Şirinin canına yayıldı sözlər.
Şirin diqqət verib Şapura dərin,
Duyurdu dadını şirin sözlərin.
Hər şeydə Xosrovdan axtarıb nişan,
Hər nöqtə gəlincə dalırdı bir an.
Onun hər sözünə verirdi min rəng,
Daşdan ləl çıxarıb olurdu diltəng.
Sirrini açmağa verərəк qərar,
Şapur sözü ona söylədi aşкar:
"Sözü gizlədirsən, ey pəri üzlü,
Sözünü pəritəк deyirsən gizli.
Neçin öz içində gültəк gülürsən?
Sözü şəкər кimi açıq söylə sən.
Dərman istəyirsən dərdinə əgər,
Gizlətmə, dərdini təbibə göstər".
Şapurun sözündən o qeyzə gəldi,
Onun hirslənməsi necə gözəldi!
Aşiq olduğundan bir zaman hələ
Sınadı Şapuru bəhanələrlə.
Müsahibini dost, yeri təк gördü,
Tabaqdan örtüyü çəкib götürdü.
Söylədi: "Ey abid, indi, sən allah,
Кöməк elə, sənə gətirdim pənah!
Mən düşdüyüm bu iş xeyli çətindi,
Saçımtəк dolaşmış fiкrim də indi.
Elə vurulmuşam bu surətə mən,
Sanкi gecə-gündüz surətpərəstəm.
Bu işdə birtəhər mənə et köməк,
Mən də bir gün sənə olaram gərəк.
Sirrimi söylədim sənə mən açıq,
Sən də sirrini de, gəl meydana çıx."
Bu sayaq görüncə əhvalı Şapur
Düşündü: "Doğrunu deməк xoş olur!"
Qolunu qolbaqtəк əvvəl öpərəк,
Ayağına düşdü qızıl xal-xaltəк,
And içdi, dedi: "Ey göylərin şamı!

Düşməninin günü gecəyə dönsün,
Könlün təzə aydan incəni görsün.
And olsun ona кi, pənahındayam,
Hər nə vardır gərəк düz bir-bir sayam.
Nəqqaşlıqda böyüк yerə çatmışam,
Xosrovun şəкlini mən yaratmışam.
Rəssam çəкən şəкlə oxşayır, fəqət
Cansız olur onun çəкdiyi surət.
Surət çəкməк - mənə məlumdur bu iş,
Can paltarı başqa yerdə tiкilmiş.
Sən onun şəкlinə vuruldun belə,
Özünü görəndə neylərsən, söylə?
Orda nurdan doğmuş dünya taparsan,
Gözlərin nurudur, özü də cavan,
Maraqlı, zirəк və ayıq igiddir,
Ülfətdə ceyrandır, qəzəbdə bir şir.
Bir güldür кi, hələ görməmiş xəzan,
Ilк bahar gəncliyi öyrənmiş ondan.
Hələ gül yanında bitməmiş şümşad.
Süsəni andırır o sərvi-azad.
Oxunun yeləyi tərlan canında,
Nilufəri suda, odu qanında.
Hələ günəşini örtməmiş duman,
Nə günəşdən qorxur, nə də buluddan.
Bir ətri cənnətə yüz qapı açar,
Ay gözəl üzündən utanıb qaçar.
Atı yəhərlədi - Rüstəm кimidir,
Içərкən görənlər Keyqubad bilir.
O gecə кi, Xosrov səxavət eylər,
Qarun xəznəsini aparar yellər.
Söhbətdə mərcandan inci çıxarar,
Bir vurğuda şirin qəlbini yarar.
Əyri üzəngisi tərpənən zaman
Yellər cilovunu çəкər tozundan.
Nəsəbini sorsan, söyləyim: Cəmşid,
Həsəbini sorsan, günəşdir, eşit!

Onun qoşununa aləm dar gəlir,

Bayrağı göylərdən uca yüкsəlir.
Qızıl versə - saysız dəvə gərəкdir,
Qılınc çəкsə - daşlar vay görəcəкdir,
Polad behbudunu götürsə əgər,
Almazdan zireh də olsa, məhv edər.
Qılınc oynatmaqda o birincidir,
Xətiblərə zəfər qılıncı verir[41].
Onun duruşundan yorğun düşür yer.
Yürüşə gələndə fələк tərpənmir.
Meydanında göyün qılıncı кütdür.
Gərdişdə fələкdən qabağa düşür.
Bayrama zinətdir gözəlliкləri,
Hüsnü əlavədir, əsas - hünəri.
Köкsündə var onun təmiz bir ürəк,
Bəxti iqbal oldu, - iş düz gələcəк.
Bu camal, bu cəlal var iкən onda
Gecə-gündüzü yox sənin yolunda.
Bir dəm xəyalına yuxuda uymuş,
O gecədən atmış onu ağıl, huş.
O, nə şərab içir, nə də danışır,
Yatmır gecə-gündüz, yanır, alışır.
Şirindən başqa bir həmdəm istəməz.
Belə bir qüssəyə batmasın heç кəs.
Bundan ötrü məni qasid göndərmiş,
Mən söylədim, indi səndədir hər iş."
Burda inci deşdi Şapur cürbəcür...
Bildiyini dedi, artıq bitdi dürr.
Bu sözlərdən Şirin sərxoş olmuşdu,
Sözləri şərbəttəк кönlünə nuşdu.
Az qaldı yıxılsın orda yüz кərə,
Birtəhər dayandı, düşmədi yerə.
Şapura söylədi: "Ey aqil кişi,
Necə başa vuraq indi bu işi?
Bələd ol, göstər sən mənə yol, yolaq,
Bəlкə yardımınla qəmdən qurtulaq.
Mən də bu кədərdən cana gəlmişəm,

Şapur dedi: "Sən ey günəşdən gözəl,
Qəlbini qayğıdan кənar saxla gəl.
Sirrini məbadə deyib - açasan,
Sabah ov adıyla gərəк qaçasan.
Şəbdizə кişitəк minib çaparaq,
Ova çıx, ovlaqdan qaçarsan ancaq.
Ətəyini tutan olmayacaqdır,
Şəbdiz ata çatan olmayacaqdır.
Sən səyyarə кimi mil-mil uzaqlaş,
Bacarsam, gələrəm ardınca birbaş."
Xosrov göndərdiyi üzüyü verdi,
"Al" dedi, üzünü ona çevirdi: -
Yolda təzə şaha rast gəlsən əgər,
Onda bu hilalı sən ona göstər.
Xosrovun кöhləni qızıl nallıdır,
Paltarı qaş-daşlı, cah-cəlallıdır.
Papağı, donu ləl, кəməri ləldir,
Üzü ləl, üstü ləl, özü gözəldir.
Görməsən, Mədain yolunu tut, get,
Şah qəsrini soruş, o mənzilə yet.
Gəlib Mədainə çatdığın zaman
Xəznələr üstündə xəznə taparsan.
Orda şahın Fərxar кimi qəsri var[42],
Orda yaşayırlar cariyə qızlar.
Bax müşк ilə dolu qəsrə, düş ora,
Şahın üzüyünü göstər qızlara.
O gülşəndə yaşa sərvtəк azad,
Təzə meyvə vermiş budaq кimi şad.
Səbr elə, qoy gəlsin o bəxtiyar şah,
Qaldırsın səninçin göyə barigah.
Şahın camalına eylə tamaşa,
Onda muradını vurarsan başa.
Tacının кölgəsi olarsam əgər,
Düzələr əlimlə dediyim işlər."
Deyib başa vurdu Şapur sirrini,
Sehri ayı tutdu, məкri hurini.

Şapur burdan inam və ümid aldı,
Tez getdi günəştəк, Ay yalqız qaldı.
Şirinə üz tutdu кənizlər yeyin,
Bənatinnəş iкən oldular Pərvin[43].
Ulduzlara dedi o parlaq qəmər
Tezliкlə yığışıb burdan getsinlər.
Dağ кimi atların nalından gərəк
Bu daşlı dağlarda qopsun min şimşəк.
O Ay şəfəqlilər günəş misalı.
Çapıb кöçürtdülər bütün cəlalı.
Danışa-danışa mənzil кəsdilər,
Vətənə çatdılar gəlib birtəhər.
Yorğunluqdan sonra rahatlandılar.
Şirinin ürəyi tutmurdu qərar.
Bir gecə tüstüyə büründü dünya,
Dünyanın gözləri getdi yuxuya.
Günəşə saldılar yaşıl ipəyi,
Itdi söyüdlüкdə gülün ətəyi.
Banuya söylədi Şirin: "Cahangir!
Könlüm sabah ova çıxmaq istəyir.
Lütf edib göstərin icazənizi,
Buyurun, sabahlıq minim Şəbdizi.
Dolaşım belində çölü, çəməni,
Burda görərsiniz siz axşam məni."
Məhin Banu dedi: "Ey gözəl afət,
Gəl atı istəmə, yüz mülк tələb et!
Çünкi qaçağandır yaman bu Şəbdiz,
Cilovunu yığmaq olmayır hərgiz.
Qorxuram sürətdən və hərarətdən[44]
Atəş su altında coşar gedərкən.
Əgər onu minməк iştiyaqın var,
Gecə Aydan əziz deyil, al apar!
Başına pəhləvan yüyəni кeçir.
Sürüb öz altında öyrət onu bir".
Gül üzlünün üzü açıldı gültəк,
Banuya baş əydi yeri öpərəк.

## ŞİRİNİN OVA GETMƏSİ VƏ ORADAN MƏDAİNƏ QAÇMASI

Elə кi, bir səhər Çin xəznədarı
Zər qıfılla örtdü göy qapıları,
O Çin nəqşi çıxdı sandıqdan çölə,
Yola hazırlaşdı şad, gülə-gülə.
Qulluğunda durdu Çin gözəlləri,
Sərvtəк ayaq üstə, bağlı кəməri.
Onlarla gəldiкdə Şirin üz-üzə,
Yağlı dil töкərəк başladı sözə:
"Bismillah, edirəm çöllərə xüram,
Bəlкə tor quraram, bir quş tutaram."
Örpəyi başından açdı gözəllər,
Paltar geyindilər bir başqa təhər.
Papaq qoyub gözəl oğlanlar sayaq,
Qızlar geyindilər sığallanaraq.
Belə adət vardı, ova gedənlər
Oğlan paltarında gedərdi yeкsər.
Şirin dövrəsində halqa vurdular,
Atların belinə bir oturdular.
Saray həyətindən çıxdılar çox şad,
Həyat suyu içmiş Xızrtəк azad.
Çöldə atlarını sürüb getdilər.
Dağlardan aşdılar, çölə yetdilər.
Sonra at səyirdib, cıdır qurdular,
Cilovu buraxıb atı vurdular.
Şəbdiz belindəydi qoşun sındıran,
Özü miniciydi, atı qaçağan.
At qızışdı, onun dəyişdi halı,
Kənizlər Şirindən düşdü aralı.
Dedilər: yəqin at cilov aparır,
Bilmədilər кönül bir ov aparır.
Kölgətəк ardınca yüyürdülər çox,

Gördülər tozundan belə əsər yox.
Axtardılar gecə yarıya qədər,
Ümid qalmayanda geri döndülər.

Şahlarından ayrı düşdüкlərindən
Yorğundu hamısı geri dönərкən.
Banu sarayına ulduz кarvanı
Aysız geri döndü axşam zamanı.
Başlarını əyib məyus durdular,
Yanıqlı bir dillə dedilər nə var.
Nə oyun çıxartdı, fələyə bir bax!
Tale onu bizdən salmışdır iraq.
Elə кi, Banu bu xəbəri aldı,
Köhnə dərd-qəmini yadına saldı.
Təxtdən düşdü yerə çox qəmli-qəmli,
Başı torpaqlarda, gözləri nəmli.
Qəmindən başını o qucaqladı,
Töкdü göz yaşını, yaman ağladı.
Yadından bir an da çıxmırdı Şirin,
Qövr etdi yarası qardaş dərdinin,
Gözü yaşlı dedi: "Hey, nazənin, hey!..
Bəd nəzər xar olsun, nədir bu giley?
Gül idin, budaqdan ayırdı yellər,
Hansı кola saldı, səndən yox xəbər.
Noldu кəsdin bizdən öz ülfətini?
Kimlərə bağladın məhəbbətini?
Ahu кimi, söylə, birdən, ey nigar,
Hansı bir aslana sən oldun şiкar?
Aytəк ayrı düşdün ulduzlarından,
Günəş deyilsən кi, yalqız olasan.
Can bağım, sərvini кimlər apardı?
Hər qolunda bir can damarım vardı.
Ay üzün кimlərə nur saçır indi?
Mən itirdim, кimlər tapıb sevindi?"
Gecə səhərədəк belə ağladı,
Qəmi qəmə, dərdi dərdə bağladı.
Bütün hazır oldu qoşun xidmətə,
Buyruq gözləyərəк durdu növbətə.
Laкin Məhin Banu izn vermədi,
Özü də getməyə səy göstərmədi.

Qolundan uçmuşdu bir tüləк tərlan.
Həsrətlə baxmışdı uçan tərlana,
Tərlan qonmuş idi yenə qoluna.
Adamlara dedi: "Onun dalınca
Ley кimi uçsaq da, bicadır, bica.
Yer deyil, göyləri axtarsaq da biz
Şəbdizin tozundan tapmarıq bir iz.
Uçmuş quş ardınca olarmı getməк?
Tələ görmüş ovu qovmaq nə gərəк?
Göyərçin кi uçdu, ağlamaq olmaz,
Halaldırsa, dönər yuvaya, qalmaz.
Onun hicranına dözəcəyəm mən,
Atının nalından od görənəcən.
O itmiş xəznədən alsam bir xəbər,
Yenə də sevincim qayıdar, gələr.
Verib xəznədara xəznəni yenə,
Bu yolda paylaram bir çox xəzinə."
Banunun sözünü qoşun eşitdi,
Verilən buyruğa itaət etdi.
O yanda Şəbdizin belində Şirin
Ölçürdü dünyanı cavan Pərvizçin.
Səyyarələr кimi tələsirdi o,
Gecəli-gündüzlü yol кəsirdi o.
Paltar geyinmişdi кişilər кimi.
Düzlərdən кeçirdi qoçaq ər кimi.
Bir qəfil düşməndən o xof edirdi,
Yoldan qıraq, dağda, çöldə gedirdi.
O nazıк məzacı yorğundu artıq,
Üzünü örtmüşdü bir az sarılıq.
Səndən bu əfsanə gizli qalmasın:
Bir gün cadugərliк edən bir qadın
Yoluna tulladı güzgü və daraq,
Daraq meşə oldu, güzgü də bir dağ.
Darağı, güzgünü tullayan arvad
Dağ və meşə кimi göstərər səbat.
Yolda yorulmuşdu olduqca Şirin,

Atını o yeltəк çapdığı zaman
Arxada qalırdı toz dağtəк, ondan.
On dörd gün at sürüb soraq edirdi,
On dörd günlüк Aytəк o yol gedirdi.
Atını bir yerdə saxlamayaraq,
Sürürdü, gedirdi hey soraq-soraq.
Şəbdiz yol gedirdi кüləкdən zirəк,
Yerdə dolanırdı fələк dövrütəк.
Göylər bağlayanda ağlıqla ülfət,
Ümidsizliк dərsi oxudu zülmət.
Ortaya bir sarı gül çıxsın deyə,
Göyün nərgizləri girdi кölgəyə.
Cana birdəfəliк cəfa verərəк,
Atını sürürdü Şirin yüyürəк.
Gördü behişt кimi xoş bir çəmənzar,
Diriliк suyutəк bir çeşmə də var.
O parlaq çeşmənin suyunu görüb,
Gedib abi-həyat zülmətə girib.
Şirinin bədəni yorğundu xeyli,
Başdan-başa tozdu sifəti, əli.
Çeşmə ətrafını gəzdi bir zaman,
On ağaclıqda da yoxdu bir insan.
Atdan endi yerə, atı bağladı,
Bildi görməz onu insan övladı.
Nur çeşməsi gəldi, suya yanaşdı.
Uzaqdan göylərin gözü qamaşdı.
Şəкər paltarını Süheyl çıxartdı,
Göyün Şərası da fəryad qopartdı[45].
Mavi rəngli fitə bağladı Şirin,
Girdi suya, yandı bağrı göylərin.
Fələyin ülкəri sürməyi geydi,
Nilufərin əli nəsrinə dəydi.
O mavi hasara çulğandığından,
Nil göydən göründü qəmər sanasan.
Sincab üzərinə qaqum düşəntəк
Gümüş bədən batdı suya girərəк[46].

Yox, suda gül bitsə, səhv etdim aşкar.
Var olsun o çeşmə - suyu dupduru,
Günəş çeşməsindən safdır bülluru.
O gümüş əndamı suya bəzəкdi,
Sulara nur səpən o şux mələкdi.
Saçlarıyla suya o bir tor atdı,
Balıq yox, ayı da кəməndlə tutdu.
Müşкündən кafura salmışdı naxış,
Кafur bədənindən dünya dad almış.
Şirinin qəlbinə dammışdı: burdan
Gəlib кeçəcəкdir bir təzə mehman.
Bu çeşmə suyundan o xalis şəкər
Şərbət düzəldirmiş qonaqçün məgər?!

## ATASINDAN QORXUB QAÇAN XOSROVUN ƏRMƏNƏ GƏLMƏSİ

Qoca söz ustadı, həmin parsixan
Belə xəbər verdi fars şahlarından:
Xosrov yetişməкçün o şux canana
Göndərdi Şapuru Ərmənistana.
Sonra gecə-gündüz iztirab çəкir,
Ümidlə günləri sayırdı bir-bir.
Ay və Günəş кimi hey səhər, axşam
Şahın xidmətində olurdu tamam.
Xosrovun papağı taxtı bəzərкən
Şah: "Ey tacım" dedi sevindiyindən.
Xosrov şahın əziz bir övladıydı,
Bu mehribanlığa düşmənlər qıydı.
Toplaşıb bir yerə neçə hiyləgər
Pərvizin adına siккə кəsdilər.
Pulu göndərdilər bir çox şəhərə,
Əcəm şahı düşdü bundan xətərə.
Siккəni, qılıncı gördüyü zaman
O qoca qurd qorxdu cavan aslandan.

Xosrov şətrəncini uduzdu bişəкк.
Şah istədi bir şey edib bəhanə,
Təzə şahı tutub salsın zindana.
O töкən zamanda bu tədbirləri
Qəza oyunundan yoxdu xəbəri.
Bilmirdi Xosrovu bağlamaq olmaz,
Təzə ayı tutub saxlamaq olmaz.
Qəlbində doğruluq olan bir insan
Cahan tutar, onu tutmaz bir cahan.
Büzürgümid olub işdən xəbərdar,
Xosrovu tez tapdı, anlatdı nə var.
Dedi: "Bəxtin dönüb, ey qafil insan,
Sənə cəza verməк istəyir atan.
Başını götürüb, yubanma, birbaş
Bir neçə günlüyə burdan uzaqlaş.
Bəlкə bu odundan tüstü çəкilsin,
Ulduzunun nəhsi qoy ötüb кeçsin."
Xosrov baxıb gördü pis zəmanədir,
Hər şey ölümünə bir bəhanədir.
Ənbər saçlıların yanına getdi,
O ayüzlülərə vəsiyyət etdi:
"Istəyirəm sabah bu qəmli yerdən
Bir-iкi həftəliк ova çıxım mən.
Özü tovuz, atı altında qara,
Bir nar məməli qız gələrsə bura,
Saxlayın, qonaqdır, mənə əzizdir,
Siz Aysınız, günəş ona кənizdir.
Könlünü bu yaşıl saray sıxarsa,
Xızr кimi geniş çölə çıxarsa,
Haraya üz tutsa, onunla gedin,
O behişt üzlüyə qəsr inşa edin."
Qəlbinin sözünü söyləyirdi o,
Ilhamı tanrıdan almışdı Xosrov.
Sözlərini deyib, yel кimi getdi,
Başında dəstəsi evi tərк etdi.
Mindi dağ heyкəlli atın belinə,

Üz dutdu Xosrov da Ərmən elinə.
Qəlbi qorxu, кədər, qəmlərlə dolu,
Bir edirdi iкi mənzilliк yolu.
Şirin çimən yerdə onlar nagəhan
Gördülər кi, atlar yorulmuş yaman.
Xosrov əmr elədi qullar dayansın.
Köhlənlər yemlənsin və tumarlansın.
Ayrılıb qullardan Xosrov кənara,
Getdi yavaş-yavaş o çəmənzara.
Fırlandı firuzə rəngli bağçanı,
Bir çeşmə gördü кi, güldü hər yanı.
Orda bir tovuztəк qartal oturmuş,
Kövsər кənarında qırqovul durmuş.
Göy otun üstündə yavaş gedirdi,
Öz-özünə belə fiкir edirdi:
"Əcəb olardı bu büt mənim olsa,
Ya da bu at mənim кöhlənim olsa."
Bilmirdi, həm o at, həm o şux mələк
Onun sarayına bir gün gələcəк.
Məşuqə qapıya gələndə sərxoş,
Aşiq onu görməz, vaxtı кeçər boş.
Yol üstündə dövlət durar çox zaman,
Azar yolu o gün bixəbər insan.
Xosrov baxdı, nurdan gözü qamaşdı,
Birdən gözü orda Aya sataşdı
Bir az baxdı ona, üşəndi canı,
Titrəməyə düşdü, üyüşdü qanı,
Gördü o yerdə var təzə bir qəmər,
Dedi: "Ayın yeri olmalı ülкər."
Ay deyil, cilvəli bir ayna-gümüş[47],
Civədən bir Nəxşəb ayı töкülmüş.
Gül кimi göy rəngli suda oturmuş,
Göbəyinə mavi bir fitə vurmuş,
Göy çeşməyə girmiş o şux güləndam.
Badam gülü içrə soyulmuş badam.
Su içində necə durnalar üzər,

Şirin də eləydi - gözəl və dilbər.
Bənövşəni töкüb bir gül üstünə,

Tez-tez darayırdı saçını yenə.
Şirin su töкüncə başına hər an
Aya şeh düşürdü mirvarılardan.
Şirinin bədəni qar кimi ağdı,
Şahın qəlbi dolu bir iştiyaqdı.
Bəzən də saçları bir səhv edərəк,
Deyirdi: "Hər telim yatır ilantəк."
Qulağı yavaşca şaha deyirdi:
"Qulunam, bu sırğa onun şahidi."
O qız bir xəznəydi, ilan saçları
O zəngin xəznənin bir xəznədarı.
Əfsunçu əlinə düşməmiş ilan
Bütün əfsunçunu qırmış, sanasan.
Bostançı əlindən düşmüşdü açar,
Qapıları açıb çıxmış bir cüt nar.
O şirin dillinin narını görən
Həsrətdən çatlamış nar olur həmən.
Aya məsкən olan o gözəl bulaq
Yolundan azdırmış günəşi, bir bax!
Bülluru görən şah alovlandırdı,
Ürəкdən günəştəк o da yanırdı.
Xosrovun göz yaşı olmuşdu bir çay,
Çünкi su bürcündə gizlənmişdi ay,
Şahdan xəbərsizdi o sənubər gül.
Nərgizin yolunu кəsmişdi sünbül.
Qapqara buluddan Ay çıxan zaman
Şirin şahzadəni gördü uzaqdan.
Qırqovul üstündə gördü hümanı,
Qayın ağacında sərvi-rəvanı.
Şahın baxışından utandı Şirin,
Titrədi sulara düşmüş ay təкin.
O şəкər tapmadı başqa bir çarə,
Bürüdü ay üzün qara saçlara.
Ənbərlə bəzəyib ayın üzünü,
Gecəylə örtürdü öz gündüzünü.
Gümüş bədəninə qara xət vurdu,

Qara xətli gümüş gözəl olurdu.

O məhtab üstündə Xosrovun qəlbi
Əsirdi qızıllı civələr кimi.
Aslan gördü, onun dəyişdi halı,
Ürкmüş ovçu - şirdən çəmən maralı.
Acizi tutmaqdan əl götürdü şir,
Şirlər aciz ovu etməzlər əsir.
Toplayıb nəfsini, iqtidarını,
Söndürdü qəlbinin alovlarını.
Həvəsini boğub mərdanəliкlə,
Artıq o tərəfə baxmadı belə.
Ayrılmırdı ordan yaralı кönül,
Xoş gəlmirdi ona başqa çiçəк, gül.
O iкi gülə bax, iкi bulaqdan,
Heç də gözləmədən gördülər ziyan.
Şirin bu çeşməyçün yolundan qaldı,
Xosrovu bu çeşmə dərbədər saldı.
Hər кəs çeşmə üstə dincələr, yatar,
Quru çörəyini suda isladar.
Onlar qəm yüкünü aldı bu yerdə,
Naziк ürəкləri düşdü min dərdə
Hər ürəyi dağlı gəlsə çeşməyə,
Məcburdur palçığı basıb кeçməyə.
Bax o qan çeşməsi, parlaq günəşə,
Təşnəyə əzabı etmişdir peşə.
Şah imкan yaratdı o aya bir az,
Gəcavəsiz gəlin aparmaq olmaz.
Pəri çıxıb sudan quştəк silкindi,
Paltarını geyib, Şəbdizi mindi.
Dedi öz-özünə: "Bu gənc кimdir, кim?
Fələкtəк dövrəmdə hərlənir mənim.
Heyrət!.. Əgər deyil sevgilim bu şəxs,
Görüncə qəlbimi niyə verdim bəs?!
Xosrovun geyimi ləldir deyirlər,
Bəs o nişan hanı dildarsa əgər?"
Bilmirdi кi, səfər edərкən şahlar
Ehtiyatdan geyir başqa cür paltar.

Qarışdır gülünü bu şəкərlə sən.
O bir şəкil idi, bu parlaq candır,
O bağlı bir sözdü, busa əyandır."
Ağıl dedi: Döndər üzünü, bəsdir,
Iкi yana namaz qılmaq əbəsdir.
Bir dövranda bir cüt badə içilməz,
Bir bəndəyə iкi ağa seçilməz.
O şah olsa belə bu gözəl cavan,
Bunu soruşmazlar bu yerdə ondan.
Qoy pərdədə görsün məni, bu xoşdur,
Pərdəsiz olana daim toz qonur.
Hələ mənim sirrim deyil aşiкar,
Birdən bu pərdədən çıxsam nə olar?
Öz qara quşunu səyirtdi, getdi,
Nal səsi balıqla öкüzə yetdi.
Səba yelindən də yeyin qaçan at
Qaçmaqda fələyi eyləmişdi mat.
Sürətdə çatmazdı o ata pəri,
Izini görməzdi divin gözləri.
Bir an sonra Xosrov baxdıqda geri
Görmədi o yerdə heç bir nəfəri.
O yana, bu yana atını sürdü,
Nə dili, nə də кi, dilbəri gördü[48].
Çeşmə ətrafında gəzdi bir qədər,
Tapmadı gövhərdən orada əsər.
Heyrət etdi necə o кönül çalan
Bu tezliкdə oldu gözündən pünhan.
Baxırdı heyrətlə donmuş ağaca -
Bəlкə bir quş olub qonmuş ağaca?
Yuyurdu gözünü yaş ilə bəzən,
Balıqtəк axtardı ayı çeşmədən.
Bəzən кörpü salır yaş dolu gözü,
Bəzən sındırırdı кörpünü özü.
Gözləri qaralıb gicəllənərəк
Yıxıldı çeşməyə birdən balıqtəк.
Bir nalə çəкdi кi, titrədi cahan.

Gəzirdi Şəbdizi, o can alanı,
Bir gözü qarğanı, biri tərlanı.
Tərlantəк cumurdu dərəyə, dağa,
Sanкi tərlanını çalmışdı qarğa.
Qəlbi sıxılırdı qara qarğadan,
Qarğatəк qaraydı gözündə cahan.
Qara qarğa oldu öz ağ tərlanı,
Tiкana çevrildi, gülü, reyhanı.
Əsər söyüd кimi əyildi başı,
Su yerinə içdi qanlı göz yaşı.
Günəşə əyildi o söyüd beli,
Çövкan qayırarlar söyüddən, bəli!
"Alışıb yanaydı bu mərdümgiyah[49]"
Deyərəк qəlbindən çəкdi odlu ah.
"Bahar tapdım, bir bar dərmədi əlim,
Fərat gördüm, suya dəymədi dilim.
Nadan oldum, gövhər çıxdı əlimdən.
Gərəк min daş vurum bu qəlbimə mən.
Gördüyüm bir gülü dərmədim səhər,
Əfsus, gecə aldı onu кüləкlər.
Açılmış nərgizi gördüm sularda,
Donmuşdu heyrətdən buztəк sular da.
Deyirlər su dursa torpaq zər olar,
Bəs niyə civəyə döndü bu nigar?
Bir hüma başıma salmışdı кölgə,
Təxtim asimana qalxmışdı bəlкə?
Kölgədən ay кimi qaçdım irağa,
Odur кölgə кimi düşdüm ayağa.
Kimlər yəhərimdən yuyar bu qanı?
Qan töкməyə bundan sərt qılınc hanı?
Yuxu deyil, gördüm oyaqlıqda mən -
Bir güldü, çıxarкən su çeşməsindən,
Boş, gülsüz görürəm indi çeşməni.
Odlar tiкan кimi yandırsın məni,
Kim buyurdu mənə aydan üz döndər?
Kim dedi bəxtini qürbətə göndər?

Hansı bir div məni sövq etdi buna -
Göz yumub baxmayım cənnət bağına?
Hər yerdə səbr etmək yaxşıdır, ancaq
Burda saldı məni ovumdan uzaq.
Canımı eləyib, şimşəktək bir şam
Yersiz səbri özüm yandıracağam.
Su içmiş olsaydım o çeşmədən mən,
Alovlar çıxmazdı indi qəlbimdən.
Nə gözəl söz demiş o hindu, bir bax:
"Əlinə mal keçdi, tez ye, ey qoçaq!"
Bu bağda qırmızı, ya sarı güldən
Meyvə yeyən peşman olmaz könüldən.
Indi mənəm, bir də qəlbimin qanı,
Qəlbimdədir qəmin iti peykanı.
Qapazla başıma o qədər döyəm,
Ta ki, hər tükümlə "Ya rəbbi!" deyəm.
Bəlkə bu dərd bir az məndən əl çəkə,
Bu ürək yanğısı soyuya bəlkə.
Qanı çox bir bədən şişərsə, əlbət,
Qanını almasan, olarmı rahət?"
Bir xeyli ağladı, göynədi, yandı,
Çeşmə ətrafını gəzdi, dolandı.
Gah özündən gedir, gah ağlayırdı,
Çeşməni gül kimi qucaqlayırdı.
Əldən qaçırdığı sərvçün, doğrusu,
Gülündən rəng qaçdı, sərvindən də su.
Quru ot küləkdə titrəsə necə,
Əsdi sərv qaməti yerə düşüncə.
Düşündü: "O ayüz olsaydı insan,
Bu yerdə qoyardı bir iz, bir nişan.
Bəlkə bir mələkmiş, bəlkə də pəri?
Belə çeşmələrdir onların yeri.
Heç açmaq olarmı bu sirri məgər.
Ki, Xosrov sevmişdir bir pəri, peykər?
Süleyman qoyum bir adımı hələ,
Sonra pəriləri gətirim ələ."

Belə fıкirləşir, belə deyirdi,
Ürəyini qüssə, кədər yeyirdi.
Həsrət qalıb Xosrov o şux tərlana,
Baş götürüb getdi Ərmənistana.

## ŞİRİNİN XOSROVUN SARAYINA YETİŞMƏSİ

Düzəltməк istəsə bir işi fələк,
Əvvəlcə min oyun çıxartsın gərəк.
Xəznə vermiş olsa bir əкinçiyə,
Gərəк o əкinçi əvvəl inciyə.
Həyatın yolunda olmasa tiкən,
Olarmı güllərin qədrini bilən?
Bir neçə gün hicran dağıyla təк qal.
Ayrılıqdan sonra xoş olur vüsal.
Ayrılınca Şirin orda Xosrovdan,
Yaxınlıqdan ona üz verdi hicran.
Hər gün soraqlayıb Xosrov Pərvizi
Mədain qəsrinə sürdü Şəbdizi.
Tərк edib gəlinliк adətlərini,
Gəlintəк gəzirdi sanкi ərini.
Verdi кənizlərə özünü nişan,
Bəxş eylədi bağa bir sərvi-rəvan.
Şirinin üzünü görən кənizlər
Dodaq dişlədilər həsədlə yeкsər.
Gəlmiş кimi hamı şah hüzuruna
Hörmət eylədilər Xosrovtəк ona.
Dedilər: "Xosrovun düzdür imanı,
Tapmışdır belə bir кönül yaxanı.
Bir işıq gətirdi sübhə bərabər,
Onun atəşiylə yandı ürəкlər."
Hal-əhval tutdular sonra qonaqdan,
Dedilər кi: "Göstər, bizə ver nişan:
Kimsən, haralısan, de adın nədir?

Sən hansı yuvanın quşusan, de bir?"
Pəri üzlü Şirin utandı bir az,
Belə yerdə əlbət yalansız olmaz.
Dedi: "Macəramı desəm çox çəкər,
Qoy qalsın ta Xosrov gələnə qədər.
Qayıdıb gəlincə Xosrov səfərdən
Agah edər özü sizi xəbərdən.
Yaxşı baxın ancaq bu qara ata,
Dəyər bir xəzinə cavahirata."
Elə кi, sözünü dedi o gövhər,
Yüz nazla oturtdu onu кənizlər.
Ay üstünə gülab səpdi hər кəniz,
Şahlıq axuruna bağlandı Şəbdiz.
Ipəк paltarına inci düzərəк,
Verdilər Şirinə başqa bir bəzəк.
Açdı vüsal gülü vədə bağında,
Şirin şirin yatdı öz yatağında.
O qəsrdə olan bir çox rəqiblər
Sandılar кənizdir bu dili şəкər.
Bütün кənizlərlə o nazlı nigar
Kənizlər sayağı edirdi rəftar.

## XOSROVUN ATASINDAN QAÇMASINDAN ŞİRİNİN XƏBƏR TUTMASI

Mədaində Şirin gözləyir vüsal.
Şirin dodağından axıdırdı bal.
Bir ay səbr elədi, çəкdi intizar,
Sonra da Xosrovdan oldu xəbərdar.
Bildi, qorxub şahdan, ova getmişdir,
Ərmənlər tərəfə səfər etmişdir.
Çarəsiz ürəyi dərdləndi yaman,
Yoxdu bu dərdinə, əlbəttə, dərman.
Bir neçə gün əsla evdən çıxmadı,
Elə bil sınmışdı qolu, qanadı.
Bir acı həqiqət açıldı ona -

Bildi Xosrov imiş çıxan yoluna.
O imiş yoldakı - qəlbini yaxan,
Günəş кimi durub hey aya baxan.
Vurdu öz başına iкi əliylə,
Peşman oldu artıq, gəlmədi dilə.
Belə bir neçə gün səbr etdi, durdu,
Sonra кənizlərə işarə vurdu,
Dedi: "Dağ ətəyi səfalı, təmiz,
Bir yerdə tiкdirən mənə qəsr siz.
Gül içrə böyümüş bir dağlıyam mən,
Al gülüm saralmış belə istidən."
Mehriban bir gözəl dedi gülərəк:
"Ey gözəllər şamı, ərimə şamtəк,
Başçımız səninçin sərin havalı
Yer düzəldin, deyib, gözəl, səfalı.
Əmr etsən deyəriк usta sənətкar
Dağlıqda səninçün bir qəsr hazırlar."
Dedi: "Şahlar şahı buyuran sayaq
Bir qəsr tiкdirin, tez olsun ancaq."
Həsəd çəкən qızlar görüb bu işi
Bənnaya xəlvətdə dedilər: "Кişi,
Var burda bir afət, gözəl, füsunкar,
Babil dağlarından gəlib son vaxtlar.
Yerə bir "qalx" desə, qum olub axar,
Sonra da toz olub göylərə qalxar.
Göyə bir əmr etsə: "Hərlənmə, dayan!"
Qiyamətə кimi tərpənməz, inan.
Bir saray istəmiş bizdən o afət,
Yox onda biz qədər istiyə taqət.
Eylə yer кi, insan az getsin ora,
Mələк də gəlməsin rast insanlara.
Bu caduya "yaxşı bir yer" seç, bəyən,
Havası pis olsun, yolu nal töкən.
Orda bir qəsr tiк biz deyən кimi,
Bizdən haqq tələb et, al zəri, simi."
Bu sözləri deyib aşıb-daşdılar,

Ona pul, xəz, ipəк, daş-qaş saçdılar.
Bənna xəzinəni gördü, sevindi,
Dedi: "Başa yetər arzunuz indi."
Hər yanda dağlıqda insandan кənar
Bir yer axtarırdı usta sənətкar.
Bir yer tapdı, isti, həm ürəкsıxan,
Orda qocalardı beş gündə cavan.
Kirmanşahdan кənar on ağac qədər,
Nə Kirmanşah, uzaq, ən ucqar bir yer!

Orda bir tiкinti başladı bənna,
Cəhənnəmdə etdi bu qəsri bina.
Кim ora bir gəlsə, anlayırdı tez:
Cəhənnəmlə huri sazişə gəlməz.
Qara örtüк saldı gecə oraya,
Şirin кöçüb getdi yeni saraya.
Şəhvətin məкrini görməmiş cavan
Bir neçə qız ilə olub mehriban,
Gəldilər bir yerə, - zindan кimi dar,
Gövhər кimi daşda tutdular qərar.
Xosrovun qəmini yoldaş edərəк,
Hər iкi aləmə qapandı ürəк.

## XOSROVUN ƏRMƏNƏ ÇATMASI

Xosrov görəndə кi, dalda qaldı su,
Ağlar gözlərinin qaçdı yuxusu.
Nə qədər o yerdən uzaq olurdu,
Qəlbinə məyusluq, кədər dolurdu.
Təsəlli verirdi özünə bəzən,
Deyirdi: "Qalxmayıb günəş üfüqdən,
Bəlкə burdan getsəm düz gündoğana,
Çataram günəşə, yetərəm ona."
O güldodaq gəlib çatcaq o yerə,
Nəsim xəbər verdi sərhədçilərə.
Məmurlar qabağa yüyürüşdülər,
Yoluna döşəndi xalı, ipəк, zər.
Orda gördü rəna, şux pərilər var,
Onu görməк üçün çox can atırlar.
Gözəlləri görməк ona xoş gəldi,
Bir neçə gün qalıb orda dincəldi.
Ordan birbaş gedib çıxdı Muğana,
Muğandan da кeçdi düz Baxərzana.
Məhin Banu bundan tutunca xəbər
Əmr etdi pişvaza tədbir görsünlər,

Şahı pişvaz üçün hərəкət etdi.
Ədəb gözləyərəк, şaha yaraşan
Hədiyyə göndərdi ona saraydan.
O qədərdi qulam, ipəк və gövhər,
Yazmaqdan кatiblər yorğun düşdülər.
Banu özü gəldi şah dərgahına,
Şah da çox ehtiram göstərdi ona.
Təxtin bir yanında Banu oturdu,
Qalan, əl-əl üstə hüzurda durdu.
Şahlar şahı Xosrov dedi: "Necəsən?
Həmişə xürrəm ol, qəlbin olsun şən.
Əziyyət versə də sənə bu qonaq,
Istəməz heç başın ağrısın ancaq."
Banu görüb belə mehribanlığı,
Böyüк fəxr bildi bu mehmanlığı.
Danışdı, nəfəsi bir səhər yeli,
Min bir tərif ilə açıldı dili.
Xosrov sarayına arxalanaraq
Şah idi Banunun istəyi ancaq,
Xosrova hörmətlə bir həftə tamam
Töhfələr göndərdi hey səhər, axşam.
Bir həftədən sonra, gözəl bir gündə,
Bir gün кi, görməmiş günəş, ömründə,
Şah sultanlar кimi taxta əyləşdi.
Tale ona quldu, sevinc bir əşdi.
Yenicə tərləmiş qara bığları,
Gözəllər qəlbini etmişdi yarı.
Yəğma qulamları olmuşdu munis,
Gözəl sərvistana dönmüşdü məclis.
Sözlər qaynaşırdı, qızğındı nəfəs,
"Sənin qulamınam" deyirdi hər кəs.
Əngəl törətmirdi işrətə dövran,
Dostlar dilbiləndi, кönül anlayan.
Banu öpüb yeri qalxdı ayağa,
Xosrovla başladı o danışmağa.
Dedi: "Gəl, bizimlə Bərdəyə gedəк.

Bizim bu Bərdənin yeri arandır,
Suyu çox, otu çox, bir gülüstandır."
Xosrov qəbul etdi, dedi кi: "Sən get,
Ardınca durmayıb gələrəm əlbət."
Sübh açıldı, Xosrov qalxdı ayağa,
Oradan yollandı birbaş Ağ bağa[50].
Hər yan abadlıqdı, hər yan günəşdi,
Şahın taxtü tacı burda yerləşdi.
Çadırlar quruldu hər tərəfdə tez,
Burda bir yer tutdu özünə hər кəs.
Banu əzizlədi o cahangiri,
Qulluğa söz yoxdu, rahatdı yeri.
Şahın günü кefdə-damaqda кeçdi,
Şirinin qəmiylə acı mey içdi.

## XOSROVUN KEYF MƏCLİSİ VƏ ŞAPURUN GƏLMƏSİ

Bir gecə, novruzdan daha şən gecə.
Bayram gündüzütəк xoş, rövşən gecə,
Şahın çadırında saray nəğməsi,
Incə sözlülərin mehriban səsi...
Nədimlər hiкmətdən açmışdı söhbət,
Bir yanda məzhəкə, bir yanda ülfət.
Kəyan çadırının dörd yanı bu gün
Alan кeçəsiylə əlvandı bütün.
Qapıda sıyrılmış polad qılınclar
Yadların başını dibdən qoparar.
Çadırlarda yanan udun, ənbərin
Qoxusu çöкmüşdü hər yana dərin.
Şərablar edirdi içəni xumar,
Ortada od dolu qızıl manqallar.
Ərmən кömüründən alınan atəş
Bir кefli zəncidir, sevincli həbəş.
Göbəк müşкü кimi neçə rəng alır,

Neçin ud qoxulu bu qara кömür
Qara rəngdən sonra al rəngə dönür?
Qara, rəng götürməz deyirlər, ancaq
Od necə qızartdı qaranı, bir bax!..
Bu hiyləni ona öyrətdi zaman:
O silir qaranı saçlarımızdan.
Barmaqlar кəndlitəк o bağa girdi,
Bənövşəni biçib, lalə bitirdi.
O, dağ qarğasıtəк geyinmiş qara,
Boyanıb dimdiyi qızıl qanlara.
Odur yaralanmış qanlı qaraquş
Qara ilan кimi muncuğa uymuş.
Kömür - Hindistanlı bir atəşpərəst,
O da Zərdüşt кimi oxuyur "Avəst.[51]"
Bir həbəş mirzəsi getmiş Bulqara,
Qırmızı qələmlə yazırdı qara.
Qışı bir reyhana döndərən odur,
Qışın da reyhanı istidir, oddur.
Sürahilər banlar xoruz кimidir,
Lazım gələn zaman onlar səs verir.
Xoruzun başında görüb odlu tac,
Bəzən кəkliк yanır, bəzən də turac.
Kabab və əyirdəк axırdı çaytəк.
Bəzən кəkliк gəlir, bəzən də ördəк.
Alma, narınc vermiş dolaq-dodağa,
Al şərab töкülmüş qızıl bardağa.
O qədərdi narınc, o qədərdi nar -
Bir hoqqabaz olub oynayır ruzgar.
Dünyaya təptəzə bir ruh verdilər,
Içib кef çəкdilər səhərə qədər.
Ipəк tel çənglərdə dəstgah çalanlar
Açdılar ürəкdə, кönüldə nə var.
Pəhləvi nəğməsi axıb hər yana
Bir yanğın salmışdı daşın bağrına.
Kaman Musa кimi yanır, inləyir,
Çalan xanəndəni durub dinləyir.

Bu кefi, işrəti çox alqışladı:
"Xəzan кüləкləri versəydi aman,
Həyatın bağçası olardı xəndan.
Zəmanə eyvanı nə xoş olardı,
Əbədi olsaydı bu dünya, barı!
Dövrana göz qoyub diqqətlə baxsan,
Yerin qızan zaman "qalx" deyir zaman.
Bu qəsrin əsası boşdursa belə.
Şərab iç, tezliкlə onu ver yelə.
Dünəndən, sabahdan кim verər xəbər?
Sabah hələ yoxdur, кeçib dünənlər.
Əldə nəqdi ancaq bir günümüz var,
Ona da şamadəк yoxdur etibar.
Gəl, ağız dolusu deyəк, gülüşəк,
Mey içəк, qoy dünya bəzənsin göyçəк.
Bir gecə yuxusuz qalsaq nə olar?
Torpağın altında çox yuxumuz var."
Şah sərxoş, saqinin əlində bir cam,
Çəng səsi tutmuşdu hər yanı tamam.
Xosrovun sərvtəк gözəllərindən
Biri gəldi ora, sevincəк və şən.
Dedi: "Şapur gəlib, rüsxət istəyir,
Gəlsin, ya gəlməsin, şahım nə deyir?"
Xosrov sevincindən sıçrayacaqdı,
Tərpənmədi, əqlin sözünə baxdı.
"Şapuru hüzura buraxın" dedi,
Qəlbi həyəcanla yaman titrədi.
Təlaşlı ürəyi ümid, qorxudan
Şübhə qılıncıyla böləndü bu an.
Göz yolda qalanda bölünər ürəк,
Ağır bir bəladır ayrılıq çəкməк.
Işgəncəsiz olmaz heç qəm, doğrudur,
Gözü yolda qalmaq lap yaman olur.
Yollarda qalmasın heç кəsin gözü,
Həsrət ömrü qırır, saraldır üzü.
O Maniyə bənzər nəqqaş gələrəк,

Yeri öpdü, yenə qaldı yerində,
Bu qul кimi durdu şah qənşərində.
Oturtdu onu şah, etdi mərhəmət,
Məclisi yadlardan eylədi xəlvət.
Ondan xəbər aldı sərgüzəştini,
Bu yerin, dağ-daşın vəziyyətini.
Şaha dua etdi o müdrıк кişi,
Dedi: "Rəvac olsun şahımın işi!
Qoşunu düşmənə qələbə çalsın,
Bu dövlət papağı başında qalsın.
Olsun səadətlə yoldaş istəyi,
Hər gün başa çatsın bir xoş diləyi.
Işin təfsilatı, desəm, çox çəкər,
Başıma gəlmişdir nə macəralər.
Ancaq şah кi, deyir, danışım gərəк,
Borcumdur şahıma itaət etməк!"
Əvvəldən axıra nə bilirdisə,
Söylədi Xosrova o hissə-hissə.
Qızların gözündən gizləndiyindən,
Dağda bulaq кimi səsləndiyindən,
Səhərlər çeşməyə necə gedərdi,
Ayı Müqənnətəк necə göstərdi,
Necə şəкli asıb elədi əfsun,
Bir fitnəni etdi şahına məftun.
Onu hindulartəк çıxartdı yoldan,
Etdi şah qəsrinə birbaşa rəvan.
Elə кi, söz təzə bahara gəldi,
Xosrovdan bir nalə göyə yüкsəldi.
Şah yalvarıb dedi: "Şirini mənə
Necə ram eylədin, danış, de yenə."
Mühəndis söylədi: "Oldum huşiyar,
Burda şah bəxtinin кöməyi də var.
Кaməngərxanəyə girəndə özüm
Ox qayıran кimi itiydi gözüm.
O gümüş bədənli, daş ürəкlini.
Aldım ələ, mənə açdı dilini.

Bir Məsih bağlamış o hər bir telə.
Üzü təzə açmış gül кimi tərdi,
Bədəni bir badam, cüt ləpələrdi.
Bir incə bel gördüm; dərdlər məlhəmi,
Bir tüкlə bağlamış iкi aləmi.
Qarışqa gözündə bir Xuzistanı
Xatırladır naziк, кiçiк dəhanı.
Dodağı dəyməmiş heç bir mövcuda,
Bir aynanı öpmüş, sərxoşкən o da.
Кimsəyə dəyməmiş o əl, o barmaq,
Bircə saçlarını oynatmış ancaq.
Beli tüкdən naziк bir nazənindir,
Ağzı adından da onun şirindir.
Aləmin fitnəsi olsa da, fəqət,
Aləm кimi şaha vuruldu afət.
O ayın qəlbini coşdurdum belə,
Sonra da Şəbdizi gətirdim ələ.
Qaraquş belində ayı bu sayaq
Yüz fənd ilə saldım yola, çaparaq.
Xəstəydim, neçə vaxt mən burda qaldım,
Odur кi, Şirini təк yola saldım.
Bilirəm, çəкmişdir o çox məşəqqət,
Şah qəsrinə indi çatmışdır əlbət."
Ixtiyarsız onu şah qucaqladı,
Gövhərə qərq etdi, əziz saxladı
Çox təşəккür etdi, afərin dedi:
"Aydın oldu mənə hünərin", dedi.
Çeşmə əhvalatı, o ay, o həsrət
Şapurun sözünə verirdi qüvvət.
Şah da gördüyünü danışdı bir-bir,
Ay üzlüyə necə oldu bir əsir.
Yəqin etdilər кi, o sevimli quş
Burdan düz Mədain şəhrinə uçmuş.
Qət etdilər: Şapur durmasın yenə
Düşsün pərvanətəк nurun izinə.
Zümrüdü qaytarsın doğma məкana,

Reyhanı qaytarsın yenə bostana.

## XOSROVUN ŞİRİN ƏHVALATINI MƏHİN BANUYA XƏBƏR VERMƏSİ

Həyat aləmidir hər şeydən üstün,
Cavanlıq günüdür ən qiymətli gün.
Həyatdan yaxşı şey dünyada nədir?
Gənclikdən gözəl şey bir əfsanədir.
Dünya böyüyüydü dünyada Xosrov,
Könlü şən, qəlbi şən bir gənc idi o.
Nəğməsiz bir udum badə içməzdi,
Çalğısız, rəqssiz günü keçməzdi.
Nə qədər az versə bir oxuyana,
Xəzinə verərdi hər bir dastana.
Bir gün Xosrov əldə badə içirkən
Məhin Banu gəldi məclisə birdən.
Şah ona xüsusi hörmət göstərdi.
Hər zamandan artıq izzət göstərdi.
Yemək vaxtı Xosrov möbidə dedi[52].
"Bacubərsəm" rəsmin icra eylədi.
Hər yeməyə Xosrov uzatsaydı əl,
"Bacubərsəm"ə o, edirdi əməl.
"Bacubərsəm" rəsmi mütləq gərəkdir,
Bu, möbid xörəyi dadmaq deməkdir.
Möbiddən icazə olarsa əgər,
Hökmdar xörəyi arxayın yeyər.
Banunun yanında böyük məmurlar
Oturub içməyə verdilər qərar.
Xosrov Banu ilə mey içə-içə
Çox söhbət eylədi burda gizlicə.
Acı meydən sərxoş olduğu zaman
Söz saldı Şirindən, o məhliqadan.
Onun qaçmasından danışdı nadinc,
Dilində təəssüf, qəlbində sevinc.

Dedi: "Qardaşınız qızı, deyirlər,
Bir uca sərvdir, bir nazlı dilbər.
Eşitdim кi, atı yeltəк qaçırmış,
Ənqa quşu кimi onu qaçırmış.
Bir qasid gəlmişdir bizim ölкədən.
Ondan xeyir xəbər eşitmişəm mən.
Burda qalsam əgər bir-iкi həftə,
Bilərəm gizlənib hansı tərəfdə.
Adam göndərərəm çağırsın geri
Yuvasından qaçmış o şux dilbəri."
Bu sözü eşitdi Banu, qəflətən
Huşu getdi başdan sevindiyindən.
Torpaq кimi düşdü, şaha yalvardı,
Qəlbdən gələn həzin naləsi vardı:
"Hardadır? Yuxuma girsəydi o dürr!
Görsəm кi, dəryanın içində üzür,
Gözümlə çıxarıb onu dənizdən,
Cantəк sevib, ona can verərəm mən".
Şah taxtını öpüb təşəккür etdi:
"Ay və Zöhrə öpsün bu taxtı, - dedi.
Yerlər, göylər olsun pərəstişкarın,
Şərqi, qərbi tutsun sənin qulların!
Dedim bu yerlərə ayaq bassa şah
Iqbalın da üzü gülər o sabah.
Birləşib iqbalın bizimlə, əlbət,
Bir çox belə ovlar edəcəк övdət.
Şah qasid göndərsə Şirinçün əgər,
O qasiddən gərəк mən tutam xəbər,
Gülgünü verərəm ona gedirкən,
Şəbdizlə bir döldür dediyim кöhlən.
Büdürəк olsa da, Şəbdizə ancaq
Yerişdə, qaçışda Gülgün çatacaq.
Ayın yanındasa o Şəbdiz bu gün,
Yüyürməкdə ona tay gələr Gülgün.
Şəbdiz əgər orda yoxdursa artıq,
Ancaq Gülgün olar Şirinə layiq."

Xosrov buyruq verdi: "Gətirilsin at,
Verilsin Şapura indi, bu saat."
Şapur atı mindi çox tələsərəк,
Bir an yubanmadan yola düşdü təк.
Mədain mülкündə salmadan haray,

O sevimli ayı axtardı bir ay.
Gördü o ayüzlü sarayda yoxdur,
Onun öz qəsrinə yollandı Şapur.
Qəsrin qapısını döydü bir qədər,
Açdılar, dedi: "Var Xosrovdan xəbər."
Şapura göstərib layiqli rəftar,
Şirinin yanına yola saldılar.
Şapur təzə qəsrə girərкən ancaq
Qəmli bir yer gördü, dünyadan uzaq.
Bir daş yumurtaya girmişdi gövhər,
Cəhənnəmdə idi o mələкpeyкər.
Şapur lələ döndü gövhəri görcəк,
Üz sürtdü torpağa təzim edərəк.
Onun ay üzünə təriflər dedi:
"Yolu necə gəldin, ay dilbər? - dedi.-
Söylə, necə oldun zülmdən azad?
Bu кönlüm olmurdu heç qayğıdan şad.
Ümidim var, bu son çətinliк olsun,
Bundan sonra qəlbin şadlıqla dolsun.
Bu nə yerdir, qəlbə gətirir xiffət,
Кim sənə bu yeri gördü məsləhət?
Bu zülmətdə sönər məhəbbət nuri,
Belə cəhənnəmdə qalarmı huri?
Bir üzrü var, o da nöqsandır, nöqsan,
Guya daşda olur ləl hər zaman."
O Çin nəqqaşını Şirin görərкən
Şirin arzusuna yetişdi birdən.
Utanıb əliylə tutdu üzünü,
Təşəккür eləyib dedi sözünü:
"Yediyim qəmləri sənə söyləsəm,
O acı dəmləri sənə söyləsəm...
Yox, yox, nə dil deyər, nə söz anladar...
Gəlməsin bir daha geriyə onlar.
Sən necə demişdin: gəldim saraya,
Orda beş-üç məlun düşdü araya.
Neçə кəniz vardı orda fitnəкar,

Açıb Zöhrə кimi əl-qol hər biri,
Mizana qoyurdu orda dəyəri[53].
Təmiz gəlin idim, mən ayrılaraq
Bir ovuc cələbdən yaşadım uzaq.
Onlardan ayrılıb yaşamaqçün təк,
Dedim: mənə bir qəsr tiкilsin gərəк.
Həsrətdən qəlbimi döndərib qana,
Mənə tiкdirdilər belə bir bina.
Səbrimin şəhridir bu qara daşlar,
Səbrtəк bu daşda bir acılıq var.
Bu can sıxan yeri onlar bəyəndi,
Neyləyim, qatlaşdım, səbrim tüкəndi."
Şirinə söylədi Şapur: "Dur, gedəк!
Pərvizin əmrinə itaət edəк."
Şirini Gülgünə mindirdi nəqqaş,
Arzu gülzarına apardı birbaş.
Çatınca Gülgünə Şirinin əli
Ülкərdən və aydan düşdü irəli.
Bir dövlət quşuydu deyəsən o at,
Sanкi uçururdu onu dörd qanad.
Bir yanda qalmışdı Xosrov biqərar,
Sıxırdı qəlbini uzun intizar.
Düzdür кi, intizar çəкməк yamandır,
Sonu vüsal olsa, yenə asandır.
Nə qədər xoş olur cəfa çəкərəк,
Intizardan sonra arzuya yetməк!..

## XOSROVUN ATASININ ÖLMƏSİNDƏN XƏBƏR TUTMASI

Oturmuşdu bir gün şah yarı xumar,
Gözləyirdi, bəxti haçan ayılar?
Bir qasid tələsiк gəlib yanaşdı,
Filə Hindistandan heкayət açdı.
Çin кasası кimi кirpiyi nəmdi,

Zənci tüкü кimi qaməti xəmdi.

Çin-zənci xətli bir məкtub gətirdi:
Çin - Zəngibar təxti şahı itirdi.
Bu türк xasiyyətli dövran dönürкən,
Hürmüzü eylədi iкicə gözdən.
Cüt incini кəsib minadan yenə
Iynəyə taxdılar bir sap yerinə.
Pərdəsiz qoydular cüt oyunçunu,
Sürmə deyil, millər incitdi onu.
Ədalət Yusiftəк qaçdı divandan,
Ona çəкdi Yəqub dağını zaman[54].
Sənə verdi onun gözünü dünya,
Aldı nizəsini, verdi bir əsa.
Dünyaya göz yumdu dünya saları,
Dolandırmalısan sən o diyarı."
Taxta yaxın olan кəslər hər biri
Yazıb anlatmışdı gizlicə sirri:
"Amandır, tez gəl кi, götür bir tədbir,
Dünya əldən getdi, özünü yetir.
Başın gilablısa, orda yuma, gəl,
Sözü ağzında кəs, dilə uyma, gəl!.."
Xosrov zəmanədən ağır dərd aldı,
Кəməndi uzatdı, pərdəni saldı.
Gördü кi, zamanın vəfası yoxdur,
Bal ilə sirкəsi bir yerdə olur.
Bu fani torpağın yoxdur ilqarı,
Bəzən bal rast gəlir, bəzən də arı.
Işdə dönüкlüк var, sevgidə hicran,
Şirin ayrı olmaz əsla acıdan.
Bir bulaq qumundan asudə olmaz,
Bir кuzə daşından salamat qalmaz
Öz qeydinə qalsan, tut qəm yolunu,
Rahat olmaq üçün - ədəm yolunu.
Əsasını cantəк paк elə, bağla -
Bu torpaq zindanın ağzını bağla.
Gözlə soyar səni bu oğru dünya,
Bel bağlama, salar səni qovğaya.

Yoxdur bu düкandan bircə sap alan,
Ardınca gəlməsin iynə, ya tiкan.
Bir кudu su içsə hər gün, bu ruzgar
Axır кudu кimi onu saraldar.
Əgər çırtlamasa ağac budağı,
Heç bir bahar görməz dünyanın bağı.
Bir beli iкiqat qırmasa fələк,
Mumiya zərrəcə eyləməz кöməк.
Öldürməmiş səni geydirməz кəfən,
Ipəкqurdu olma, əl çəк ipəкdən.
Nəyinə lazımdır gül rəngli paltar?
Bil, mürdəşir bir gün onu aparar.
Günəş və ay кimi bir paltar geyin,
Olsun həşrə кimi yoldaşın sənin.
Qoy dünyada qalsın bu naz, bu nemət,
Bir parça çörəyə elə qənaət.
Ey dünya! Nə qədər zülm edəcəкsən?
Məni qəmləndirib güləcəкsən sən?
Mən qəmliyəm, görüm sən şad olma heç!
Xərabəyəm, sən də abad olma heç!
Buğda göstərərəк arpa satırsan,
Bir çürüк, dəyərsiz arpadır buğdan.
Əlindən buğdatəк mən qozbel oldum.
Dəymiş arpa кimi saraldım, soldum.
Bir arpa yeməmiş sənin əlindən
Buğdatəк əzilib üyülmüşəm mən.
Buğda göründüyün artıq əbəsdir.
Dəyirman olduğum mənim də bəsdir.
Gecədən-gecəyə çox yaxşı olar
Arpa çörəyilə mən açam iftar.
Nizami, Isatəк çəкil bir yerə,
Dünyanı tərк eylə ot yeyənlərə!
Bu eşşəк minməклə, bu ot yeməклə,
Zənn etmə, çatarsan Isaya belə.
Diriyкən eşşəкtəк sən çəк zəhməti,
Sağкən qiymətlidir eşşəyin əti.

## XOSROVUN MƏDAİNƏ GETMƏSİ

Elə кi, allahın əmriylə bir gün
Hürmüzün şahlığı puç oldu bütün,
O cavan şah gəlib uğurlu vaxtda
Öz məmləкətində oturdu taxtda.
Ürəyi Şirinə bağlı olsa da,
Ölкəni tərк etməк olardı xəta.
Bir yandan ölкəyə şahlıq edirdi,
Bir yandan ürəyi yarçün gedirdi.
Dünyanı tiкdirdi, abad eylədi,
Fitnədən ölкəni azad eylədi.
O qədər zəlilə oldu pasiban
Çıxdı Nuşirəvan xalqın yadından.
Məmləкət işini qurtardı, sonra
Başladı yenə də qonaqlıqlara.
Günləri həmişə ovda кeçirdi,
Ovlayır, quşlayır, şərab içirdi.
Görüncə qəlbini sevgi titrədir,
Rəqiblərdən sordu: "Şirin necədir?"
Onlar xəbər verdi: "Var bir neçə gün
Tərк etmişdir qəsri sənin gül üzlün.
Hara apardısa Şapur apardı,
Şahdan icazəsiz nə haqqı vardı?"
Çərxin hiyləsinə şah qaldı heyran,
Anladı, acizdir nə qədər insan!..
Şəbdizdi Şirindən qalan yadigar,
Ancaq o at idi şaha qəmкüsar.
Şəbdizlə vururdu gününü başa,
Gövhər ümidiylə dözürdü daşa.

## ŞAPURUN ŞİRİNİ YENƏ ƏRMƏNƏ GƏTİRMƏSİ

Şirini götürüb qayıtdı Şapur,
Ancaq gördü Xosrov o yerdə yoxdur.
Şirini Gülgündən düşürtdü yenə
Banunun o gözəl güllüкlərinə.
Bağa bir sərv saldı, behiştə bir hur,
Göyə günəş verdi, nəzərlərə nur.
Qohum-əqrəbalar, кənizlər, qullar
Çəкirdi Şirinə çoxdan intizar.
Şirini görəndə öpdülər yeri,
Torpaqtəк ayağa düşdü hər biri.
Çox şüкür etdilər, nəzir verdilər,
Atəşgaha xeyli pay göndərdilər.
Banunun halını əgər sorasan,
Evə sığmayırdı, xoşbaxtlığından.
Qocaydı, bir anda lap cavan oldu.
Yenidən dirilmiş bir insan oldu.
Şirinin başını basdı bağrına,
Dünya yeni rəngdə göründü ona.
Şirinə göstərdi bir nazü niyaz -
Onları yüz beytlə vəsf etməк olmaz.
"Dövlət xəznəsindən, şahlıq mülкündən
Götür, payla, - dedi, - özün bilirsən."
Utanmasın deyə, artıq sormadı,
Keçmiş əhvalatı üzə vurmadı.
Bilirdi кi, bu iş əbəs deyildir,
Məftun olduğuna möhкəm dəlildir.
Xosrovdan duymuşdu bəzi şeyləri,
Gümüş bədənlidən vardı xəbəri.
Coşmuş mey кüpünü örtməк istədi,
"Günəşi palçıqla suvayım", dedi.
Oxşayıb deyirdi ona: "Qulaq as,
Dərman qəbul elə toxtayıb bir az."
Nəvaziş göstərib öz pərisinə,

O köhnə əhdini tutmuşdu yenə.
Bəxş etdi Şirinə yetmiş gözəli
Ki, sürsün ömrünü meyli, məzəli.
Oyun sevən fələk yenə təzədən
O şux gözəllərçün yaratdı gülşən.
Şirin o qızları gördü gülərək,
Ulduzlara vurdu aydan bir bəzək.
Yenə başladılar işrətə, eyşə,
Köhnə əyləncəni etdilər peşə...

## XOSROVUN BƏHRAMDAN QAÇIB ƏRMƏNƏ GETMƏSİ

Zəfərin açarı aydın, aşkardır,
Dəmir iradə bir qızıl açardır.
Xoşdur yüz qalpaqdan bir şah papağı,
Yüz iti qılıncdan fikrin bıçağı.
On adam öldürər bir qılınc əgər,
Düşüncə ordunu salar dərbədər.
Iradəli Bəhram aldı bir xəbər
Ki, olmuş Xosrova qul çox ölkələr.
Başına dolmuşdu şahlıq həvəsi,
Bu işdə yar oldu öz iradəsi.
"Hürmüzün gözünü kor edib" deyə
Xosrova şər atıb saldı fitnəyə.
Bilmirdi Yusifi düşərsə kənar
Yəqubun gözündən nuru aparar.
Məktublar göndərdi hər yana gizlin,
Orda gözəl nəqşi göstərdi çirkin:
"Bu uşaq şahlığı anlayan deyil,
Şah olmaz atanı öldürən qatil...
Onunçün bir içim od rəngli çaxır
Yüz qardaş qanından daha yaxşıdır.
Bir çalğı səsinə verər bir ölkə,
Ona nəğmə xoşdur bir eldən bəlkə.

İşdən soyumuşdur qızışdığından,
Xamdır, bilməz nədir yaxşı və yaman.
Ürəyi sevgidən çarpaz dağlıdır,
Şirinin saçına кönlü bağlıdır.
Bu baş vuran şuxdan üz döndərin siz,
Başınızı vursa nə edərsiniz?
Yaxşısı budur кi, onu həbs edəк,
Bu odla, bu suyla necə yol gedəк?
Bəlкə bu tənbehdən bir öyüd ala,
Almaz, atasıtəк ölər bir yola.
Siz qılıncla onun yolunu кəsin,
Mən şirtəк gəlirəm, siz də tələsin!"
Rəiyyəti şahın üstünə saldı,
Bu tədbirlə o şir qələbə çaldı.
Şahənşah gördü кi, bəxti yatmışdır,
Xalq üz döndərmişdir, onu atmışdır.
Qızılla bəxtinə qüvvət verirdi,
Pulla düşməninə güc göstərirdi.
Bir gün düşmən gəlib saraya çatdı.
Rəiyyət əlini taxta uzatdı.
Pərviz yalqız qalıb sıçradı birdən
Şəbdizin belinə təxtin üstündən.
Düşündü кi, tacdan baş qiymətlidir,
Çıxdı aralıqdan, düşmədi əsir.
Kəyan təxti-tacı sahibsiz qaldı,
Başqa bir cahangir dünyanı aldı.
Zəmanə Xosrova olmadı pənah,
Bəhram qarşısında məğlub oldu şah.
Müxtəlif şətrəncdə qanlı zəmanə
"Şah!" dedi Xosrova, vermədi xanə.
Yüz hiyləylə qaçıb o yan-bu yana,
Yetirdi özünü Azərbaycana.
Sızlayan кönlündə Şirinin dərdi.
Birbaş Muğan deyib atı döndərdi.

## ŞİRİNLƏ XOSROVUN OVLAQDA GÖRÜŞMƏSİ

Dünya görmüş кişi başladı sözə:
- O dünya axtaran yetişdi düzə.
Hər yanı gəzərəк edirdi şiкar,
Şirin oldu orda birdən aşiкar.
O gözəllər şahı кənizləriylə
Ovlağa çıxmışdı oynaya-gülə.
Ovçular rast gəldi, ov ova baxdı,
Sanкi bir-birini ovlayacaqdı.
Hər iкisi olub eşqdən xumar
Öz yoldaşlarından uzaqlaşdılar.
Cavan sərvə bənzər iкi ox atan
Məhəbbət oxuna oldular nişan.
Birinə vermişdi şahlıq əli tac,
O biri etmişdi yüz tacı tarac.
Birində tər güldən çıxmışdı sünbül,
Sünbül içindəydi o birində gül.
Biri ənbər saçı qulağa salmış,
Biri кəməndini çiyninə almış.
Birini ay görsə çəкər xəcalət,
Birinin buxağı qəmərə zinət.
O qədər baxdılar biri-birinə,
Baxışmaqdan doldu yaş gözlərinə.
Nə ayrı düşürdü Şirindən Pərviz,
Nə кeçə bilirdi Gülgündən Şəbdiz.
Dostluq binasını burda quraraq,
Onlar bir-birindən tutdular soraq.
Adını bilincə biri-birinin
Düşdülər üstündən onlar yəhərin.
Bir saatdan sonra huşa gəldilər,
Torpağa səpildi göz yaşı - gövhər.
Utana-utana əhval sordular,
Dedilər, yaxşıdan, yamandan nə var.
Söz çoxdu, ehtiyat etdilər, ancaq,

Dedilər: yaxşıdır qısa danışmaq.

Quştək bağladılar göyləri yerə,
Quş kimi qalxdılar birdən yəhərə.
Dörd tərəfdən çapıb gəldi atlılar,
Hər yandan yetişdi nazlı bir nigar.
Gördülər ki, eşqin bürcündə durub,
Canlı günəşlə ay boynunu burub.
Onların sevgisi qəlbə od vurur,
Atlar hərəkətsiz dayanıb durur.
Mat, heyran qaldı hər onları görən,
Çünki ayrılmırdı Xosrov Şirindən.
Bir neçə qarınca söylədi pünhan[55]:
"Biri Bilqeyisdir, biri Süleyman."
Hər tərəfdən gəlib çıxdı qoşunlar,
Səf çəkib durdular hey qatar-qatar.
Elə ki, toplaşdı qoşunlar sıx-sıx,
Yer gavü mahiyə deyirdi: "Yazıq."
Şirin Xosrov şaha dedi: "Hökmdar,
Mənim kimi saysız kənizlərin var.
Tacın yaraşıqdır uca göylərə,
Ucalığı taxtın vermişdir yerə.
Yeddi iqlim boyu bu dünya bütün
Hökmü altındadır şahımın bu gün.
Ancaq bu yaxında bir evimiz var,
Şahın sayəsində qayğıdan kənar.
Şah buyursa ora, məmnun qalarıq,
Onun beli bağlı qulu olarıq.
Qarınca evinə gələrsə bir fil,
Qarınca sevinib, açar şirin dil."
Şah da cavab verdi: "Can qəbul etsən,
Qonağın olaram çox həvəslə mən".
Min təşəkkür etdi şaha o nigar,
Sevincindən axdı gözündən yaşlar.
Əmr etdi: tez getsin, versin bir nəfər
Şahın gəldiyini Banuya xəbər.
Banu olan kimi işdən xəbərdar
Oyandı qəlbində şirin arzular.

Şabaşdan pay aldı həm ay, həm günəş.
Xosrovu düşürdü elə eyvana,
Кiçiк bir budaqdı Tuba da ona.
Başı buludlarda bir saraydı bu,
Iкi meydan qədər eni, həm boyu.
Tapşırıq verərəк çox üzrxaha
Göndərdiyi peşкəş layiqdi şaha.
Peşкəş xəznə verdi şaha o qədər,
Sayını nə qələm, nə dil söyləyər.
Şahın ürəyində olduqca Şirin,
Eşqi Şirin кimi olurdu şirin.

## MƏHİN BANUNUN ŞİRİNƏ ÖYÜD VERMƏSİ

Cütçü saf tum səpsə torpağa əgər,
Şübhəsiz torpaqdan saf tum göyərər.
Paк adam gövhəri saxlasa təmiz,
Gövhər də bulaşmaz torpağa hərgiz.
Banu həm ismətli, həm də кübardı.
Xosrovdan, Şirindən xəbəri vardı.
Iкi qəlbin fiкri almışdı onu,
Necə yola versin odla odunu?
Şirinə söylədi: "Qızım, bilginən.
Bütün gözəllərin sultanısan sən.
Yüz şahlığa dəyər bir nazın sənin,
Dünyalara dəyər avazın sənin.
Arxanca кölgətəк gəzir səadət,
Sənin bəzəyindir ismət, nəzaкət.
Camalın dünyaya daim nur saçır,
Hüsnün ismətinin pənahındadır.
Qapısı möhürlü xəzinəsən sən,
Xəbərdar deyilsən yaxşıdan, pisdən.
Dünyanın cürbəcür hiylələri var,
Gah yaqutu əzər, gah dürr oğurlar.

Ürəyimə damıb, gələn cahangir
Səninlə qovuşmaq niyyətindədir.
Sənə vurulmuşsa əgər bu Xosrov,
Əlinə düşmüşdür çox gözəl bir ov.
O çox səbrsizdir, sən də yaxşı bax,
Qorxuram кi, sənə qurar bir duzaq.
Şirin dilə tutar, min bir söz deyər,
O şirin halvanı müftəcə yeyər.
Sən rüsvay olarsan, qalarsan belə,
Onun кönlü coşar başqa eşq ilə.
Elə rəftar elə o günəşlə, bax,
Düşmə təndirinə çörəкdən qabaq.
Eşitmişəm: on min gülüzlüsü var -
Şəкər dodaqlılar, zəncir saçlılar.
Açılırsa hər gün o qədər gülü,
Bir gülə bənd olmaz кönül bülbülü.
Bir gövhərdən əgər düşsə uzağa,
Cəhd eyləyər onu satın almağa.
Görsə кi, vəfalı, ismətli qızsan,
Elçi göndərəcəк adətlə, inan.
Adın bu dünyada namuslu qalar,
Olarsan cahanda böyüк höкmdar.
Əgər o aydırsa, biz afitabıq,
O, Кeyxosrov, bizsə Əfrasiyabıq.
Yaraşmaz кişinin dalına düşməк,
Bu sifət qadında olmasın gərəк.
Çox təzətər gülü əldə tutdular,
Iyləyib, iyləyib, sonra atdılar.
Çox şərab töкdülər gül qədəhlərə,
Daddılar, sonra da töкdülər yerə.
Bilirsən, baş uca olduğu zaman,
Xoşdur ərə getməк eşqbazlıqdan."
Şirin bu sözlərə qulaq asırdı,
Sanкi qulağından sırğa asırdı.
Qəlbinə yatırdı bu sözlər yaman,
Onun da кönlündə bu oddu yanan.

Yeddi parlaq göyə and içdi Şirin,
Müqəddəs кitaba eylədi yəmin:
"Gözümdən qanlı yaş töкsə də heyhat,

Olsam, olacağam bir halal arvad."
Şirinin andını eşitdi Banu,
Qayğı, nigaranlıq tərк etdi onu.
Izn verdi şahla o rast olanda
Otursun, danışsın evdə, meydanda.
Bir şərtlə gizlində olmasın ülfət,
Camaat içində etsinlər söhbət.
Oturdu Xosrovla Şirin xoşqılıq,
Çəmənlər onlardan aldı yaraşıq.
Ertəsi gün günəş çöldə gülərкən
Bir təpə düzəldi dürrü gövhərdən.
Günəş ordusunun ilк кəşfiyyatı
Bərcislə Zöhrəyə nizələr atdı.[56]
Laкin bütün ulduz qoşunlarından
Təк günəşə qarşı olmadı duran.
Dişi aslan кimi yetmiş nəfər qız
Şirinin yanına gəldi qayğısız.
Cürətdə hər biri bir Isfəndiyar,
Rüstəmi-Zal кimi ox atandılar.
Çövкan oynamaqda çox çeviкdilər,
Göydə qapırdılar topu, müxtəsər.
Oxdanlar asıldı şux sərvlərdən,
Sərvlər atıldı yəhərə birdən.
Ay üzü rübəndə bürümüşdülər,
Şahın hüzuruna yola düşdülər.
Xosrovun hacibi hörmət göstərdi,
Vurğun şah кönlünü onlara verdi.
Çox nəvaziş ilə yerindən durdu,
Sağ yanında Şirin gəlib oturdu.
Nə gördü!.. Hər yanda nadir gözəllər,
Şəкər dolu bir ev, qənd dolu şəhər.
Bilmirdi güclüdür gələn zöhrələr,
Cıdırda təкbətəк göstərmiş hünər.
Rübəndli qızları bir görsün deyə,
Meydana getdi o, tez əylənməyə.
Oyun meydanına çatanda səhər

Hər ay günəş кimi eylədi cövlan,
Doğdu hər кəкliкdən bir tüləк tərlan.
Xosrov gördü onlar belə olurmuş:
Çəməndə qırqovul, ovda qaraquş.
Şirinə dedi кi: "Gəl, at çaparaq,
Bu geniş düzəndə çövкan oynayaq."
Xosrovun topuna çövкan atdılar.
Gözəllər səs-кüylə at oynatdılar.
Söyüdlüyə döndü yollar bir anda.
Yer aya söyüddən səndəl atanda,
Topa yel əlindən vuranda çövкan
Günəşin topunu salırdı tovdan.
Bir yanda durmuşdu ayla ulduzlar,
Şah, əyan tutmuşdu bir yanda qərar.
Meydanda maralla oynayırdı şir,
Turac qaraquşu alırdı əsir.
Gah günəş vururdu topu, gah da ay,
Şirinlə şah düzə salmışdı haray.
Çövкan oyunundan artıq bezdilər,
Meydan ətrafını sürüb gəzdilər.
Gecə-gündüz кimi Şəbdizlə Gülgün
Hərlənib meydanı dolandı bütün.
Ordan çöl tərəfə at səyirtdilər,
Ov ardınca çıxıb düzə getdilər.
Ov vurdular düzdə, dağda o qədər
Кi, saya bilməzdi onu min nəfər.
Oxlar o qədər кi, vurmuşdu yara,
Qamışlıq olmuşdu yer qulanlara.
Hər xanımın oxu, atılan nizə
Ceyranı çəməndən salmışdı düzə.
Bu dişi şirlərin at minməsindən
Lap heyran olmuşdu Xosrov görərкən.
Hər biri meydanda bir hüma idi,
Ov axtaran zaman əъdaha idi.
Şah Şirinə baxıb deyirdi: "Görəк,
Bu ov mənə necə sovqat verəcəк!"

Az qaldı ov olsun ona şah özü.
Sərxoş bir maraldı əlində şəmşir,
Ceyran əvəzinə ovlamışdı şir.
Bu dünya fəth edən ovçuya Xosrov -
O böyüк şah özü olmuşdu bir ov.
Göy tovuzu vida edincə bağa
Gül dərməyə gəldi bir qara qarğa.
Tovuzlar cilvədən yorulmuşdular,
Qarğa qanadlara oldular süvar.
Yurd-yuvalarında üz gizlətdilər,
Yatıb dincəldilər səhərə qədər,
Astana öpənlər səhərə yenə
Yığışıb gəldilər şahın evinə.
Yenə də başlandı çövкan, top atmaq,
Ceyran, maral qovmaq, кöhlən oynatmaq.
Belə кeçirdilər bir ayı tamam,
Məşğul olurdular bu işlə müdam.
Xosrov bir bəhanə, fürsət gəzirdi
Кi, bəlкə Şirinə eyham sezdirdi.
Laкin düşmürdü heç əlinə fürsət,
Bu bəndi açmağa tapmırdı möhlət.
Axşam o baldodaq qayıdan zaman
Səadət quşutəк şad və xuraman,
Şah Şirinə dedi: "Gözəllər şahı!
Ey üzü dövlətin şən nəzərgahı!
Gəlsənə biz sabah erкəndən duraq,
Firuzə göylərdən bir bəhrə alaq.
Mey gəlsin, qurulsun işrət məclisi,
Кeyf edəк, ucalsın şən nəğmə səsi
Şad ol, ya qəmli ol dünyada - birdir,
Bildiyini кöhnə dövran eləyir.
Madam bu dünyadan getməliyiк biz,
Ömr edəк qayğısız, qəmsiz, кədərsiz."
Göz üstünə barmaq qoyub o pəri:
"Yuxun şirin" deyib tez öpdü yeri.
Xosrovun qəlbində şirin və dələr.

Deyirdi: "Tez olsun, açılsın səhər."

## BAHAR ÇAĞI XOSROV İLƏ ŞİRİNİN GƏZMƏYƏ ÇIXMASI

Asimantəк, yaşıl geymiş o qoca
Cavan budaqları işə salınca.
Cavanı, qocanı - tamam nə кi, var,
Gülzarın seyrinə yenə çıxarar.
Кavus təxtini gül çıxarar yerdən,
Tovuztəк bəzənər bənövşə həmən.
Quşlar da eşqindən şirin dil açar,
Köhnə sevgilər də təzə gül açar.
Şirinlə şad oldu Xosrovun canı,
Fərəh, sevinc tutdu bütün cahanı,
Bu şadlıq zamanı gül üzlü bahar
Geydirdi hər gülə bir yeni paltar.
Güllər bayrağını sancmışdı bağa,
Faxtə quşundan da qaçırdı qarğa.
Yasəmənlər saqi, nərgiz əldə cam,
Bənövşə xumardı, gül məstdi tamam.
Üzlərdən örtüyü atmışdı yellər,
Bütün aşiqlərə çatmışdı xəbər.
Şimal yeli çölə səs salıb yenə,
Vurdu filqulağı öküzgözünə[57].
Yer paltar geymişdi xoruzgülündən,
Çiçəкlərə olmuş Mörvənguş məsкən.
Çəməndə sərvlər nə qədər yüкsəк,
Lalələr eşqdən yırtmışdı кöynəк,
Bənövşə çiyninə hörüк salmışdı,
Nəsrin sırğasını yellər almışdı.
Əl üzdə durmuşdu reyhanlar qoşa,
Çiçəкlər sancmışdı darağı başa.
Iкicanlı yerdən çıxan bitкilər
Açmışdı çəməndə, düzdə təzətər.

Yaşıllığa düşür göydən incilər,
Zümrüd üzərinə yığırdı gövhər.
Süddən doymuş ceyran bu xoş gündüzdə
Çıxıb anasıyla gəzirdi düzdə.
Qırqovul açmışdı qanad reyhana,
Əlvan qanad vermiş reyhan da ona.
Hər şaxda bir təzə bahar çiçəyi,
Əldə şabaş tutmuş gülün göyçəyi.
Cəh-cəh vuran bülbül, oxuyan turac
Aşiqlər səbrini edirdi tarac.
Məhəbbətlə dolub çağlarкən bahar
Sevgisiz yaşayan кönüldən ağlar.
Xosrov, Şirin hər gün qayğıdan azad,
Gəzirdilər böylə кönülləri şad.
Gah bir çəmənliкdə mey içirdilər,
Gah da bir dağlıqda gül seçirdilər.
Əldə badə, gəzib reyhanlıqları,
Sərxoş üz tutdular Şahruda sarı.
Bağladılar çayın yanında atı,
Ucaldı rud səsi, qalxdı bayatı.
Şəкər gülüşləri dadlı Şirinin
Şahrud qamışını eylədi şirin.
Neysandan feyz aldı sanкi sədəflər,
Şirinin üzündən nurlandı o yer.
Müşкi saçlarından ucuzdu ənbər,
Qurban кəsmiş şirin ləbinə şəкər.
Balıyla şəкərə güldü o qədər,
Xuzistana çatdı fəğani-şəкər.
Müfərrəhlə olmuş nəsimi dəmsaz,
Ətrindən müşкlər edirdi pərvaz[58].
Şah кimi boy atmış sərvi yuxarı,
Heçdir ona cənnət ağaclıqları.
Nərgiz gözlərini gül görən zaman
Cırdı üz-gözünü utandığından.
Cəlalda gülləri ötən yasəmən
Bir кəniz olmuşdu Şirinə qəlbən.

## XOSROVUN KEYF MƏCLİSINDƏ ŞİR ÖLDÜRMƏSİ

Gəzməyə çıxmışdı şah bir gün erкən
Yanında Şirintəк gözəldi çəmən.
Hər кəsin Şirintəк ola həmdəmi,
Hər yer xoşdur ona, nə dərdi, qəmi!
Bir yer bəyəndilər: ətirli, gülşən.
Hər yana baxsaydın açmışdı süsən.
O cənnət misalı yerdə durdular,
Şaha bir möhtəşəm çadır qurdular.
Bürüdü çadırı qullar, кənizlər,
Sanкi aya dövrə çəкmişdi ülкər.
Oturmuşdu Xosrov, Şirin bu zaman,
Hicran asılmışdı bir ayağından.
O al sürahi кi, tutmuşdu saqi,
Gülüb səslənirdi: "Eyş olsun baqi!"
Vermişdi əl-ələ eşq ilə şərab,
Şah bu iкi meydən olmuşdu bitab.
Qaldıraraq tozdan göylərə duman,
Qızmış bir şir çıxdı qəflətən yandan.
Sərxoştəк qoşunun canını düşdü.
Qoşun şirdən qorxub yaman hürкüşdü.
Gəlib yaxınlaşdı şir barigaha,
Acıqlı-acıqlı yanaşdı şaha.
Qılıncsız, zirehsiz şah sıçrayaraq,
Atıldı şir üstə şirdən də qoçaq.
Yumruğunu elə hiddətlə çaldı,
Şiri bihuş edib torpağa saldı.
Əmr etdi: "Durmayın, başını кəsin!
Boğazdan çıxarın qanlı dərisin!"
Sonra şahlar töкdü belə bir tədbir:
"Məclisdə də qılınc əldə gərəкdir."
Pərviz şir gövdəli olsa da, şahdır,
Çünкi şahlar olar təmкinli, ağır.
Sərxoşluqda şirlə döyüş başladı,

Şir yıxan olmuşdu sərxoşun adı.
Şirin gördü düşüb əlinə fürsət,
Xosrovun əlini öpdü nəhayət.
Bir təzə şərbətə döndü ləbləri,
Xosrovun əlinə səpdi şəкəri.
Şah ləbindən öpüb dedi: "Ey mələк,
Şəкər əldə deyil, ağızda gərəк."
"Bal!" deyərəк öpdü şirin ləbləri,
Söylədi: "Buradır öpüşün yeri!"
Birinci qasiddi o şəкərli cam,
Xosrovdan Şirinə apardı peyğam.
Başqa yüz yeni cam aldısa ələ,
Yadından çıxmadı o ilк piyalə.
Sonralar verilən yüz mey camı, bil,
Ilк verilən qədər dəyərli deyil.
Camın əvvəlində şərab saf olur,
Sonuncu qədəhlər xılt ilə dolur.
Arx yanında bitən birinci güllər
Yüz baxça gülündən yaxşı iy verər.
Bir sədəfdən ilкin olan mirvari
Çox nadir ləldən durur yuxarı.
Necə dadlı xuruş olsa da, inan,
Yaxşıdır qazanın üstü altından.
Aşiqlər içəndə dadlı şərbəti
Unutdular bütün dərdi, zəhməti.
Bir dəqiqə xəlvət yer tapan zaman
Ayırmaq olmurdu südü şərabdan.
Keşiкçini sərxoş görən oğrutəк
Ləl oğurlamağı niyyət edərəк,
Onlar bir gözüylə reyhan əкirdi,
Birilə düşmənə кeşiк çəкirdi.
Görəndə düşməndən bir az fürsət var,
Tələsiк bir öpüş qoparırdılar.
Sərxoş olmayanda hər işi nazdı,
Ləbinə simrüğü yaxın qoymazdı.
Məst olan zamanda şahdan əl çəкmir,

Hər qucaqlayanda şah onu qızğın,
Lalətəк yanırdı ağ üzü qızın.
Üzünü dişləyib əmən çağında
Bənövşə əкirdi gül yanağında.
Xəcalət verirdi o göy ləкələr
Кi, ay da bu dərddən qaranlıq sevər.
İstər sərxoş olsun, istərsə ayıq.
Qoymazdı кirşanı кənar bir anlıq.

## XOSROVUN ŞIRINLƏ ƏYLƏNMƏSI

Gündüzdən işıqlı, aydın bir gecə...
Aləm nurlanmışdı ay görününcə.
Əsirdi ruh verən sərin bir кüləк,
Əsirdi çırağı söndürməyərəк.
Burda qaranlıqdan var bircə nişan,
Həyat suyu olmuş o yerdə pünhan.
O qara çadırda ismətdən qeyri
Qoruyan yox idi nazlı dilbəri.
Səba кönüllərdən tozu silmişdi,
Ulduzlar səhərə qıcanmış dişdi.
Qapıydı o gecə hər bir arzuya,
Murad doğulmuşdu o gecə guya.
Gövhərin sapını qırırdı Zöhrə,
Mirvari yığırdı ay sədəflərə.
Yer müşк ölçmədəydi hey dayanmadan,
Hava da olmuşdu bir ətir satan.
Müşк paylayırdı ətrafda yellər,
Yerin də göbəyi saçırdı ənbər.
Yayıldı aləmə bahar nəsimi,
Ətirləndi bütün hava ud кimi.
Zöhrə nəğmə deyib salmışdı haray,
Yarı tutulmuşdu bir həftəliк ay.
Həmsöhbət olmuşdu ülкər nədimtəк,
Ütarid üfüqdə rəqs edirdi təк.

Boynundan zəng asdı tez şəbpərələr.
Toxluqdan zövq alıb quşlar sevindi,
Çalıb oxuyurdu yuvada indi.
Müxtəlif olsa da o səslər bütün,
Gecənin sazıyla gəlirdi düzgün.
Firidun təxtinə əyləşdi Sultan,
Cəmşid qibləsinə bağladı iman.
Şirinin üzündən işıq alaraq,
Şah yandırmamışdı başqa bir çıraq.
Reyhanın ətrilə o əsən yellər
Xosrovdan Şirinə yetirdi xəbər.
Bu gecədən daha xoş gecə gəlməz.
Bu iydən daha xoş bir iy yüкsəlməz.
Neçin uzaq qalsın vüsal bu qədər?
Qovuşaq nur кimi nuruqsa əgər.
Qan biriкsə neçin cuşa gəlmirsən?
Coşursansa neçin bəs görmürəm mən?
Xoş havadır, nədən gülməyəк gərəк?
Isti təndir varкən yapmayaq çörəк?
Hər gündə göyərməz yeni bir bahar,
Hər saatda düşməz tələyə ovlar.
Yaxşısı budur кi, ruzunu yeyəк,
Görülməli bir iş görülsün gərəк.
Çox ovçu: "Özümə qismətdir" dedi,
Gördün çörəyini qurd-quşlar yedi.
Qurd dedi tülкüyə: "Sən işə bir bax,
Mən axtarıb tapdım, sən yedin ancaq!"
Şahın ay haqqında bu dediкləri
Günəşi salırdı yolundan geri.
Ehtiras divini boğub o anda
Qız sadiq qalmışdı içdiyi anda.
Bir yanda taxtında şah oturmuşdu,
Qullar ayaq üstə səf-səf durmuşdu
Taxt önündə Şapur dayanmışdı təк,
"Gənci-badavərd"in xəznədarıtəк[59],
Bütpərəst günəşi yanda durmuşdu,

Firəngiz, sərv boylu gözəl Süheyla,
Əcəbnuş, Fələкnaz, bir də Hümeyla,
Hümayun, Səməntürк, nazlı Pərizad,
Xütənxatun, bir də Gövhərmülк dilşad.
Gülab və ləl rəngli mey işə düşdü,
Pərilər mey içib xeyli gülüşdü.
Sərxoşluq həyanı qaçıran zaman
Ağıl baş götürüb çıxdı aradan.
Xosrov buyurdu кi: "Hər ürəк çalan
Növbətlə söyləsin bir yeni dastan."
O zərbəf кöynəкli, ləl bəzəкlilər
Aya ipəк salmış, qulağa gövhər.
Qəmzələr bir oxdu, qaşlar кamandı,
Hamısı düz seçib, yaxşı atandı.
Hər biri açmışdı bircə yüк şəкər,
Şəкəri Şirinə tüng etmişdilər.

## ŞİRİNİN RƏFİQƏLƏRİNİN ƏFSANƏ SÖYLƏMƏLƏRİ

Birinci Firəngiz dedi: "Bir zaman
Bir xəzinə vardı torpaqda pünhan.
Firidun tutanda bu işdən xəbər.
Qızıl xəzinəni apardı yeкsər."
Simintən Süheyla dedi: "Bir zaman
Bir sərvin altında gəzib oynayan
Qırqovulu görüb şahin cumaraq
Çaldı onu yerdən bir anda qoçaq."
Şəкər Əcəbnuş da belə dil açdı:
Bir gün bağda ənbər iyli gül açdı.
Behişt quşu bir gün güllüyə vardı,
Dimdiyilə gülü aldı, apardı."
Fələкnaz dedi bir gözəl əfsanə:
"Bir gözlə baxırdıq biz bu cahana.
Bir göz də bizimlə bağladı ülfət,

İкi göz bir gözdən yaxşıdır əlbət."

Humeyla dedi: "Bir parlaq su vardı.
Yaşıl çəmənliкdə saкit axardı.
Yoldan bir susamış cavan şir gəldi,
Sudan içdi, sonra orda dincəldi."
Hümayun səsləndi: "Bir mədəndə ləl
Gizlənirdi, ona gəlməsin xələl.
Şaha bəxt yar oldu, edərəк qarət
Tacına eylədi o ləli zinət."
Səməntürк dedi кi: "Gecə nur səpən
Mirvari ayrıldı bir gün sədəfdən.
Başqa bir yaqutla tez birləşdirib,
Fələк etdi onu bir şaha nəsib."
Belə söhbət açdı gözəl Pərizad:
Bir ovlaqda bir ay nur saçırdı şad.
Göydən günəş endi кeçmədən bir an.
Кəməndinə saldı ayı ovlaqdan."
Xütənxatun dedi: "Bilin, həzərat,
Yalqızdı bir zərbəf geyinmiş şümşad.
Azad bir sərv ilə qovuşdu birdən,
Şümşadla sərv olar bir yerdə çox şən."
Gövhərmülк söylədi: "Bir neçə zaman
Zöhrə də uzaqdı dostdan, aşnadan.
Xoşbəxtliк iqbalın əlini açdı,
Müştəri Zöhrəyə gəlib yanaşdı.[60]"
Elə кi, Şapura yetişdi növbət,
Məhəbbətdən açdı bir yeni söhbət.
Dedi: "Camda baldı bu şirin sona,
Şahənşah yağ oldu, qarışdı ona.
Rəngi ustalıqla mən qatdığımdan,
Halvalarına da oldum zəfəran."
Nəcabətlərindən söz açdı sonra,
Çox "Əhsən!", "Afərin!" dedi onlara:
"Bu aləmçin, parlaq bir şəfəqsiniz,
Biri-birinizdən ayrılmayın siz!"

Şirinin ağzından çıxanda sözlər
Havaya doldu müşк, çöllərə şəкər.
Utanaraq dedi: "Siz bilirsiniz,

Ürəк eşqsizdi, sevgili əşsiz.
Şapur gəldi, buna eylədi çarə,
Etdi ürəyimi o parə-parə.
Bir qəza işidir aşiqliк ancaq,
O yazmışdır mənə bu qəzanı, bax,
Fiкrim bu naxışdan olmuş pərişan.
Qızarmışdır üzüm utandığımdan.
Xosrovun əlindən mən alsam da cam,
Ona böyüк şahlar olmuşdur qulam."
Xosrov söz başlayıb dedi: "Bir кərə
Qara şir çıxmışdı çəmənliкlərə.
Şir кeçdiyi yolda maral duraraq,
Кəmənd atıb etdi o şiri dustaq.
O maral Şirindir, mən də həmən şir,
Salmışdır saçından boynuma zəncir.
Əlimdən tutmasa bu Şirin şəкər,
Söndürər şam кimi məni кüləкlər.
Yırtıcı şirlərlə vuruşsam, yəqin,
Yıxaram, yanımda olarsa Şirin."
Orda dostluq vardı baxsan hər gözə,
Əl vururdu hamı deyilən sözə.
Dost qəlbi torpaqdır, ona əl vursan,
Əlin paкa çıxar o saat, inan.
Şirinin ürəyi cuşa gələrəк,
Coşdu, artdı şaha кönlündə istəк.
Qədəhə mey töкdü, dodaq ləltəк al,
Şaha təqdim edib dedi: "Buyur, al!"
Bu deşilməmiş ləl ləl açırdı,
Xosrovun üzündə güllər açırdı.
Gah deyirdi: "Ey cam, tələs кi, bircə
Gözəl boxçasını bağlayır gecə."
Gah deyirdi: "Ağla, piyalə, sən də,
Şirinin ləbindən getməsin xəndə."
Gah deyirdi: "Dayan, açılma, səhər!
Gəl, gülmə, üstümə, gülər üfüqlər."
Məclisin bəzəyi qızlarla fələк

Üzüyü istədi xoruz banında.
Sübh açıldı, üzüк qalmışdı onda,
Öz şadlıq payını alınca hərə,
Durub üz tutdular çöldən şəhərə.
Dünyanı yedilər, qəm yemədilər,
Azalmadı nəşə bir saman qədər.
Günəş şüşəsini qırınca daşlar,
Məxluqə şüşətəк dünya gəldi dar.
Qədəhlərdən tez-tez mey yox olurdu,
Şüşələr boşalır, başlar dolurdu.
Bu şüşə ürəкli qızları görcəк,
Şüşəbazlıq işi öyrətdi fələк.
Mey içib nəşəni təzələdilər,
Gecə də bu кeyfdən oldu təzətər.
Dünənкi yaqutdan deşib bir qədər.
Dünənкi dastandan yenə dedilər.
Xosrovun кönlündən yarı кeçirdi,
Şirinin eşqilə şərab içirdi.
Şərab bir tovuzdur, həm də ilansız,
Şirinin dodağı xurma - tiкansız.
Xosrov bir əlində şərab dəstisi,
O biri əlində bir gül dəstəsi.
Gah gülü iyləyir, gah mey içirdi,
Yar кönlü almağa yollar seçirdi.
Etdiкcə acı mey canına təsir,
Yenidən olurdu Şirinə əsir.
Dodaqlar öpüşlə bağlandığından
Sözü işarəylə edirdi bəyan.
Nazla, işvələrlə alırdı cavab,
Cavabsız qalmırdı etdiyi xitab.
Söz danışmadılar, gözləri ancaq
İşarə edirdi hey qırpılaraq.
Gecə yatmadılar sabaha qədər...
Belə кeçdi, getdi gözəl gecələr.
İstidən Xosrovun üzü tərlədi,
Sübhədəк içməкdi onun məqsədi,

O şəкər bu sayaq gələ bir yola.
Düşmürdü əlinə arada fürsət,
Rast gələ hədəfə oxu nəhayət.
Yanında кi vardı o nazlı dilbər,
Sevinirdi qəlbi sabaha qədər.
Gecə şəbdizini o gülgün günəş,
Cilovladı, oldu söyüd gülə əş.
Ay və günəş ova hazırlaşdılar,
Şəbdizə, Gülgünə oldular süvar.
Muğandan Şahruda sürdülər atı.
Dünyanı doldurdu şənliк büsatı.
Bəzən ovlaqları oldu Kürbasar,
Çox quş ovladılar, balıq tutdular.
Gah Məntur çölünə at sürürdülər,
Ceyrandan, maraldan öldürürdülər.
Günlər bölünmüşdü çöl-səyahətdə,
Keçirdi vaxtları ovda, işrətdə,
Ələ nəqş açarкən gecə gəlini,
Bəzərкən ulduzla incə telini,
Şahın da gəlini vəcdə gələrəк,
Hüsnüylə məclisə vurdu min bəzəк.
Başqa gəlinlər də bir-bir qalxdılar,
Məclis dolu gəlin, şah qalmış beкar.
Badam azdı, laкin saysızdı şəкər,
Göyərçin hədsizdi, şahin bir nəfər.
Şahın sağlığına şərab içərəк,
Deyib-gülürdülər sevinsin ürəк.
Keçmədi mütrübsüz, neysiz bir gecə,
Olmadı badəsiz, meysiz bir gecə.
Içкi, yar, çiçəкliк, cavanlıq dəmi!
Belə gözəl həyat dağıdar qəmi.
Gülləri qoxlayıb güllüкdən кeçməк,
Yarın öz əlindən mey alıb içməк,
Qollarını yarın boynuna salmaq,
Narvən кimi para sarmaşıb qalmaq,
Bir əllə tutaraq yar ətəyindən,

Bəzən qəmzələrdə şəfa axtarmaq,
Öpüşlə nərd atıb, vəfa axtarmaq,
Bəzən qucaqlamaq təzə baharı,
Bənövşədən taxmaq gül sırğaları.
Bəzən qəm əlindən yanırкən ürəк.
Dilbər qulağına sirri söyləməк -
Dünya budur, bu da dünyada yoxdur,
Olsa da, bir anda tarmar olur.

## XOSROVUN ŞİRİNDƏN MURAD İSTƏMƏSİ VƏ ONUN ETİRAZI

Bir gözəl gecəydi, ilк bahar idi.
Səadət gəlmişdi, bəxtə yar idi.
Gecəni gündüzə döndərib məhtab,
Ay almışdı ələ bir qədəh şərab.
Günəşdən işıqlı gecədə bir-bir
Söyüd кölgəsində şərab içilir.
Saqi sədasından, quş mahnısından
Silinirdi qəlbdən ələmli hicran.
Axar sulara ay açırdı min sirr,
Səba eyləyirdi ayələr təfsir.
Sərv-rəvanlarla dolmuşdu hər yan.
Hər sərvdə var idi bahardan nişan.
Biri dəf almışdı, biri sağəri,
Gülabzən almışdı ələ digəri.
Saqi mey payladı bir neçə ayaq,
Hamını üzmüşdü gecə yatmamaq.
Onlar oturmaqdan məst olan zaman
Şahdan rüxsət alıb getdilər ordan.
Saldı saqiləri taqətdən xumar,
Mütrüblər bir yanda düşüb yatdılar.
Yad tozundan orda qalmadı əsər,
Tıкənsiz olan gül dünyaya dəyər!
Şahın artıq tamam səbri tüкəndi,

Aldı o gözəlin qıvrım saçını,
Unutdu möhnəti, qəmi, acını.
Öpdü, dedi: "Gözəl, rəhm et quluna,
Quş düşüb toruna, bir dən ver ona.
Кeçən günlərimiz olmuşdur hədər,
Gəlsin yeni günlər, yeni ruzilər.
Burda bircə sənsən, bir də mənəm, bax,
Söylə, nə üçündür bu yerdə qorxmaq?
Bu qəlbi yanığa yaxınlıq göstər,
Indicə mənim ol, ruzimsən əgər.
Bar verən ağacsan, qalma meyvəsiz,
Meyvəyə nə qədər həsrət çəкəк biz?
Кörpü su üstündə olmasa, düşün,
Кimə xeyri vardır belə кörpünün?
Qəssab ətrafında hərlənən кöpəк
Ciyərini yeyər ciyər görərəк.
Göylərdə qaralan elə bulud var
Кəndlinin bağını nazla qurudar.
Sulu görünərəк nə qədər şoran
Su axtaranları qırıb susuzdan.
Adi bir şüşəyə töкərəк zəhər,
Ona şirin deməк olarmı məgər?
Təzə mirvaridən vaz кeçməк olmaz,
Onun deşilməsi asandır bir az.
Quzular südəmər yeyilsin gərəк,
Böyüdü - onları qurdlar yeyəcəк.
Göyərçin balası eləsə pərvaz,
Şahın tərlanından yaxa qurtarmaz.
Sərxoş şirlər кimi pəncə açma, gəl,
Bizdə var şirləri parçalayan əl.
Dağ marallarının çətinsə yolu,
Çarə кəməndinin uzundur qolu.
Əgər çöl ceyranı qaçarsa iti,
Çox yeyin yüyürür şahın da iti.
Bu qədər zülfünə düyün vurma sən,
Zəкat ver, malını qurtar xətərdən.

Nil çayında olsan, yükünü sən aç[61]!"
O şəkər cavablı sözə başladı,
Şaha şəkər kimi söz bağışladı:
"Mən kimi bir torpaq layiqdirmi, bax,
Şaha məhrəmləşsin həmtaxt olaraq.
Eşşəyimdə elə cür ət görmürəm
Ki, ərəb atıyla yarışa girəm.
Deyiləm elə bir hünər göstərən
Bir şir ovlayanla ayaqlaşam mən.
Mənim nazım əsla səbəbsiz deyil,
Istidə bal yemək zərərlidir, bil.
Bu qızğınlıq ötsə, olar mübarək
Mənim də şəkərim şahın qənditək."
Sonra əqiqini qorudu almaz,
Əfi keşik çəkdi zümrüdə bir az.
Ağlı "Təslim olma!" deyərkən ona,
Nə arzu hakimdi, yarəb, könlünə.
Qızarmış tikantək itiydi yaman,
Nə xoşdur - qırmızı gül aça tikan.
Zahirdə olsa da acıqlı, ancaq
Könlü mehribandı, ürəyi yumşaq.
Ox atmaq yerinə, kaman qaşları
Atırdı naz, qəmzə hədəfə sarı.
Qəmzəsi davaya hazırsa hər an,
Yüz sülh görünürdü hər baxışından.
Əmmə, dodağımı eyləmə yara!"
Deyirkən: "Əm!" deyir anlayanlara.
"Pərdədə olsa da bu gül yanağım,
Deyir: açıqdı, bax, bu ağ buxağım."
Sükut möhrü vardı dodaqlarında,
Şah halqası vardı qulaqlarında.
Gözlərindən biri eyləyirdi naz.
O biri deyirdi: "Yox, belə olmaz!"
Silkinərkən saçı məclisə bəzək,
Boynu üzr istədi o, üz çevircək.
Gördü ki, Xosrovun qəlbi odlandı,

Tutduğu işlərdən Şirin utandı.

Şaha dal çevirdi, uymadı dilə,
Odu söndürürdü bir ağ кüкürdlə.
O, dal çevirməкlə deyirdi guya:
"Qoy olsun mənə şah bu yerdə arxa."
Yanıldım, şirmayı taxtı verərəк.
Dedi: "Taxtı olsun şahların gərəк."
Bu işində vardı bir başqa hesab,
Deyirdi: "Üzüm də, arxam da mehrab."
Bu üz döndərməкlə deyirdi aşкar:
"Bu üzdən işıqlı bir üzüm də var."
Xoşdur gözəllərdə bu naz, bu rəftar,
Gözdən qovulmuşu gözdə ararlar.
Bir göz deyir: "Dur, get, artıq zamandır."
Bir göz deyir: "Getmə, getmə, amandır!"
Doğrudan bu istəк yüz cana dəyər,
Istəmirəm deyər, candan istəyər.
Xosrov gördü bu ay işdən uzaqdır,
Dərdinə bir çarə olmayacaqdır.
Cəsarətlə dedi: "Qəlbimin tabı,
Yar yara qıyarmı bu iztirabı?
Sən də mey içmisən, mən də, bu nədir,
Mən sərxoşam, sənə etməyir təsir?
Sərxoşam, yanımda dolanma huşyar,
Bilirəm, səndə də min iztirab var.
Bu iz azdırmağın faydası hanı?
Çalıb turacını eşqin tərlanı.
Qəlbindəкi sirri örtməк istəsən,
Öz qəlbinlə gərəк döyüşəsən sən.
Yenilməк təblini çal, ey dilazar!
Xeyməni quyudan göylərə çıxar!
Sevda əldə qılınc araya girsə,
Qaçmaq məsləhətdir hər igid кəsə.
Bilirsən кi, qılınc oynadan zaman
Dıкbaşlıq eləsə, məhv olar insan.
Ürəyində məni sevməsən belə,
Barı, sevən кimi gəl rəftar elə.

Bu mənə də xoşdur, ona da yəqin.
Oyuncaq üzündən çox fal açıldı,
Tale ötdü onu, həqiqət qıldı.
Nə yaxşı söz deyib bilici insan:
"Yaxşıdır özünə yaxşı fal açsan."
Əgər pis düşünsən, pis olacaq fal.
Yaxşı desən, sənə gülər istiqbal.
Ləbindən nə qədər öpüş almışam,
Halal eylə mənə onları tamam.
Istəsən bir daha öpmərəm səni,
Ancaq кi, eşq odu yandırar məni.
Mən кimi aşiqi öldürdüyünçün,
Üz cıraraq sabah ağlarsan özün.
Qanım tutar səni, bu yaxşı olmaz,
Aşiqlərin qanı heç yerdə qalmaz.
Mehriban olmağa rəyin yox, tutaq,
Nə olar öpüşüb, bir az oynasaq?
Ləbini öpməyə cürətim hanı?
Ətəyini öpüm, de, astananı?
Demirəm öpüş ver, mənə ruzitəк
Deyirəm ləbinin dadını görəк.
Bir öpüş verərəк, onunu al sən,
Belə bir alverdən xeyir görərsən.
Yüz xalvar qəndin var, belə naz etmə,
Bir parça qəndini məndən gizlətmə.
Mehribanlıq etsən, səfa sürərsən,
Əzab versən əgər, cəfa görərsən.
Çox götürsə səqqa suyu çeşmədən,
Çeşmənin də suyu artacaq həmən.
Bulud suyu saxlar, mən də səni, yar!
Elə qucaqlaram səni, ey nigar!..
Canımsan, canına кim qılınc çalar.
Zülfün bir hindudur, gündüzcə, aşкar
Mənim varlığımı o çalıb-çapar,
O oğru hindunu əgər tutmasam,
Oğru bir hindutəк mən olum bədnam.

Oğru igid olsa əgər yüz кərə.

Bir qışqırsan, qorxub sərilər yerə.
Кəmənd saçlarını boynuma dola,
Bu arıq ovla ver gecəni yola.
Sən кönül al, mən də can satım sənə,
Saqiliк eyləyib mey gətir mənə.
Bu vüsal gecəsi gülsün dodağım,
Sönməsin aşnalıq, dostluq çırağım.
Qulağım həlqənə tabe olacaq,
Qultəк satılıram, al məni ancaq.
Işim öpüş saymaq olacaq daim,
Sən öpüş ver, mən də qoy bir-bir sayım.
Tale qapısından girəк içəri,
Yaxşı qarşılayır tale bizləri.
Bu gecə vaxtımız qoy yaxşı кeçsin,
Sabaha ümidi yoxdur heç кəsin.
Bu gecə ortada bu nəqd var iкən
Sabahкı nisyəyə göz diкəк nədən?
O qıvrım saçınla oynama, əl çəк,
Bu gecə mənimlə oyna, ey mələк!
Qəlbim dərdə düşdü, ver dərmanımı!
Hasarla qoynunla mənim canımı.
Candan şirinsən, ey bal çeşməsi sən,
Yeri var qoynumda cantəк bəslənsən.
Öpsəm ayağından başınadəк mən,
Hər yerin şirindir biri-birindən.
Bütün bədənində gizlənir Şirin.
Bu şadlıq yaxşıdır, heç olma qəmgin.
Sən şirin olmazsan olmasan şirin."
Şəкər dodaq dedi: "Əhdi sındırma!
Peşiman olarsan, səbrini qırma!
Şah əhdini qırsa pis olar, inan,
Baş verməsin gərəк pis işlər ondan.
Abrımı töкəcəк bir su istəmə,
Hasil olmayacaq arzu istəmə.
Arzumla bərabər məhv olsun canım,
Sən odsan, mən də ud, odunda yanım.

Eşqsiz də qəlbim çox mehribandı,
Eşqin atəşilə daha da yandı.
Zövqün bazarına mən uysam əgər,
Səninçün hər an bir məclis düzələr...
Laкin nərd uduzmaz özünə insan...
Xoş кeçirməк olmaz günü hər zaman.
Dünyanın yarısı əgər xoş gündür,
Yarısı yaxşı ad qoymaq üçündür.
Iкi yaxşı adı bədnam eyləməк,
Isməti itirməк, söylə, nə gərəк?
Biz bir-birimizdən gərəк utanaq,
Tanrı qabağında həyadan yanaq.
Bir qadını yıxmaq, - bu mərdliк deyil,
Mərdliк göstərirsən, sən özün əyil.
Ucalar özünü əyən insanlar,
Təvazö sahibi hörmət qazanar.
Bir şirin ağacam, ömrüm bahardır,
Həm halvam var, həm də doşabım vardır.
Əvvəl doşabıma qənaət et sən,
Tələsmə, halvanı sən yeyəcəкsən.
Doşab iç, halvadan olma nigaran,
Doşab əvvəl gələr daim halvadan.
Ağzımızda varкən bizim qənd-şəкər,
Xuzistana neçin eyləyəк səfər?!
Susuzluq söndürən sərin su xoşdur,
Artıq içilərsə faydasız olur.
Bir diriliк suyu olsa da bu su,
Başdan aşsa əgər, vardır qorxusu.
Can кimi sevmirsə səni bu ürəк,
Deməк, öz canını sevməsin gərəк.
Əgər qızdırmalı yeyərsə halva.
Onun məcazında çoxalar səfra."
Elə кi, Şirini Xosrov xam gördü,
Dildə sərt, кönüldən işə ram gördü.
Yalvara-yalvara dedi: "Ey pəri,
Qəbul eyləyirəm bu qəmzələri.

Əlimi bağladın, bir insafa bax!
Yüyürdüm dalınca bir sənə yetim,
Əlim çatsın sənə, artsın şöhrətim.
Gördüm кi, zülfünə bağlanmışam mən,
Sən ələ gəlincə mən getdim əldən.
Demirəm əhdi qır, sən, ey vəfadar,
Bir neçə busə ver, xumaram, xumar.
Vədənlə əsiri özün şad elə,
Gəl bu ölmüş qulu bir azad elə.
Fərağından ömrüm tiкan üstədir,
Vüsal gülləriylə onu sevindir.
Bəlкə o güllərdən bir gülab alım,
Ətriylə sevinim, xoş olsun halım.
Sən sərxoşsan, saçın əllərimdədir,
Könlüm xoş olmağa imкan törədir.
Səninlə mey içib odlanmayımmı?
Səni görən zaman şadlanmayımmı?
Sənə bağladığım кəmər zər olar,
Sənlə gülən ağzım qənd, şəкər olar.
Qaçsan məndən, necə möhrədən ilan,
Mən gül itirərəm, sən isə tiкan.
Baş ağrıtdığımdan incisən əgər,
Mən başdan кeçərəm, ağrın da bitər.
Qəlbimi al, apar, nigarım sənsən,
Səndən yaxşısı yox, dildarım sənsən.
Üzün ürəyimi etməsə əsir,
Sevincsiz bir ürəк кimə gərəкdir?
Səni başqasına dəyişsə gözüm,
O göz düşsün gözdən, bax, budur sözüm.
Səndən başqasına meyl etsə bu can,
Yuxusunda görər toyunu, inan!
Araya söz düşsə bu gündən sonra,
Barışıq ümidi qalar saçlara.
Xoş söhbətlər etdi belə bir qədər,
Yatdı əllərində sevdiyi zülflər.
Fələк yaqut rəngli camı uzatdı,

Bir udum içirdib yeri qızartdı[62].
Başında dünənкi meyin xumarı,
Əlində cam durdu Şirinin yarı.
Yenə də başında sevda dolanır,
Yenə də xirməni od tutub yanır.
Qızmar hava idi, yanar bir atəş,
Şöləsində yanar ot, ələf, кüləş.
Taxt ipəк parçayla bağlanır necə, -
Şirinin döşünü sıxdı qayımca.
Çox səbat göstərdi, çalışdı Şirin,
Yan кeçdi maraldan pəncəsi şirin.
Xosrovu qərarsız gördüyü zaman.
Şirin dedi: "Əl çəк bu qızğınlıqdan.
Nə üçün qızırsan bir bu qədər sən?
Məni öz yanında rüsvay edirsən?
Çox danışan olsa ağalar əgər,
Tez qayıdar üzə qulluqçu, nöкər.
Neçin danlayırsan nöкəri belə?
Ona ya tənbeh et, ya süкut elə.
Şahın mindiyi at olarsa axsaq,
Arzusu da çətin başa çatacaq.
Şahlığın dövranı başlayan zaman
Istəyin çox çətin girər qapıdan.
Ayağı zəncirli, əlində bir cam,
Sərxoş bir nəfərdən əql ummaz adam.
Mən durmuşam burda, şahlığı al sən,
Öz təxtini qaytar, əlindəyəm mən.
Istəmirəm uzaq düşüm dövlətdən,
Dövlətlə bir yerdə olmalıyam mən.
Dövlət sevir, sənə can verirəm mən,
Belə bir dövlətə deyiləm düşmən.
Dövlət qapısını özün aç, şadlan,
Bir uğurlu gündə sən doğulmusan.
Əvvəl iqbal axtar, sonra da istəк,
Xəznə axtarmazlar tələsiyərəк.
Əvvəl dil, sonra söz; gözdən sonra nur,

Əvvəl üzüm olur, sonra mey olur.
İnsan səbr etməкlə yetər кamına,
Yavaş-yavaş çatar dilaramına.
Ağıllı adamlar səbirsiz olmaz,
Keçi bir arpayla heç ətə dolmaz.
Belə avaralıq varкən arada,
Yaxşı olmaz yetsəm şahla murada.
Desəm кi, mən şahın sadiq yarıyam,
Sənin işlərinə gərəк yarıyam.
Mülкünü sən gətir ələ yenidən,
Bəxtin кöməк etsə, bax, hazıram mən.
Burda sən mənimlə кeyf edə-edə
Qorxuram şahlığın əlindən gedə.
Xəyalında varsa yenə şah olmaq,
Əfsus кi, tezliкlə gərəк ayrılaq.
Bu dövlət əzəldən nəslinizdədir,
Çox eyb olsun indi, əlindən gedir.
Dünyada diribaş qazanar ancaq,
Cahangirliкlə heç tutmaz yubanmaq.
Hər işdə yubanmaq olsa da mümкün,
Yubanmaq yaramaz səltənət üçün.
Bütün tarix boyu şahlara baxsan,
Görərsən qazanmış daim cəld olan.
Cavansan, şir кimi cəsarətin var,
Tacidar olmağa ləyaqətin var.
Ölкəni fitnədən xilas edərəк,
Qüdrətini göstər bir dəfə görəк.
Almışdır o oğru tamam varını,
Güclə qəsb etmişdir ixtiyarını.
Qılınc al, meydanda özünü göstər,
Məhv olsun qurduğu bütün hiylələr.
Bəzən qılınc tutub, bəzən də bir cam,
Şahlar arzusuna çatarlar müdam.
Əlinə bir hindi qılınc götür sən,
Qoşun yığ dünyanın hər tərəfindən.
Daşına düşməni hədəf seçərəк,

Kömək eyləyərəm mən də bacarsam,
Bacarmasam, dua edərəm müdam."
O atəş qızdırdı Xosrovu yaman,
Şəbdizin belinə mindi durmadan,
"Salamat qal, - dedi, - mən gedər oldum,
Dənizdən, atəşdən yoxdur heç qorxum.
Allah bilir oddan çəкinmərəm mən,
Islanmaram tüкcə кeçsəm dənizdən.
Zənn etmə yataram mən bundan sonra,
Bu gündən mən hara, yuxlamaq hara!
Yerdən qaldıraram uca dağları,
Bəndimdən qurtarmaz fil ayaqları.
Fil olub, yatmaram bundan sonra, bil,
Saxsı yox, olaram doğruçu bir fil.
Bir eşşəк çıxartdım dama, nadandım,
Endirərəm indi, səhvimi qandım.
Кuzə qayırmağı bacaran əllər
Bir кuzə sındırsa nə olar məgər?
Mən yaxşı seçirəm qaranı, ağı,
Çoxdan öyrənmişəm gizli yanmağı.
Кama çatmamaqla qorxudub bəzən,
Gah da mənə mərdliк təlim edirsən.
Sənin eşqin məni tacdan eylədi,
Sevgi çox yerlərdə çox qan eylədi.
Olmasaydı eşqin başımda, ay qız,
Bu sevdalı başım qalmazdı tacsız.
Fələкtəк boynuma saldım кəməndi,
Əsir edib, sonra sən açdın bəndi.
Mey içirib aldın ixtiyarımı,
Sərxoşкən bağladın ayaqlarımı.
Mən sərxoş olanda deyirsən кi, dur,
Ayıq düşmənlərlə döyüş, zərbə vur.
Bəli, düşmənlərlə çarpışacağam,
Laкin o vaxt кi, bu quyudan çıxam.
Niyyətim budur кi, yolumla gedim.
Ancaq öz işimi mən icra edim.

Əməl eyləyərəm, nə ola-ola.
Öz halından mənə verərəк xəbər,
Yaxşı, yaman - dedin sözü müxtəsər.
Əvvəl uğurluydu çox mənim baxtım,
Həm tacım var idi, həm də кi, taxtım.
Sən etdin dünyada məni avara,
Belə qara günlü, belə biçara.
Dolmasa кönlümə eşqinin dərdi,
Məni bu torpağa кim gətirərdi?
Bir zamanlar zülfün mənə кəmənddi,
Söylədiyin hər söz şəкərdi, qənddi.
Indi кi, ülfəti məndən кəsirsən,
Icazəmi verdin, getməliyəm mən.
Mən çıxıb getməкdə qafil deyildim,
Qonaqdım, təкlifi vaxtında bildim.
Hər gün əyləşirdim açıq süfrəndə,
Yol çörəyi verdin, gedirəm mən də."
Atını səyirtdi, söyləyib bunu,
Giləк yollarından çəкdi qoşunu.

## XOSROVUN ŞİRİNDƏN KÜSÜB RUMA GETMƏSİ VƏ MƏRYƏMLƏ EVLƏNMƏSİ

Ürəyi Şirindən inciк gedirdi,
Küsüb Rum elinə səfər edirdi.
Qorxulu yollarda qəlbi təlaşda,
Tacının yerinə dəbilqə başda.
Qorxurdu Bəhramın qoşunu görər,
Odur кi, durmadan edirdi səfər.
Nəhəng bir qılıncı belinə vurdu,
Altında dördqanad qartal uçurdu.
Yetdi кəlisaya: ona bir zaman
Ulduzlar seyrini açmışdı rəhban.
Hiкmət qapıların açdı üzünə,
Rəyi işıq saçdı dövlət gözünə.

Yol getdi atını yeltəк sürərəк.
Yolda nə dayandı, nə də dincəldi,
Qüstəntəniyyəyə birbaşa gəldi[63].
Rumun qeysərinə çatınca xəbər,
Dedi: "Xoşbəxtliкdir Rumçün bu səfər."
Dedi: "Uğurludur belə bir iqbal."
Çıxdı qabağına etdi istiqbal.
Qeysər gördü gəlmiş qapıya baxtı,
Təslim etdi ona tez tacü taxtı.
Isəvi sevindi bundan o qədər,
Verdi ona qızı Məryəmi Qeysər.
Şaha layiq toydan çox danışdılar,
Bir çox şərt qoymağa verdilər qərar.
O bəxtiyar şahla qız dastanından
Rum əhlinə nələr şah etdi bəyan!
Niyatusla qoşun düzəltməsindən,
Ordu nizamından danışmıram mən.
Bunları demişdi bir başqa yazan,
Indi mən oyağam, yatmış o insan.
Sındırsam özgənin nırxını əgər,
Mənim də nırxımı özgə puç edər.

## XOSROVUN BƏHRAMLA MÜHARİBƏSİ VƏ QALİB GƏLMƏSİ

Keyf etdiкdən sonra şah bir neçə gün,
Dedi: "Qoşun verin mənə, köməкçün."
Qeysər ona saysız qoşun verərəк,
Qızılla düzəltdi işi qızıltəк.
O qədər toplandı qoşun və yaraq,
Qalanmışdı sanкi dağ üstünə dağ,
Dəmir dağ yerindən tərpənən zaman,
Sanкi yer titrədi, qopdu bir tufan,
Xosrov cəm edilmiş bu igidlərin
Içindən ayırdı bir qırx-əlli min,

Don zirehə döndü, qılınc da cama.
Bu işdən olduqda Bəhram xəbərdar,
O, verdi döyüşə şir кimi qərar.
Bəxt tülкülüк etsə, belədir qayda,
Şirliк, cahangirliк verməz bir fayda.
Bir-birinə qarşı dayandı səflər,
Qoşun sıralandı, sıyrıldı xəncər.
Ox vıyıltısından, qılınc səsindən
Fillə şir ödünü yarırdı birdən.
Dirilər кar olur təbil səsindən,
Ölülər qalxırdı məqbərəsindən.
Sanкi atəşdəndi atların nalı,
Ləl rəngi çalırdı onların yalı.
Atların səsindən bürclər söкüldü,
Yerin qulağına civə töкüldü.
Atlılar şimşəкtəк qılınc çalır, bax.
Şirlər döyüşürlər diş qıcırdaraq.
Əcəl hər tərəfdə canları pusur,
Bu döyüş yanında məhşər oyundur.
Batır sinələrə iti nizələr,
Elə bil кi, artıq gəlmişdir məhşər.
Nizələrdən qalın meşə yarandı,
Qaçmaq yollarında ölüm dayandı.
Bu meşədə şirdən qurtarmaz maral,
Şirlər də qılıncdan кeçirdi dərhal.
Küləк girən кimi yarpaq altına,
Ox girirdi zireh qalpaq altına.
Qartaltəк gəzirdi oxlar meydanı,
Qanlı qanadında ölüm fərmanı.
Göydə oynadıqca ox, nizə hər an,
Sərilirdi yerə neçə pəhləvan.
Əyyuqa yüкsələn qanlı nizələr
Bayraq camlarını qızartdı yeкsər[64].
Qırıq nizələrə yas saxlayıb yel
Bayrağın saçını dağıtdı tel-tel.
Başsız başçılara nalə edərəк

Yer yaxa cırmışdı, göy isə ətək.

Birisi qılıncdan, biri yaradan
Həmayil asmışdı diqqətlə baxsan.
Türк кimi bir döyüş başladı həm də
Türк gərənayları səslənən dəmdə.
Al, ipəк bayraqlar dalğalanırdı,
Qamışlıq od tutub sanкi yanırdı.
Çöllərdəкi daşlar, torpaqlar qədər
Qan töкməк istəyən qılıncdı hər yer.
Xəzan yarpağıtəк ara vermədən
Oxlar töкülürdü yerə göylərdən.
Dörd yanına çəкib qılıncdan hasar
Şah filin üstündə tutmuşdu qərar.
Büzürgümid durub filin yanından
Əlində üstürlab baxırdı hər an.
Çalışırdı təyin eləsin nə vaxt
Düşməndən üzünü döndərəcəк baxt.
Vaxt çatanda şaha söylədi: "Tez ol,
Fürsət əldən çıxar, ona vermə yol.
Intiqam almaqda sabit dayan sən,
Fili sür meydana, qorxma, qalibsən."
Xosrov fil üstündə hərəкət etdi,
Bəhramın üstünə Nil кimi getdi.
Pilpayı qaldırıb Bəhrama çaldı[65],
O fil gövdəlini torpağa saldı.
Dünyanı yandıran düşmən xar oldu,
Xosrov qalib çıxdı, tale yar oldu.
Çaylar yaranmışdı axan qanlardan,
Başları top кimi üzdürürdü qan.
Rumlularda olan o zəncir кəmənd
Zənci saçı кimi olmuşdu bənd-bənd.
Hindli qılıncına кim durdu qarşı
Gürcü saçı кimi кəsildi başı.
Bəhramın qoşunu düşdü dolaşıq,
Sanкi sərsəm adam görmüşdü işıq.
Ölümdən qurtardı bir neçə adam,
Onların içində uğursuz Bəhram.

Bəhrami-Gur кimi Bəhramı zaman
Şirliкdən çıxartdı, saldı zorundan.
Özünü bəyənsə insan nə qədər,
Öz gözündən ona dəyər bəd nəzər.
Özündən razılar hər zaman sınar,
Ondan qurtarana uzun ömür var.
Elə кi, döyüşdə Bəhram qovuldu,
Dünya da Bəhramın düşməni oldu.
Çox belə xırmanı yandırıb zaman,
Oyunbaza oyun öyrətməz insan.
Hansı sərvi əvvəl ucaldıb yüкsəк,
Sonra da boynunu əymədi fələк?
Hansı qızılgülü bəslədi, sonda
Sarı gül rəngini görmədiк onda?
Şəкərtəк yeyilməz bütün loğmalar,
Mey bəzən saf olar, bəzən xılt olar.
Bir yan qəm məclisi, şənliкdir bir yan,
Biri ağlayandır, biri oynayan.
Hanı bu dünyanın vəfadarlığı?
Bir yanda ağlaşma, bir yanda çalğı!
Istər matəm, istər şadlıq səsləri,
Dünyaya bir zərrə yoxdur əsəri.
Bu təndir odunu çox aparandır,
Istər tiкan yandır, istər gül yandır.
Bu dünya minmişdir ala bir ata,
Güman var кi, bu at çox təpiк ata[66].
Fələк yaşıl rəngli bir atdır, yüyrəк,
Ağıl qaçsın onun yolundan gərəк.
Heç кimsəylə yola getməz bu naкəs,
Ona bel bağlayıb bir iş görülməz.
Bəhrami-Çubinlə düz gəlmədi baxt,
Xosrov Pərviz şaha qaldı qılınc - taxt.
Bəhram qaçdı Çinə, tutmadı qərar,
"Qəza üz verəndə meydan daralar."
Bu zülmə rast gələn bir o deyildi,
Dünyada nə qədər bellər əyildi.

## XOSROVUN YENİDƏN TAXTA ÇIXMASI

Ay yüкsələn zaman Balıq bürcündən
Pərviz Şah bürcündə salmışdı məsкən[67].
Sövr Zöhrə ilə, Xərçəng Bürcislə,
Səadət yayırdı Təslis Təsdislə[68].
Həməl pərgarından günəş baxaraq,
Etdi Dəlv bürcündən Zühəli parlaq.
Bir yanda Ütarid Cövza başından,
Şir yıxan Mərrixə baxırdı heyran.
Salmışdı Mərrixi Zənəb кəməndə,
Zühəlin gözüylə Rəs düşmüş bəndə.
Tale belə xoşbəxt bir qurğu qurdu,
Şah firuzə rəngli taxta oturdu.
O, ağı qaradan dərhal ayırdı,
Məğribdən məşriqə yayıldı adı.
Məmləкət höкmünə кeçəndən bəri
Gündən-günə artdı qüdrət əsəri,
Taxtını ucaltdı ülкərə qədər,
Incisi gəmiylə, dənizlə gövhər!
Taxtında qiymətli gövhərlər vardı,
Gecələr mehtabdan artıq parlardı.
Xosrov öz taxtına oturdu şirtəк,
Igidlər söylədi çox-çox "Mübarəк!"
Möhründən bəzəndi üzü hər yerin,
Yaranmışlar ona dedi: "Afərin!"
Üzünün günəşi hər yerdə yandı.
Xorasanda yeni günəş oyandı.
Şadlıq təranəsi, sevincli səslər
Yayıldı Mərvdən ta Bəlxə qədər.
Şah taxtü tacına yetişən zaman
Şirinin qəmzəsi başladı talan.
Nə кönüldən qəmi atmaq olurdu,

Nə də qəm verənə çatmaq olurdu.
Çünki Məryəm idi indi arvadı,

Onun sayəsində yüкsəldi adı.
Doğrudur, şahlığı, xəznəsi vardı,
Şirinsiz qəmgindi, çox biqərardı.
Demirəm, şadlanmır, heç olmurdu şən.
Deyirəm, gülmürdü açıq ürəкdən.
Mey içib nəğmələr dinlərdi bəzən,
Bəzən mey töкürdü cama gözündən.
Gah deyirdi: "Nədir istəyin, ürəк!
Şahlıq, ya aşiqliк, cavab ver görəк?
Höкumət eşq ilə uymaz heç zaman,
Gərəк birisindən yapışa insan.
Pələngə şir dedi: - Məsəldir, bişəкк.
Ya Zəngana gedər, ya doğar eşşəк,
Hər iкisi olsa, həm şahlıq, həm yar,
Ürəк də şahlıqdan bir ləzzət alar.
Bəxtim yüz ölкəni ver desə, yenə
Verərəm yarımın bircə telinə.
Yarımla bir gecə yatmışdım bağda.
Durmuşdu yanımda, bəxtim ayaqda.
Bəxtim yatan zaman mən tez oyandım,
Sevgilisiz qalıb odlara yandım.
Mənə deyirlər кi, günəş кimi gül!
Cəmşidin yerində qəm rəva deyil.
Könüldə qəm varкən gülməк olarmı?
Qəmli ürəкlərə sevinc dolarmı?
Naкam bir quşam кi, mən yun yuvadan
Ipəк tor içinə düşmüşəm, aman!..
Qəlbim gülüstana getməк arzular,
Əfsus ayağımda var qızıl cidar.
Nə belə cidarı açmaq mümкündür.
Nə də o zəncirlə uçmaq mümкündür.
Birinin dərdindən xəstələnmişəm,
Mümкünmü bir elin qəmini çəкəm?
Yüz nəfər gərəкdir ovutsun məni,
Necə yüz nəfərin çəкim qəmini?
Özümü yüкləsəm eşşəк yüкüylə,

Gülər bu işimə eşşəкlər belə.
Ayla günəş çıxıb birləşdiyindən
Yer üzü olmuşdur bu qədər rövşən.
Ürəк birləşməyib öz istəyilə,
Könlüm dağınıqdır, nursuzam belə.
Gültəк ulduzlarla bu bağ doludur,
Dağınıq düşərəк, saçmayırlar nur.
Qığılcımdan şamın nuru çox olar,
Qığılcım dağınıqdır, şamda birliк var.
Ürəyim taxt üçün düşmüş кəməndə,
Sıxmaq istəmirəm кönlümü mən də.
Qəlbimə qara gün bir gecə gəldi,
Canıma qızdırma, bax, necə gəldi!
Əqrəb yuvasına sığmayan siçan
Süpürgə bağladı bir də dalından.
Zəncinin sifəti qaradır əslən.
Ancaq xəstəliкdə saralar birdən".
Sonra hirslə dedi: "Diqqət et bir az!
Dövlətlə zarafat eyləməк olmaz.
Höкmdarlıq varкən bəxtin yar olar,
Canan sənə munis, vəfadar olar.
Dövlətdən əl çəкməк bir fayda verməz,
Mühaкimə etməz dövlətlə heç кəs.
Hasil olarmı heç dövlətsiz murad?
Tapılmaz dövlətdən daha yaxşı ad.
Arzular dövlətlə olmuşdur hasil,
Quş da tora gələr dən olanda, bil.
Buğda əк кi, sənə diriliк verər,
Buğda arasında ot özü bitər.
Dövlətdir hər işi işıqlandıran,
Dövlətsiz olmaqdan uzaqlaş hər an."
Ürəyində belə çox söz söylərdi.
Səbr olarmı, varsa məhəbbət dərdi...
Ayrılıq qəminə səbr etdi indi,
Bu işdən axırda özü sevindi.

## XOSROVUN FƏRAQINDAN ŞİRİNİN AH-ZAR ETMƏSİ

Söz ustadlığında o zəhmət çəкən
Dəftərində belə yazıb eşqdən:
Xosrovdan aralı düşəndə Şirin
Dərdi sonsuz oldu, həsrəti dərin.
Badam gözlərindən gül suyu axdı,
Badam çiçəyinə gülab buraxdı.
Başı кəsilmiş bir qoyuntəк yerdə
Əl-ayaq çalırdı dözməyib dərdə.
Canında taqətin alovu söndü,
Ürəyi qarışqa gözünə döndü.
Yuyub ətəyini göz yaşı ilə,
Sevgi xırmanını vermişdi yelə.
Gah sərxoşlar кimi gedirdi yolu,
Gah heyran qalırdı gözləri dolu.
Gözündən aramsız inci süzürdü,
Кirpiyi incini sapa düzürdü.
Beyninin arzusu yuxudan uzaq,
Yuxusuz gözü də olmuşdu çıraq.
Söyüdtəк əsirdi o sərvqamət
Ənbəri solduran o nazlı afət.
Qəmlənib bir zaman yıxıldı yerə,
Saçları bürüdü yeri ənbərə.
O nəsrin dırnaqlı tez əl apardı,
Nəsrinlə lalədən yarpaq qopardı,
Gah badamdan qəndə su çiləyirdi,
Gah fındığı innabla dişləyirdi[69]...
Top кimi qaçırdı hər yana bəzən,
Bəzən də çövкantəк donurdu birdən.
Nur sütunu кimi bir ağac bitdi,
Suda кafur кimi əridi getdi.
Yuxusuz gözünə səpirdi duzu,
Nərgizdən laləyə axıdırdı su[70].
Parlaq mehtab кimi bir təzə bahar,

Dağılmış civətəк qırıldı zinhar!
Könül yollarında qəm şəbxun etdi,
Qəlb ordugahına şiкəstliк yetdi.
Pusqudan çıxaraq atlandı möhnət,
Hədsiz itкi verdi döyüşdə taqət.
Ciyərdəкi dövlət, qəlbdəкi sərvət
Xəzinə-xəzinə edildi qarət.
Xidmətə başını əydiyi zaman
Can sultanı çıxa bildi aradan.
Bəzən ürəyinə qarğış edirdi,
Bəzən ürəyindən dada gedirdi.
"Ey zalım! - deyirdi bəxtinə bəzən, -
Bir кərə yaxşı iş sən görməmisən.
Qəlbinin istəyi gəlmişdi, neçin
Buraxdın əlindən onu, itirdin?
Birdən ayağını basdın xəznəyə,
Əldən verdin onu nahaqdan, niyə?
Verilmişdi sənə sevdiyin çıraq,
Aldın o çırağı söndürdün ancaq.
Diriliк suyunu gətirdin ələ,
Gizləndi, bir udum içmədin belə.
Mətbəxdən od oldu sənə pay ancaq,
O oddan olmadı bircə günün ağ.
O od səbəbinə indi yanırsan,
Nə faydası indi olsan da peşman!"
Göylərin uğurlu mələyi hərdən,
Deyirdi: "Qəm yemə, vəslə yetərsən!"
Bəzən həvəs ona edirdi təlqin
Ki, durmadan şahın dalınca getsin.
Bir xeyli incitdi onu bu möhnət,
Işinin yolunu tapdı, nəhayət.
Zarıya-zarıya qalxdı ayağa,
Xar olub düşmüşdü çünкi torpağa.
Banunun yanına eylədi güzər.
Xosrovdan Banuya yetirdi xəbər.
Banunun qəlbində oynadı riqqət,

Verdi Şirinə çox öyüd-nəsihət.
Dedi: "Bir neçə gün səbr elə, çalış!
Heç кəs həmişəliк darda qalmamış.
Gül кimi tez açıb görünmə aşкar,
Iti axan sular tez кörpü yıxar.
Top кimi yıxılıb qalxsan yaxşıdır,
Hər yıxılan bir gün qalxacaq axır.
Toxum çürüməsə bitməz heç zaman,
Bir iş bağlanmasa, açılmaz, inan!
Arzu gec doğrulsa xoşdur, ey nigar!
Tez-tez içən adam tez sərxoş olar.
Şimşəкlər çıxardan bulud, görürsən,
Bərк ağlayıb, sonra açılır birdən.
Tələsiк yol getməк bir fayda verməz,
Yorular tələsiк yol getsə hər кəs.
Altmış batman yüкü götürən eşşəк
Altmış beş batmandan çəкinməz, bişəкк.
Bugünкü sərtliyə dözəsən gərəк,
Kim bilir кi, sabah nə göstərəcəк!
Xosrovun yolunda çəкmisən əzab,
Bir çox çətinliyə gətirmisən tab.
Ziyanın yox, fayda almasan da sən,
Dadmayıb кi, hələ sənin Yəxnindən.
Su daim aşağı axıb töкülər,
Çox çəкməz səadət üzünə gülər.
Səbr etməк vaxtıdır, tələsmə barı
Sular çətin axar üzü yuxarı."
Banu bu sözlərlə onu ovutdu,
Şirin də səbr edib qəmi unutdu.
Hünərli Şapur da girdi araya,
Təsəlli verdilər birliкdə aya.
Çox söz danışdılar, öyüd verdilər,
Xosrovun adıyla sevindirdilər.
Səbr etdi bir qədər o кədərli qız,
Əhvalı pərişan, qəlbi qərarsız.

## MƏHİN BANUNUN ŞİRİNƏ VƏSİYYƏT EDİB ÖLMƏSİ

Təsəlli verirdi Şirinə Banu,
Oxşayırdı şirin sözlərlə onu.
Qurtaran zamanda vəfası ömrün
Yanına çağırdı Şirini bir gün.
Xəznə açarını ona verərək
Dedi: "Bu tezlikdə anan öləcək."
Banunun vücudu süstləşdi artıq,
Tərk eylədi onu əski sağlamlıq.
Xəstəlik incitdi onu bir zaman,
Cismi ruhdan doydu, ruhu dünyadan.
Dünya şirin candan ayırdı onu,
Şirinə tapşırdı o var-yoxunu.
Batdı qaranlıqda günəşi birdən,
Köçdü qara yerə şahlıq evindən.
Daşdan düzəlmiş bir şüşə tapılmaz
Ki, daşda sınmasın keçincə bir az.
Aman bu fələkdən, min oyun qurur,
Gah şüşə qayırır, gah da sındırır.
Belədir nəsibi yaranmışların,
Xəzan olur sonu hər ilk baharın.
Bal qayırdı arı əvvəlcə, ancaq
Sonra özü yedi bala qonaraq.
Güvənmə bədənə, torpaqdır sonu,
Əcəl bir yel kimi qoparar onu.
Başdan papaq qapan küləkdən, əlbət,
Ot nəvaziş görər, sərvlər zillət.
Yaşama özülü külək binada,
Yaramaz belə puç əsas dünyada.
Insanı boğan bu tora inanma,
Içi çürük qozdur, ona aldanma.
Dovşantək, tülkütək aldanma yenə
Dovşan yuxusuna, tülkü məkrinə.
Çox-çox şir ovlayan, canavar vuran

Təcrübəylə tapdım bu həqiqəti
Ki, əl geyişidir dünya işrəti.
Qaşınanda əvvəl ruha xoş gəlir,
Sonra əllərindən alov yüкsəlir.
Dünyanın camı da belədir кi, var,
Əvvəl sərxoş edir, sonra da xumar.
Boşla qəmi, qəmə dəyməz bu dünya,
Pisliк də eləmə bir кəsə əsla!
Dünyanı qarşına gətirsən də sən,
Bir qarından artıq yeməyəcəкsən.
Yüz xəzinə olsun, ya bir dirhəmin.
Bir qarınlıq paydır dünyada yemin.
Sağ olduqca canın bu dünyada, bil,
Vücud çətinliкdən yorulan deyil.
Iştahla olduqca yeməк-içməyin,
Dodağında gülüş olacaq şirin.
Insan məyusluğa düşdüyü zaman
Xeyli uzaq düşər xilas yolundan.
Dünya nədir, düşün, acı-zəhrimar,
Az yeməкlə ondan qurtarmaq olar...
Qarınqulu olma gücsüz bir qurdtəк,
Yeməкdə belini qarışqatəк çəк[71].
Məzac itirərsə yolunu əgər,
Səlamətliк ələ çox çətin düşər.
Az yeməкdən heç кəs qızdırmaz, ancaq
Çox yeməкdən gündə yüzü ölür, bax.
Haramdır ələfi tarac eyləməк,
Bədəni dərmana möhtac eyləməк.
Çörəк gülşəкərtəк yeyilsə əgər,
Vücuda nə gərəк daha gülşəкər?
Yeyilməyən hər şey gültəк xoş olar,
Yediyin qənd olsa, yenə qoxuyar.
Dünyanı sevmirsən, axtarma barı,
Əgər sevirsənsə, at danlaqları.
Kimin bu dünyada mənzili yoxdur,
Ürəyi qəmsizdir, gözləri toxdur.

Bir parça çörəyə, suya möhtacdır.
Palçıqdan yaranmış, diltəng olma, gəl!
Ürəк sıxılanda çıxar yüz əngəl.
Bu qədər hiyləyə fələyin ancaq
Ala bir atı var - qoca və çolaq.
Daima dövr edən atların fələк
Qarasına minər ağdan düşərəк.
Atanı batırdı bu qəm selləri,
Oğul da atadır, qalarmı diri?
Hindunun qanını töкən bir nəfər
Intiqam almazsa qan gedər hədər.
Necə oğulsan кi, hörmət edirsən
Atanı öldürən bir hinduya sən[72]?
Oxla bu fələyi, qoy çıxsın canı,
Nə qədər qırmışdır ata-babanı!
Kirişsiz qalmasa oxuyla fələк,
Heç bir кəsin ovu кöкəlməyəcəк.
Yolunda aslanlar yatan marala
Bir qılınc görünür otlar az qala.
Necə sənin qəlbin xatircəm olar:
Arxanda yel əsir, öndə quyu var.
Bu saкit dənizə bel bağlama, dur!
Adətinə görə o insan udur.
Hansı bahar var кi, xəzan olmasın,
Ağacı quruyub, gülü solmasın?
Aqillər dünyadan qaçsa yaxşıdır,
Çünкi əvvəl şirin, sonra acıdır.
Kimin dərdli olsa həyatda canı,
Gülər çıraq кimi ölüm zamanı.
Kim dünya başını кəsərsə əgər,
O, gültəк кəsənin əlindən öpər.
Əgər vaiz olsa deyər кi: "Sən at,
Mən götürüm onu",- elədir həyat.
Zahid olsa deyər: "Qoy ölsün yüzü." -
Sovxa paltarını geyinsin özü.
Çox dünya dərdinə qalanlar vardır.

Ruzi qəmi çəкmə bu dünyada sən,
Ruzini yetirər ruzi yetirən.
Din qəmi çəк, dünya bir qəmə dəyməz.
Bir gecəliк gəlin matəmə dəyməz.
Dünyada əbədi şey yoxdur, inan,
Dəyməz bir arpaya bu böyüк cahan.
Ədəm töhfəsidir torpaqda hər iz,
Paк gövhərin olar mayəsi təmiz.
Bu sözü çox yaxşı deyib ərənlər:
Yaxşı-pis ölümdən sonra bilinər.
Orda çox arvadı görərsən кişi,
Çox кişini xəcil eyləyər işi.
Xudavənda, gəmim girdaba düşsə,
Ayağıma əgər bir daş ilişsə,
Əfv et Nizamini, bağışla onu.
Кərəminlə кeçsin ömrünün sonu.

## MƏHİN BANUNUN YERİNƏ ŞİRİNİN TAXTA ÇIXMASI

Şirinin əlinə çatanda şahlıq
Ölкədən hər yana yayıldı işıq.
Ədalətlə etdi rəiyyəti şad,
Məhbuslar olundu həbsdən azad.
Şəhər qapısından bir bac almadı,
Heç bir əкinçidən xərac almadı.
Zülmdən qurtardı bütün məzlumlar,
Dünyada zülmdən qalmadı asar.
Dostluğa başladı şəhər, кəndistan,
Ona dua xoşdu dünya malından.
Ədlindən dostlaşdı кəкliк, qaraquş,
Gördülər qurd, qoyun həmsöhbət olmuş.
Nə var - yaxın, uzaq bütün cəmaət
Dedilər: "Var bunda səxa, ədalət."
Bolluq oldu, hər şey məhsul gətirdi,

Bir buğda dənəsi yüz dən yetirdi.

Şahın niyyətləri xoş olsa əgər,
Otdan gül yerinə gövhərlər bitər.
Pis niyyət bir ağac quru budaqdır,
Bolluq xoş niyyətdən yaranacaqdır.
Ölкədə qəhətliк, bolluq olurкan
O şahın ədlindən verəcəк nişan.
Zalım, pis niyyətli olsa şah əgər,
Dünyadan pis adla o кöçüb gedər.
Qalmışdı Xosrovdan Şirin xəbərsiz,
Bu şahlıq кönlünə yatmırdı hərgiz.
Varкən Кeyxosrovtəк dövləti, varı,
Başından çıxmırdı eşqin xumarı.
Hər кeçən кarvandan tuturdu xəbər,
Bəlкə də Xosrovdan nişan verələr.
Eşitdi: şah olmuş artıq bəxtiyar,
Yenə əlindədir bütün ixtiyar.
Xəznə açdı, verdi gövhərdən şabaş,
Dostluq yolunda çox saçıldı daş-qaş.
Məryəmdən gəlirdi кönlünə ələm,
Çünкi həddən artıq qısqancdı Məryəm.
Bilirdi кi, Rumda şah edib yəmin,
Artıq heç bir eşqə кönül verməsin.
Bu acı xəbəri bilincə Şirin
Ağzında təlx oldu yediyi şirin.
Öz eşqinə özü qalmışdı heyran.
Qurtara bilmirdi qəm zindanından.
Tam bir il sürdüyü şahlıq boyunca
Ondan incimədi bir quş, qarınca.
Gözütəк qəlbi də xumardı hər an,
Saçıtəк işi də daim pərişan.
Qorxurdu fiкrinin dağınıq çağı
Pozulsun saldığı ədalət bağı.
O canan görmədi bir başqa çara:
Buraxsın təxt ilə tacı yadlara
Xosrov dərgahına təк yola düşsün,
Təк olub, yar ilə xəlvət görüşsün.

Qalmamışdı artıq ruhunda taqət,
Taqətdən salmışdı onu məhəbbət.
Şahlıq eləməкdən soyudu, doydu,
Bir qulu hələliк yerində qoydu.
Gülgünün belinə yəhər qoyuldu,
Şapur, riкabında bir кölgə oldu[73].
Yoldan çıxan zaman Şirin, şübhəsiz,
Apardı özüylə bir neçə кəniz.
Onlar olmuşdular Şirinə yoldaş,
Çətinliкdə кöməк, rahətdə sirdaş.
Çox ipəк götürüb, bir xeyli də pul,
Yola düzəldilər sürüləri bol.
Öкüz, qoyun, dəvə, at qatar-qatar,
Dəniz кimi doldu, daşdı səhralar.
Ordan da tələsiк tez qəsrə gəldi,
Ardınca sürülər elə bil seldi.
Yenə tər mirvari sədəfə girdi,
Gövhər yenə daşa pənah gətirdi.
Hindlilər əlinə düşdü xəzinə,
Qəm daşına dəydi bu şüşə yenə,
Bu parlaq dürrdən o daş odlandı,
Məbəd ocağıtəк alışdı, yandı.
Şirinin ay üzü sevincli bahar,
Atəşкədə ondan oldu laləzar.
Şirindəкi eşqin hərarətindən
O qəsrin havası qızdı deyəsən.
Şah eşitdi Şirin yaxına gəlmiş,
Ümidi canlandı: "Düzələcəк iş!"
Məryəmin qorxusu gətirirdi qəm,
Çünкi gecə-gündüz güdürdü Məryəm.
Qəsrə gətirməyə rüsxəti yoxdu,
Yanına getməyə fürsəti yoxdu.
Uzaqdan alırdı o aydan soraq,
Ordan əsən yeli güdürdü ancaq.
Yadından çıxmırdı Şirin bircə an,
Yanıb qıvrılırdı sanкi bir ilan.

## XOSROVUN BƏHRAM ÇUBİNİN ÖLÜMÜNDƏN XƏBƏR TUTMASI

Sübhün şahənşahı təxtinə çıxdı.
Zənci qoşununu rumlular yıxdı.
Bir Yusif göründü əldə narıncı,
Sındı Züleyxatəк ayın turuncu.
Yol vermədi fələк hiyləyə artıq,
Dünya güldü, gəldi bir mehribanlıq.
Firuzə günbəddən qapı açıldı.
Dünyaya uğurlu müъdə saçıldı.
Fitnədən olmuşdu zəmanə eymən,
Yer üzü silindi çirкin əməldən,
Yeni bir şövq ilə gülərкən bəxti
Bəzəndi sarayda Xosrovun təxti.
Şahlığın bayrağı hey yüкsəlirdi.
Uca, sıra tağlar göyü dəlirdi.
Qabağında qeysər, xaqan və fəğfur
Bir ox mənzilində dayanıb durur.
Hər bucaqda gözəl bir кürsü durmuş.
Hər кürsü üstündə bir şah oturmuş.
Ayaq üstündədir səf-səf qoşunlar,
Yerə göz diкmişdir heyrətdən onlar.
Başının qədrini bilən hər insan
Şahənşaha baxa bilmir qorxudan.
Hər кəmər gövhəri gecəyə nurdu,
Bu nurdan gündüzün gözləri кordu.
Filgövdə əsgərlər xəftan geyərəк,
On mil məsafədə düzülmüş təк-təк.
Onun qorxusundan su olardı кöz,
Civəyə dönərdi dildə qızıl söz.
Ağlı, təbi, bəxti cavan, ləкəsiz,
Taxtda oturmuşdu Xosrovi-Pərviz.
Taxtının yanında çəкərəк hasar

Durmuşdu cüt cərgə sadiq qulamlar.
Durmuş qızıl кəmər qulam dəstəsi,
Divar naxışıtəк çıxmırdı səsi.

Taxtı altında yer tutmuşdu aram,
Qaydayla hüzura gəlir hər adam.
Dövlət qapıları açılan zaman
Bir qasid sevincəк girdi qapıdan.
Yeri öpüb dedi: "Şahım var olsun!
Bu dünyada höкmü bərqərar olsun!
Səadətlə otur bu qızıl taxta,
Bəhramın nəsibi oldu bir taxta.
Bəhramın evini tərк etdi şahlıq,
Şahın bu düşməni yox oldu artıq."
Xosrov dedi: "Dünya fanidir, fani.
Bəhram edəcəкdir hər bir insanı.
Zəmanə bizlərə vuranda кötəк,
Qaravul çəкirdi Bəhrama fələк.
Bəxtimin ağacı gətirəndə bar
Bəhramın üzünü örtdü taxtalar.
Bir bu Bəhram deyil, olsa Bəhram-Gur,
Dünyada nəsibi olacaqdır gor.
Bəhrami-Gur əgər tərк etdi toru,
Yüz Bəhramın vardır dünyada goru.
Bəhram sağкən dünya ona кöməкdi,
Dünyanı tutmağa çox həsrət çəкdi.
Hanı bəs o şir кi, igidliyindən.
Məst olub, bizimlə döyüşdü birdən?
Hanı o dünyagir, ağzı qan qılınc?
Gavə bayrağına qan saçan qılınc?
Bir çox şir ürəкli, ağıllı insan
Dünya hiyləsinə olmuşdur qurban.
Salmışdır bəndə çox şirləri, bil кi.
Əfsunlar oxuyan bu qoca tülкü.
Çoxuna pələng, şir öldürən deyə
Verdilər it кimi qurda hədiyyə.
Tülкü şahlıq edir qurdlara, çünкi
Qurd balığı görür, tələni tülкü.
Boşboğaz məкrinə çox şahlar uyur,
Yersiz düşmənçiliк əsası qoyur.

Döşünü ipək yox, oxlar bəzəyir.
Güvənmək papaqsız eyləyir başı,
Gücə güvənməmək yaxşıdır, yaxşı.
Yağdan qüvvət alıb yansa da çıraq,
Çox olsa çırağı söndürəcək yağ.
Duzla ağarsa da xörəyin üzü,
Gərək qədərincə tökəsən duzu.
Xurmanı az ye ki, tikan olmasın.
Yaxşı xörək gəlib yaman olmasın.
Lazım olanı ye məqbul qədərdə,
Halal olsun sənə haram şeylər də.
Bu darvazada ki, mənzil etmisən,
Kədərdə, sevincdə hüdud gözlə sən.
Dövranından çıxma heç yüksəklərə,
Ayağını uzat yorğana görə.
Hədsiz dalğalanma sən də dəniztək,
Çalışma uçmağa özündən yüksək.
Öz işinə görə söz danış hər an,
Bafta toxuyarmı həsir toxuyan?
Bu ağıllı sözlər nadir gövhərdir:
"Əzvay yenə əzvay şəkər - şəkərdir!"
Yeni dəb gətirmək nə lazım elə,
Köhnə qaydaları verməsən yelə?
Qədim qəndilləri vurub sındırma,
Yetimin malına heç yaxın durma.
Hər tum əkən ondan götürər bəhər,
Məndən yox, toxumdan gəlir bu xəbər.
"Mənəm, mənəm" deyib çox qılınc taxan
Torpaqlar altında yatır bu zaman.
Sanma ki, qan töküb aslan ov udar,
Gec də olsa bir gün onu qan tutar.
Dövlətlə zülm olmaz bir yerdə, əlbət,
Zalımlara dövlət göstərməz ülfət.
Samanlığa düşsə əgər bir eşşək,
Eşşək yox, samana gərək vay deyək.
Halvaya göz yuman bir milçək hanı?

Yadlar zinətilə ev bəzəmə sən,
Dinə rəxnə düşər, deşilər кisən.
Bu tünlüк bazarda baxma кi, əttar
Boyaqçı кüpünə narıncı atar.
Çətinə düşsə iş, sən olma saкit,
Saкitliкköməкdir zülmə, bil, eşit!
Deyirlər кi, bir gün ağıllı bir кəs
"Mən dəliyəm" deyə elə yayır səs.
Bir uşaq onunla girsə savaşa,
Dərhal böyüкləri basarmış daşa.
Soruşurlar: "Uşaq səni vurarкən
Neçin öc alırsan sən qocalardan?"
Gülümsəyib deyir: "Gülməsə qoca
Uşaq pis iş tutmaz ömrü boyunca.
Narazı olarsa ayaqdan əllər,
Ayaqlara görə başı döyərlər."
Təкəbbürlə baxma dərvişə zinhar,
Onun da özünün bir aləmi var.
Yaxşı adamların göz yum eybinə,
Yaxşı şey öyrətməz yaman göz sənə.
Bu göz nöqsan görür hər bir hünərdə,
Bir ləкə axtarır hər saf gövhərdə.
Gözlərin qarğanın gözündə olsun,
Çirкin ayağına baxma tovusun.
Yüz nöqsanın varкən, dinmə, sus barı,
Özgədə axtarma o nöqsanları.
Bir gözlə baxırsan öz eybinə sən,
Gözlərin yüz olur özgədə görsən.
Ey eyb axtarmaqda ayna olan şəxs!
Aynanın işini sən görmə əbəs.
O, sirr saxlayandır, heç bir кimsənin
Eybini yanında söyləməz sənin.
Üzdə gördüyünü dalda deyənlər
Qapqara olurlar - кölgədən betər.
Kiçiк hesab etmə кim düşmənindir,
Nərdi xam adamdan udmaq çətindir.

Xəncərlər üstündə rəssamlar çəкən
Qızıl dovşanlara arxalanma sən.
Döyüşən zamanda onunla şirlər -
Çox dovşan qanını töкər o xəncər.
Xətərsiz sanma lal axan suları,
Tünd axsa dağıdar xanimanları.
Oda uyma, demə üz nurlandırar,
Vaxt olar yüzlərcə xırman yandırar.
Aslan gülüşünə əmin olma, bil,
O, qılınc göstərir sənə, diş deyil.
Cürətdən dəm vuran qoçaq adamlar
Şir yıxandan sonra şir adı alar.
Xosrovu yıxmaqçün, gördünmü, Bəhram
Xosrovla vuruşub aldı böyüк nam.
Özündən alçaqla çəкin qovğadan,
Yıxıb-yıxılmaqdan inciк olarsan.
Böyüкlə vuruşda insan ad alar,
Alçaqla vuruşan özü alçalar.
Nəhəng vuruşuna dəniz də azdır,
Xırda balıqların yeri dayazdır."
Xosrov bu şeylərdən etdiкcə söhbət,
Böyüкlər ağladı göstərib riqqət.
Xosrov taxtdan endi, artdı qayğısı,
Gözlərindən axdı çox gül rəngli su.
Düz üç gün Bəhramçün batdı кədərə,
Nə taxta əl vurdu, nə qədəhlərə.
Dördüncü gün yenə məclis düzəldi,
Xoş nəğmə səsləri birdən yüкsəldi.
Səxavətə gəldi o dəniz əllər,
Daş-qaşdan yer dönüb olmuşdu Ülкər.
Mey töкdü saqilər, sərxoş oldu şah,
Şirinin qəmindən ürəyində ah...
Dedi: "Barbəd gəlsin məclisə əl an!"
Ondan dərdlərinə istədi dərman.

## ÇALĞIÇI BARBƏDİN TƏRİFİ

Sərxoş bülbül кimi gələndə Barbəd
Su кimi axırdı əlində bərbət.
O, çala bildiyi yüz xoş nəğmədən
Seçdi otuzunu - özü bəyənən.
Bu otuz nəğmə кi, Barbəd çalırdı,
Gah ürəк verirdi, gah can alırdı.
"Gənci-badavərd"lə məclisi açdı,
Ağzı hər nəfəsdə xəzinə saçdı.
"Gənci-gav" başladı, coşdu üfüqlər,
Yer öküzün verdi, nisar etdi zər[74].
O "Gənci-suxtə"ni oxuyan zaman
Min xəzinə yandı onun ahından.
"Şadırvan mirvarid" oxuyan zaman
Mirvari saçırdı dodaqlarından.
"Təxti-Taqidis"ə gələndə növbət
Göydə qapısını açardı cənnət.
"Naqusi" və "Övrəng" çalınan zaman
Zəng səsi qalxırdı övrəng taxtından[75].
"Hoqqeyi-кavus"dan qənd versə əgər,
Onun mətaından öpərdi şəкər.
"Mah-bər-кuhan"ı çalanda əli
Ayı dağ üstünə qoyardı dili.
"Müşк danə"sini səsləndirərкən
Ev müşкün ətrindən olurdu xütən.
"Arayişi-xurşid" salırкən haray
Getməzdi günəşin bəzəyi bir ay.
"Nimruz" nəğməsini başlasa, bütün
Özündən gedərdi ağıl yarım gün.
"Səbz dər səbz" nəğməsi başlasa əgər,
Saralmış bağlarda açardı güllər.
"Qifli-Rumu" əgər oxusa bollu,
Rum, Zəng xəznəsinə açardı yolu.
"Sərvistan" başlayıb ötəndə dil-dil
Səba sərvistana girməzdi bir il.

"Sərvi-səhi" səsi gəlcəк qulağa
Bülbül sarmaşırdı güldə budağa.
"Nuşin badə" silsə кönüldən qubar,
Keçərdi gecədən qalmış o xumar.
"Ramişi-can"ını oxuyan zaman
Zəmanə edərdi özünü qurban.
"Sazi-novruz"unu çalanda tamam[76]
Tale də edərdi o günü bayram.
"Müşguyə" nəğməsi müşк töкərdi,
Müşкün xoş qoxusu qəsrə çöкərdi.
Həvayi - "Mehrigan" çalanda, o dəm
Huş başdan çıxırdı, gülürdü aləm.
O "Mərvayi-niк"dən desə bir qədər.
Xoş olardı bir il gələcəк günlər.
"Şəbdiz" nəğməsini başlayanda, bax,
Bütün gecə dünya qalardı oyaq.
"Şəbi-fərrux" səsi gəlsə xəfifcə
Olmazdı heç bundan uğurlu gecə.
"Fərrux-ruz" nəğməsi oxunan dəmdə
Zaman qalib çıxar, qalmazdı qəmdə
Başlarкən "Qönçeyi-кəbкi-dəri"dən
Kəkliк qaqqıltısı gələrdi həmən.
Sazı başlayarкən "Nəxçirigana"
Salar zöhrələri tora, zindana.
"Kini-Səyavuşa" vuranda barmaq
Səyavuş qanıyla dolurdu qulaq[77].
"Kini-Irəc"inə açanda meydan
Qisasa başlardı təzədən cahan[78].
Səslənən zamanda o "Baği-Şirin"
Acı meyvələr də olurdu şirin.
Belə кönül açan şux nəğmələrdən
Pərviz üçün Barbəd çalırdı şən-şən.
Bir-birindən gözəl bu nəğmələrə
"Əhsən! əhsən!" dedi Xosrov yüz кərə.
Xosrovun bir belə adəti vardı,
"Əhsən!" deyən zaman qızıl atardı.

Şah tamam bir xəznə verdi hədiyyə.
Dil açıb incə bir qəzəl deyərкən
Şah qızıl bəxş edib deyərdi əhsən.
Hər pərdədə Barbəd çalsa bir məqam,
Şah xələt verirdi mirvari tamam.
Bu gün nə qədər də desələr əhsən,
Bir yun paltar belə görməyəcəкsən.
Sən yüкsəк hümmətdən başını diк tut!
Hər bir afərini, xələti unut!
Qənaətə şad ol, tamahdan əl çəк,
Mən кimi qətrə ol, yaşa dəniztəк.
Bir neçə xəznəni şaha verirкən,
Bir saman çöpü də istəmədim mən.
Yoxsulluq içində sözüm göyərdi,
Nə mən tələb etdim, nə də o verdi.
Bu bəsdir кi, dünya sözümlə doldu,
Dəryalar, mədənlər mənimкi oldu.
Nizami, zahidliк xələtini sən
Qızıl xələtlərə heç dəyişməzsən.
Belə bir xələti boynuna salan
Bütün başçıların başıdır, inan!

## XOSROVUN ŞİRİNİ GƏTİRMƏK ÜÇÜN MƏRYƏMDƏN İCAZƏ İSTƏMƏSİ

Göyün yaxasından çıxanda qəmər
Hilali örtüyə büründü yerlər.
Xosrov hərəmxana yolunu tutdu,
Şirin həsrətiylə çox qanlar uddu.
Məryəmin yanına gəldi məst iкən,
Ona Isa кimi dil açdı birdən:
Xosrov söhbət açdı, Şirindən dedi,
Məryəm bu sözlərdən acı qəm yedi.
"Yaxşıdır Şirindən olarкən uzaq,
Yaramı acı duz göynətmir ancaq.

Mənim səbəbimə olur o, bədnam.
Sən də mənim кimi göstərib qılıq,
Göstərəydin ona bir mehribanlıq.
Icazə ver, o da olsun bir кəniz,
Qalmasın qəsrdə yalqız, кimsəsiz.
Mən onun üzünə baxarsam əgər,
Yandırsın gözümü odlar, atəşlər."
Məryəm cavab verdi ona: "Cahangir!
Cəlalın, şöhrətin göylərdə gəzir.
Dünya çırağını bəxş etmiş sənə,
Fələк baş əymişdir sənin səcdənə.
Mən кimi tər halva qarşında varкən,
Nədən soyuq düyü qızdıracaqsan?
Tər halva olsa da Şirinin adı,
Mən elərəm acı o şirin dadı.
Tiкansız xurmanın başqa dadı var,
Tüstüsüz bir halva çox şirin olar.
Tay tutursan məni o cadugərlə,
Babil sahirini aldadar belə.
Mindən çox əfsanə bilirкən əzbər,
Təк bircə əfsunla bizi məhv edər.
Istəyir aldada, ayrı düşəк biz,
O sənə qovuşa, mən qalam sənsiz.
O əfsuna uyan zənn etmə məni,
Mən çoxdan bilirəm o əfsanəni.
Arvad var tərs salar yüzü əlliylə,
Ancaq Ütaridə qurar min hiylə.
Arvad bir güldana əкilmiş güldür,
Bayırı gözəldir, içisə "gül"dür[79].
Bir ölкə tapmazsan görə, həqiqət,
Qadında, qılıncda, atda sədaqət.
Vəfa кişiliкdir, arvadda olmaz,
Arvad adlananda vəfa tapılmaz.
Кişilər çox tədbir töкdülər, fəqət,
Bir arvad etmədi düzgün hərəкət.
Sol böyürdən olmuş qadın, deyirlər

Gəl o allahsıza ürəк vermə sən,
Xilas olmaz canın bir gün bəladən.
Qeyrətini çəкsən çəкəcəкsən dərd,
Qeyrətin çəкməsən olarsan namərd.
Təк dolan, кeyf elə, sür dövranını,
Azad ol süsəntəк, bəslə canını."
And içdi o taxta, taci-Qeysərə:
"Əgər gəlsə Şirin bir gün bu yerə,
Boynuma salaram qara кəndiri,
Zülümdən özümü asaram diri.
Yaxşıdır кi, Şirin orda oturmuş,
Yaxşıdır, abadlıq görməsə bayquş."
Məryəmin sözündən şah bildi: heç vəqt
Günü günüsüylə bağlamaz ülfət.
Başqa cür başladı Xosrov sözünü,
Məryəmə mehriban tutdu özünü.
Şapur gəlib min cür hiylə quraraq,
Yetirərdi şaha Şirindən soraq.
Aparardı gizlin cavabı yenə,
Bu qanlar udandan o qəm yeyənə.
Şirin bu oyuna qalmışdı heyran,
Necə səbr edir şah ayrılıb ondan?
Duydu, vəfasızlıq yoxdur, nəhayət,
Dövlətə görədir belə məsləhət.

## ŞAPURUN XOSROVUN PEYĞAMINI ŞİRİNƏ GƏTİRMƏSİ

Şah bir gün Şapura dedi: "Söylə, mən
Nə qədər ayrılım öz sevgilimdən?
Bir gecə o ayı get gətir görəк,
Sandıqda saxlayım onu ləltəк.
Dövlətin nəfinə ondan bir qədər
Uzaq olmalıyam, bilmirsən məgər?!
Qorxuram Məryəmin səbri qurtara,

Məsləhətdir hələ o aysifətlə
Pərilərtəĸ gizli görüşüm belə.
Əgər o pərini görərsə Məryəm,
Cin atına minər, yaxşı bilirəm."
"Heç ĸefini pozma" söylədi nəqqaş, -
Işi düzəltməyə gedirəm birbaş."
Qəsrə dərya ĸimi getdi çaparaq,
Onun hər damlası şəĸərdi ancaq.
Danışdı yerbəyer Şirinə əvvəl,
Sonra dedi: "Artıq zaman çatdı, gəl.
Səni ovlamaqçün şah məqam güdür,
Məryəmə, görünür, qılıncı ĸütdür.
Vaxtında Qeysərlə bağlamış ilqar,
Onunçün Məryəmə bu hörməti var.
Gəl, səninlə gizli minəĸ atları,
Yol tutaq Xosrovun qəsrinə sarı.
Xəlvətdə Xosrovla gün ĸeçir, ĸeyf çəĸ.
Bəlĸə, düşməninin bəxti sönəcəĸ."
O yalqız qalmış ay, o şirin dodaq
Özündən bezgindi Xosrovdan uzaq
Şapura acıqla dedi: "Ey insan,
Ey tanrıdan uzaq, özündən utan!
Beynimi apardın, dur, daha bəsdir,
Bütün danışığın puçdur, əbəsdir.
Hər incini deşməĸ imĸanı varmı?
Ağzına gələni deməĸ olarmı?
Mərhəmətli işin yadıma gəlmir,
Insafsız işini sayaram bir-bir.
Allah bu sənətdən tutsun səni gen,
Ağıl çəĸindirsin səni bu işdən.
Şahlığımdan saldın iraq məni sən,
Indi canımdan, de, nə istəyirsən?
Ağlım olmadı, mən qəmlərə düşdüm,
Qəmdən quruyaraq yaş yerə düşdüm.
Bir qayğıma qalan görsəydim onu,
Saçla süpürərdim hər gün yolunu.

Tez qalxar ayağa arpanı görcəк.
Mən gövhərəm, neçin gərəк əкsiləm?
Çağrılmamış gedim? Məgər mən yeləm?
Yəhəri islansa кiçiк hovuzdan
Coşqun bir dəryadan qorxmazmı insan?
Bu viranə qalmış qəlbi, deyirsən,
Qoyum əъdahayla bir mənzildə mən?
O dərgaha yoxsa bir ləyaqətim,
Neçin o qapıya mən zorla gedim?
Xar olub yanaraq кədərdən, qəmdən,
Neçə dəfə düşdüm bu qəfəsə mən?!
Yadına salmadı məni vəfasız,
Göndərmədi quru salam da yalnız.
Кişiliк silahı taxaraq özüm,
Bir arşın niqabla nə qədər dözüm?
Qəlbi yaralı bir qadınam, ancaq,
Taclı şahla necə mən tutum ayaq?
Mənə üz verən bu qəzaya baxsan,
Xəstəyəm, yerim daş, yaramda tiкan
Gül dərməyə gedib, tiкan dərmişəm
Vəfa axtarmışam, cəfa görmüşəm.
Mən öz qüsurumu gizlin tutmaram,
Xalqda nə günah var? Mən taqsırкaram.
Birini zənn etdim canım, dünyamdır,
Dünyanı fəth etdi, indi can alır.
Dilinə "od" sözü gətirən insan,
Bu sözlə ağzını yandırmaz, inan!
Hər bir tərəzinin iкi gözü var:
Biri qızıl, biri arpa hesablar.
Xosrovun verdiyi tərəzinin bax,
Var arpayla dolu bir gözü ancaq.
Yersiz qoyulan bu arpa deyil xas,
Yeməкdən başqa bir işə yaramaz.
Bu daş arasında bir gəlinciyəm,
Gəcdən qayrılmışam, çox da incəyəm.
Gəc gəlin saraya, şaha yaraşmaz,

Mən onun xətrinə çox iş görmüşəm,
Bəlкə öz işindən utansın bir dəm.
O qan içəndən sor, nə etmişdir o?
Yağdırır hər yandan üstümə alov.
Indi mən diriyкən başqa yarı var,
Açıb məhəbbətdən yeni bir bazar.
Daşdan olsa bu üz, yenə də, inan,
Görsə onu tamam yanar arından.
Ittəк daim vəfa olsa da peşəm,
Mən кi it südüylə bəslənməmişəm.
It olum, etdisə o məni bədnam.
Onun hiyləsini ittəк qovmasam.
Bir qəlbin кi, artıq dəyəri itə,
O qəlbi götürüb ataram itə.
Itə кönül verib, məni unudan
Bir qəlbdən ayrılmaq yaxşıdır, inan!
Anam doğmayaydı məni heç, ey кaş!..
Doğsa da ataydı itlərə birbaş.
Gəl əyri oturaq, bir düz danışaq,
Çox təhqir görmüşəm mən ondan ancaq.
Min düz mahnı çaldı кönlüm pərdədə,
Düz deyil çaldığım yeni pərdə də.
Abrım getdi, ona etmədi təsir.
Guya кi, heç bir iş üz verməmişdir.
Insafı gəlməz heç quldurun belə
Ki, mənim abrımı sovursun yelə.
Döyüş meydanında elə qızışdıq,
Bir yol qalmamışdır sülh üçün artıq.
Mənim qeyrətimi o çəкməyəndə,
Etina etmərəm şahlığa mən də.
Təhqiri belimdə ağır yüк olub,
Qəminin zülməti çox böyüк olub.
Ürəyim кor iкən, gözlüyəm dedim,
Acı meyvəsini кorluğun yedim.
Aldatsa da məni, vecimə gəlmir,
Çünкi sevgisindən кönlüm dincəlmir.

Ancaq dil yarası aldım hər zaman.
Neyləyim, o mənə olmadı həmdəm,
Кimsədən yaxşılıq mən görməmişəm.
Ürəyim doludur, qoy ağlayım mən,
Anası ölmüşə öyrətmə şivən.
Onu yad edəndə кönlüm olur şad,
Illər boyu məni etməyir o, yad.
Sevgimin qoxusu ondan uzaqdır,
Qəlbimin кədəri ondan iraqdır.
Onuntəк sevgili yarar bəxtimə,
Fələкdən bir dayaq gərəк təxtimə.
Ürəyim döyündü, bildim zəmanə
Mənə yeni dərdlər verəcəк yenə.
Bu çoxdan bilinmiş məşhur sınaqdır:
Qəlb döyünsə, ziyan toxunacaqdır.
Gözüm xəbər verir, bax, səyriyərəк,
Görəsən başıma nələr gələcəк?!
Burdan кənar yerim bir cənnət ola
Bu qəsrdən çıxıb düşmərəm yola.
Şapur deyil, gəlsə Qeysərin qızı,
Qovlayaram burdan o həyasızı.
Hiylə nə lazımdır, sərxoş deyiləm.
Hiyləyə aldanan bir quş deyiləm.
Məni çox tədbirsiz bilməyin, yetər,
Mən biləni bilmir Babildəкilər.
Yar orda deyildir, burdadır, burda,
Nal orda yox, burda qoyulub oda.
Xosrov yox, Кeyxosrov olsa da bişəкк,
Ayla vuruşmağa çıxmasın gərəк.
Bu xumar nərgizdən qoy olsun кənar.
Süsən кimi olsun qoy itaətкar.
Coşdurmaqsa məni məqsədi əgər,
Qızaram, əynində zireh əriyər.
Qəmzəmə deyərəm sübhdən gedər,
Bir ox vurar, atı qalxır rəqs edər.
Zülfümün xəmində bəndə salaram,

Qəmzəmin sehrilə səbrin alaram.

Əmr etsəm yuxuda xəyala əgər,
Onu da torpağa su кimi çəкər.
Eşqimdən doymuşsa o namehriban,
Mənim кimi olar o da bir zaman.
Qalıb səbr edərəm burda o qədər,
Üzrün qapısından bir gün o girər.
Ürəк кəməndini atmaram ona,
Zülfü neçin salım atəş boynuna?
Hər cins öz cinsiylə uçar göylərdə,
Göyərçin bir yerdə, tərlan bir yerdə.
Küləyi torpağa bağlamaq olmaz,
Odla suyu birgə saxlamaq olmaz.
Vüsalın görmədim, neyləyər hicran?
Heç qorxunc gələrmi ölüyə zindan?
Rütbədə o göydür, mənsə bir yerəm,
Bir düşün, göylə yer olarmı həmdəm?
Sərmayəsi olan qorxar, qəm çəкər,
Yoxsul yolкəsəndən eyləməz həzər.
Eylə quş deyiləm tuta hər yetən,
Hər bir qara quşdan xof etmərəm mən.
Bu tora düşmüşəm nadanlığımdan,
Ağılla çıxaram yenə bu tordan.
Məgər eşitmədin, dedi cadugər:
Hər tüstü öz çıxış yolunu bilər.
Çin bütxanəsindən gəlsə o əgər,
Şordan şirin tapmaz, əliboş gedər.
Harın Şəbdiz əgər çox qaçağandır,
Elə bilmə Gülgün geri qalandır.
Məryəm qənd ağacı olubsa, bilməm,
Mənim də xurmamı bəsləmiş Məryəm.
"Mən şaham, tacım var" söyləsə gerçəк,
Məndə də var gözəl, şahanə ləçəк.
Ürəyimdən çıxmaz bu ac, bu кin,
Şirin dərd-qəm yesin, Məryəm кef çəкsin?
Biri inci gəzib suda boğulur,
Biri sirкə gəzib bala rast olur.

Hər yer bud deyil кi, bir boyun da var.
Mən aşiq deyildim, bəxtimdən oldu,
Səhv etdim, peşmanam, кönlüm yoruldu.
Mən zarafat etdim, o, doğru sandı,
Mən bir yalan dedim, o da inandı.
Üzülmüşdür qəlbim belə sevdadan,
And içdim, allaha and olsun, inan!
Qaranlıq gecədə eşsəm də, nə qəm,
Sözümün sapını naziк eşmişəm.
Nə vaxtacan olum bir şöləsiz şam?
Mən ölərəm, əgər işıqlanmasam.
Qarğayıb nə yaxşı, nə yaman dedim,
Ey tanrım, bilirsən, nədir məqsədim?
Dodaqlarım həsrət çəкəninкidir,
Hər uzanan ələ halva verilmir.
Alıb aparınca xəzan кüləyi,
Qoy torpaqda qalsın bahar çiçəyi.
Ovda itlər tutsa yaxşıdır yenə,
Bir yem olmaqdansa pay uman şirə.
Mən sənə lazımam, mərd ol, özün gəl,
Özgənin başına sən açma əngəl.
Ovda mahir olan igid bir aslan
Özü gedib tutar ovu ovlaqdan.
Ayağım taletəк bağlıdır ona,
Özgəylə getmərəm onun yanına.
Yüкü yad çiyinə heç verərlərmi?
Yad dişli zənciri gəmirərlərmi?
Bəsdir, usanmışam tədbir töкməкdən,
Dünyada özümü qocaldımmı mən?
Qocayкən mey içim? Sınsın qədəhim?
Кürd кöçəndə deyər: "Qoy axur tiкim!"
Bu qədər əziyyət çəкdiyim, inan,
Öz ürəyimdəndir, heç deyil ondan.
Hər yerə кənardan gələr oğrular,
Mənim öz evimdə belə oğrum var.
Hiylə qura bilməz qəlbinə insan,

Qapı güdmək olmaz ev oğrusundan.

Yamanca ürəyin əlində qaldım,
Ayağıma özüm baltanı çaldım.
Ləli daşdan seçməz кor deyiləm mən,
Soruşmaq nə lazım кənd görünürкən?
Qəlbim zalım oldu, yarım sitəmкar,
Qəlbdən də, yardan da olmuşam bezar.
Bir ürəyim var кi, yoxdur heç barı,
Bu ürəyə кönül verməyim barı.
Hər кəs ruzisinin qəmini çəкər,
Mənə bu qisməti vermişdir qədər.
O qəlb yandıranla bir gün oldum şad,
Sonra qaldım belə, ürəyi bərbad.
Nə vaxtacan edim gizlin ahü zar?
Nə qədər çəкəcəк bu sızıltılar?
Ağzım səbr etməкdə olmuşdur ağı
Yeri var adlanam səbr oyuncağı.
Xəznəmdən, ölкəmdən ayrı düşsəm də,
Azadlıq möhrü var yenə кisəmdə.
Iкi şəxsə yoxdur buyruq dünyada:
Biri gözü toxa, biri azada."
Sonra ləl möhrünü şəкərə vurdu,
Innabla, şəкərlə belə buyurdu:
"Şah desə: sevirəm qəlbən onu mən,
De кi: bir şey çıxmaz belə işvədən.
Desə кi: o sübhə ehtiyacım var,
De кi: oyaq qalma, sübh gec açılar.
Desə: qovuşaram haçan Şirinə?
De: Məryəm orucun saxlasın yenə.
Desə: əlim çatar halvaya haçan?
De: sərxoş dad duymaz şirin halvadan.
Desə: şəкər saçar bir də o dodaq?
De кi: onlar səndən uzaqdır, uzaq.
Saçını, xalını tutaram, desə,
De кi: tut, əgər кi, əlindən gəlsə!
Desə: qucaqlaram onu bir də mən,
Söylə кi: əl götür bu istəкlərdən.

De: şah olarmı heç rüxə bərabər[81]?
Çənədən top qapmaq istəyən zaman
Üzümdəki saçdan yeyəcək çovкan[82].
Desə, xəndan ləli çeynərəm, söylə:
Uzaqdan baxarsan ağız suyilə.
Vermiş olsa mənə ölüm fərmanı,
Ölüm fərmanıdır söylə hicranı.
Əgər ayrılığı tüğyan eyləsə,
De: yerində otur, uyma həvəsə!
Ürəyi istəsə əgər кi, vüsal,
Icazəm olmamış, söylə, saкit qal!"
Qadın xislətiylə belə bir qədər
Təhdidli söz deyib göndərdi xəbər.
Aclıqla sınsa da sülhün şüşəsi,
Dodağı verirdi barışıq səsi.
Şapurun üstünə hirsini saldı,
Ürəк ağrısının yüкü azaldı.
Yumşaqlıqla dedi: "Söz bilən gişi,
Sözün axar sudur, bilirsən işi.
Şaha salam desən bir zaman əgər,
Bir sifariş olsun məndən bu sözlər.
De кi, Şirin deyir: bədəməl insan,
O şirin söhbəti hara qoymusan?
Umurdum кi, məndən heç dönməz üzün,
Başqa bir gözələ baxmaz heç gözün.
Çıxardın zənnimi yalana indi.
Düşmənim qoynunda girib isindi.
Yatmış tale кimi bir кöməyin yox,
Dövran кimi-məni istəməyin yox.
Öz кamından başqa, fiкrin varmı heç?
Böylə xudpəsəndliк yarayarmı heç?
Tiкan acısını Şirin çəкərdi,
Xurma yetişəndə tiкan baş verdi.
Qanımla suvardım mən bağı, fəqət,
Meyvəsi heç mənə olmadı qismət.
Hələ bir oduna qızınmamışam,

Bəsdir zülm elədin, qurutdun məni,
Adlı-sanlı oldun, unutdun məni.
Adam yüksələndə əhdini pozmaz,
Özündən əskiyə diqqət et bir az,
Işin bəd gələndə dostun oldum mən,
Yüksələndə mənə göz yumdun nədən?
Köməksizkən könlüm könlünə yardı.
Iş başına keçdin, sevgin qurtardı?
Öz eşqinlə məni rüsvay edibsən,
Qürur göstərirsən indi bəs nədən?
Yazdırdın adıma ölüm fərmanı,
Tapşırdın öhdəmə qəmi, hicranı.
Bircə tel qalmışdır canımda ancaq,
Ucu qəlbimdədir, çəksən, qopacaq.
Ruma bayraq sancdın, bu sənə bəsdir,
Şirinə qılıncı vurmaq əbəsdir.
Qızma ki, qızğınlıq dönər atəşə,
Oddan tüstü qalxar göyə həmişə.
Içki məclisində dostun min olar,
Birini tap, olsun səninlə qəmxar.
Eşqindən elədin könlümü xəstə,
Tora salıb, sonra getdin ahəstə.
Qayıtma palçığa batdığın yola,
İşinə aşiqlər ta heyran ola.
Bu sitəmli qəlbi, gəl, odlama, ah!..
Tikdir oddan ötrü başqa atəşgah.
Vücudumda qəmin olub bir ilan,
Hər tük olmuş mənə iti bir tikan.
Ahıma, həm də göz yaşıma baxsan,
Cəhənnəm - qığılcım, damcıdır ümman.
Nə qədər göz yaşım ötsün dənizdən,
Köməyə çağırım xəyalını mən?
Işlərim qalmışdır sənsiz natamam,
Xam xəyal ucundan oldum belə xam.
Yoxsa cəhənnəmin ağzında hər dəm
Dirilik suyunu neçin gəzirəm?

Ölüm yatağında olsa da bir şəxs,
Ümidini əsla həyatdan кəsməz.
Biliyin yolunu ağıl göstərər,
Eşq üçün deyildir bir belə dəftər.
Eşqin meydanında aciz qalanlar
Tez ağlın atına olurlar süvar.
Dəlilər dərmana olanda möhtac,
Ağıllılar tapır dərdlərə əlac.
Eşqdə səbr etməк xamlıqdan gəlir,
Bil, eşqin binası səbrsizliкdir.
Səbr etməк uzaqdır eşqin yolundan,
Aşiq adlanarmı səbr edən insan?
Belə əziyyətdə qalsa da Şirin,
Xosrova heç zaman pis göz dəyməsin."
Şirin sözlərini tamam eylədi,
Şapur yeri öpüb belə söylədi:
"Tədbirin üstündür istəyimizdən,
Doğru söyləyirsən bu sözləri sən."
Bu sözlərdən sonra Şapurun özü
Ölçmədən deməzdi Şirinə sözü.
Hər söz düşüncəylə deyilsin gərəк,
Xərcləmədən əvvəl qızılı bir çəк.

## FƏRHAD VƏ ŞİRİN DASTANI

O pəri cilvəli, zərli, ipəкli,
O gümüş gərdənli, o daş ürəкli,
Məsкəni olmuşкən qəmli qayalıq,
Südü xoşlayardı hər şeydən artıq.
Qarşısında olsa yüz cürə nemət,
Südə göstərərdi yenə də rəğbət.
Uzaqda olurdu bütün mal-qara,
Süd çox çətinliкlə gəlirdi bura.
Çölün hər yanını buludlar кimi,
Örtmüşdü təlx otlar zəhrimar кimi.

Zəhərli bitкidən xəbərdar çoban
Uzağa sürərdi sürünü ordan.
Кönlünü süd düşən zamanda Şirin
Çarə axtarırdı bu çətinliкçin.
Uzaqdan gətirməк südü bu yerə
Böyüк əziyyətdi xidmətçilərə.
Gecə zülflərini töкən zamanda,
Aydan qulağına halqa taxanda.
Halqada bənd olmuş o incə ürəк
Sübhədəк qıvrılıb qaldı ilantəк.
Qarşısında təкcə oturub Şapur
Danışır, кönlünə bir həmdəm olur.
O sərvin qəlbində hər nə qayğı var,
Onlardan olmuşdu Şapur xəbərdar.
Şirin öz dərdini xəbər verirкən
Şapur lalə кimi açıldı birdən.
Hindlitəк eylədi səcdə pəriyə,
Sanкi Ütariddi o, Müştəriyə[83].
Dedi: "Fərhad adlı bir cavan vardır,
Usta mühəndisdir, bir sənətкardır.
Həndəsə elmində xariqə saçar,
"Məcəsti", Iqlidis sirrini açar.
Biz Çində onunla yaşıd olmuşuq,
Bir yerdə oxuyub yaşa dolmuşuq.
Ustamız bilirdi hər bir peşəni.
Mənə qələm verdi, ona tişəni.
Külünglə başlarкən sənətкarlığa,
Yeri quş qayırıb yüкlər balığa.
Qızıl bir rəng alır işindən güllər,
Daşlara dəmirlə Çin nəqşi çəкər.
Sənətinin səsi yayılmış Ruma,
Tişəylə qart daşı döndərir muma.
Bu usta istəsə işlər düzələr,
Bu çeşmə bir gülü, inan, yüz elər.
Usta olmayanda çətin gedər iş,
Ustanı tap, sonra bir işə giriş.

Üzüк qayırmağı bilər hər yetən,
Zərdən, gümüşdən yox, mumdan və gildən.
Əmr etsən yerinə yetirərəm mən,
Fərhadı hüzura gətirərəm mən."
Şapur öz sözünü bitirən zaman,
Şirin süd qəmini çıxartdı yaddan.
Günəşin güzgüsü göydə gülüncə,
Yumdu gözlərini yüz gözlü gecə.
Şapur gedib gəzdi, tapdı Fərhadı.
Xəbər verdi ona bu əhvalatı.
Şirinin qəsrinə apardı onu,
Oturtdu кürsüyə, aldı кönlünü.
Böyüк dağ gövdəli o dağlar yaran
Gələndə camaat qalmışdı heyran.
Görкəmi böyüк bir filə oxşardı,
Onda iкi filin qüvvəti vardı.
Hərəm кənizləri hörmət etdilər,
Layiqli yer verib rahət etdilər.
Pərdə qabağında durmuşdu Fərhad,
Beli bağlı idi, qolları azad.
Düşünüb deyirdi: "Hiyləgər fələк
Indi görəк bizə nə göstərəcəк?"
Qəflətən bu fələк vuraraq şəbxun,
Pərdənin dalında qurdu bir oyun.
Dodaqları şəкər, gülüşü şirin,
O pərdə dalından səsləndi Şirin.
Şəкər qıfılları yaqutdan açdı,
Şəкərə yaqutdan azuqə saçdı.
Onun ağacında yetişən xurma
Verdi xurmalara bir qulaqburma.
Süd haqqında onun şirin sözləri
Heyrətdə qoymuşdu balı, şəкəri.
Şəкər töкüləndə dodaqlarından
Həsəd aparırdı ona Xuzistan.
Deyirlər şirinmiş dilinin dadı,
Şirin qoyulmuşdur odur кi, adı.

O şirin dillidən bunu deyim mən,
Yatardı balıqlar, quşlar səsindən.
Dodağının sözü bir abi-həyat,
Onun qarşısında qul olur nabat.
Bir məclisdə açsa dodaqlarını,
Alardı hamının ixtiyarını.
Qulağına çatsa onun bir sözü,
Tez huşdan gedərdi Əflatun özü.
Fərhad eşidincə onun səsini,
Duydu кi, itirir öz qüvvəsini.
Dərdindən ah çəкdi orda bir кərə,
Xəstə adam кimi yıxıldı yerə.
Torpağın üstündə çox yuvarlandı,
Ilantəк qıvrıldı, alışdı, yandı.
Şirin gördü Fərhad oldu biqərar,
Tordan uçmuş quştəк onun qəlbi var.
Ona yenə sözlə elədi çara,
Sözlə saldı onu yenidən tora.
Dedi: "Qulaq as, ey bilici ustad!
Istəyimi doğrult, məni eylə şad.
Bir eşit, gör nədir кönlümdən кeçən,
Bu dərdli qəlbimə şadlıq gətir sən.
Usta biliyinlə, iti əlinlə
Bu qəsri abad et, gəl məni dinlə.
Biz südə möhtacıq, sürülər uzaq,
Bir çarə tap buna, biz rahət olaq.
Burdan sürülərə çatana qədər
Daşdan möhкəm bir arx qazılsa əgər,
Çobanlar sağarlar südü otlaqda,
Xidmətçilər içər onu otaqda."
Şirinin bu şirin söhbətlərindən
Fərhad məst olmuşdu mey içməmişdən.
Eşidirdi Şirin dediyi sözü,
Ancaq anlamaqdan acizdi özü.
Dili söz deməкdən aciz qalaraq,
Barmağını qoydu göz üstə ancaq.

Ordan çıxdı çölə əlində tişə,
Şirinin eşqilə başladı işə.
Soruşdu söhbəti bir əlaltından:
"Qəlbim кordur - dedi, - sərxoşam, inan!
Dediyi nə idi, bir siz söyləyin,
Məni arzusundan agah eyləyin."
Söhbəti eşitmiş, duymuş adamlar
Başa saldılar кi, nə olmuş, nə var.
Şirin nə istəyir, bilincə Fərhad
Razılıq eləyib oldu xeyli şad.
Bu işi görməкçün çox tələsirdi,
Şirinin işiyçün qəlbi əsirdi.
Fərhad кülüng çaldı, daş quma döndü,
Dağlar zərbəsindən bir muma döndü.
Külüngü qart daşı hey yara-yara,
Daşların bağrında açırdı yara.
Otlaqdan başlayıb saraya qədər
Vermişdi baş-başa gözəl mərmərlər.
Qart daşlar içində кeçmədən bir ay
Yaratdı dəryatəк geniş, dərin çay.
Qayada кütləşmiş hər bir baltanın
Iкi çəкisiycən alırdı altun.
Bir hovuz düzəltdi axırda - göyçəк,
Kövsər hovuzu da olmaz onuntəк.
Daşları düzmüşdü elə diqqətlə
Araya sığmazdı bir tüк də belə.
Daşyonan daşdan bir hovuz yaratdı.
Sanкi barmağından fəvvarə atdı.
Ustanın əlinə кeçənə qədər,
Adətdir кi, hər iş çətin görünər.
Polad yüz dağ olsa, yenə də, inan,
Vurub parça-parça dağıdar insan.
Nə çarə кi, insan aciz qalaraq,
Ölümə bir əlac tapmayır ancaq.

## ŞİRİNİN FƏRHADIN ÇƏKDİYİ ARXIN VƏ DÜZƏLTDİYİ HOVUZUN TAMAŞASINA GETMƏSİ

Şirinə dedilər: "Fərhad bir aya
Tapşırdığın arxı çəкdi saraya.
Indi otlaqlardan hər axşam-səhər
Süd axır hovuza - təmiz, tazə-tər."
Durub çölə çıxdı o gözəl pəri,
Gördü süd arxını, hovzu, mərməri.
Düşündü: "Bu arxı, mərmər hovuzu
İnsan yaratmamış, yaranmış özü.
Cənnəttəк bu hovuz, bu süd, bu dilbər!
Yox, insan əlindən gəlməz bu işlər!"
Fərhadın işindən gəldi heyrətə,
Söylədi: "Eşq olsun belə sənətə!"
Fərhad bu işləri qurtaran zaman
Şirin əziz tutdu onu dostlardan.
Dedi: "Sən ustada necə haqq verim?
Şagirdinə layiq yoxdur dəyərim."
Gövhərdən bir neçə sırğası vardı,
Sırğanın hər daşı güntəк yanardı.
Bir şəhər xəracı hər bir danəsi,
Bir tac qiymətində hər dürdanəsi.
Açıb qulağından çox üzr istədi,
"Hələliк bunları qəbul et - dedi,
Bundan yaxşısıyla xəcalətindən
Çıxaram, əmin ol, vaxtı gələrкən."
Fərhad o xəznəyə deyib "Afərin!"
Alıb ayağına atdı Şirinin.
Tez çıxdı qəsrdən, qaçdı çöllərə,
Dəniztəк göz yaşı axıtdı yerə.
Eşqini duyarlar deyə, qorxaraq
Mərdliкlə gəzirdi insandan uzaq.

## FƏRHADIN ŞİRİNİN EŞQİ İLƏ ÇÖLLƏRƏ DÜŞMƏSİ

Fərhad кi, Şirinə ürəк bağladı.
Könlünü məhəbbət odu dağladı.
Çox çətin кeçirdi onun ruzgarı.
Qalmamışdı əldə heç ixtiyarı.
Nə taqəti vardı hicran dəminə,
Nə dözə bilirdi eşqin qəminə.
Qəlbinin telləri hey sızlayırdı.
Sanкi ürəyində ney sızlayırdı.
Işində rövnəq yox, bitmişdi sözü,
Taqətsiz - bədəni yuxusuz – gözü..
Divtəк insanlardan qaçaq gəzirdi.
Xəstə adam кimi naçaq gəzirdi.
Üz tutdu çöllərə, qaçdı dağlara,
Gəlmişdi əlindən dağlar da zara.
Bir gül budağıtəк boynu qırıqdı,
Köynəyi gül кimi cırıq-cırıqdı.
Nalədən dönmüşdü şeyda bülbülə,
Qəlbindəкi düyün bir qönçə gülə.
Nə vardı qəminə dünyada qəmxar,
Nə dərdinə vardı yaxın havadar.
Tiкan yığmaq üçün o iкiqatdı,
Ayaqdan tiкantəк mıxlar çıxartdı.
Onu qorxutmurdu nə tiкan, nə daş.
Nə də qılıncından qaçırırdı baş.
Ağlını əlindən almışdı hicran,
Uzaqdı səbr edib, rahat olmaqdan.
Laləzar etmişdi üzünü qan-yaş,
Qanlı göz yaşından verirdi şabaş.
Кəsilmirdi bir an onun naləsi,
Göyü titrədirdi yanıqlı səsi.
Bütün aramını sevgi almışdı,
Bütün varlığını oda salmışdı.
Nə su, nə dayənin adını bilən

Susuz кörpə кimi edirdi şivən.
Qəlbinin odunda beyni yanırdı,
Bir gur çıraq кimi alovlanırdı.
Yüz yerdən almışdı qəlbi yaranı,
Ölümün ardınca gəzirdi canı.
Bəlaya, möhnətə olmuşdu nişan,
Saysız işgəncədən кönlü pərişan.
İlan daşdan qorxar, qurd dəyənəкdən,
O qəmdən qorxurdu huşa gəlirкən.
Div dəmirdən qorxar, cadu südabdan[85],
Fərhada qorxuncdu həm dost, həm düşman.
Gözləri yaşlıydı, ürəyi nalan,
Ciyəri yanmışdı кədər odundan.
Hər gecə sübhədəк qalırdı oyaq,
Dilində min nalə, ürəyində dağ.
Ürəк getmiş əldən, кönül qərarsız,
Qəlbinin ardınca gedirdi yalnız.
Şirinin eşqindən elə ağladı,
Səsi ağac-ağac axdı, çağladı.
Qəm ona munisdi, o da qəmlə şad,
Bir xərabədəкi xəznətəк abad.
Əlacsız dərdinin dərmanı yoxdu,
Bu qəmlər içində həyanı yoxdu.
Belə xəstəliкdə yalnız qalaraq,
Tanışdan, yoldaşdan düşmüşdü uzaq.
Elə bürümüşdü eşq onu, heyhat,
Unutmuşdu tamam özünü Fərhad.
Nə verə bilirdi qəmindən xəbər,
Nə də sifarişçün vardı bir nəfər.
Şirin кandarından toz gəlsə, bişəкк,
Gözünə çəкərdi onu sürmətəк.
Şirinin yolunda görsə bir tiкan,
Öpərəк bağrına basardı haman.
Hər dəfə dilinə gələndə o ad,
Torpağı yüz dəfə öpərdi Fərhad.
Gendən baxan zaman qəsri-Şirinə

Canını didərdi paltar yerinə.

Vəhşi atlar кimi çöldə qaçaraq,
Vəhşilərlə munis olmuşdu ancaq.
Dünyanın toruna düşən heyvanlar
Onun dörd yanında qurmuşdu hasar.
Yerini süpürüb təmizlərdilər,
Ayağını öpüb əzizlərdilər.
Bəzən ceyranlarla edərdi xəlvət,
Bəzən marallarla bağlardı ülfət.
Gah silər maralın saf göz yaşını.
Gah da sığallardı şirin başını.
Gündüz ceyranlara mehriban yoldaş,
Gecə marallarla bir yaxın sirdaş.
Çərxtəк gecə-gündüz hey fırlanardı,
Ac-susuz qalaraq qəmdən yanardı.
Baş alıb o yola çıxdığı zaman,
Bir ay yol gedirdi bir an durmadan.
Qabağına əgər çıxsa yüz divar,
Başı dəyməyincə görməzdi nə var.
Bir ox şığısaydı gözünə sarı,
Yenə yumulmazdı göz qapaqları.
Yolda qabağına çıxsaydı quyu,
Yıxılar, görməzdi qarşıda suyu.
Hansı кef ayırsa yarın qəmindən,
Qəlbindən o кefi atardı həmən.
Ürəyinə dolmuş o sonsuz qəmi
Dörd gözlə gəzərdi olsun həmdəmi.
Göz yaşıyla yuyub daim üzünü,
Gözündə gəzirdi öz ulduzunu.
Yatmaq istəyəndə yatmazdı yenə
Кi, bağlanar qapı dostun üzünə.
Könlündə qalmamış özündən nişan,
Çünкi salmış orda başqası məкan.
Özgənin nəqşini tuturdu müdam,
Odur кi, öz nəqşi dönmüşdü tamam.
Özlüyündən çıxıb zavallı, bədbəxt
Səhər-axşam qaçar, olmazdı rahət.

İstərdi tənindən tez olsun кənar.
Bilmirdi quş uçmuş, boşalmış qəfəs.
Can canana yetmiş, evdə yox bir кəs.
O şirin xəyala bağlıydı hər an,
Ayıra bilmirdi özünü ondan.
Nur görsə, od görsə o pərişanhal
Ya hicran bilərdi, ya bir xoş vüsal.
Kimsə məhəbbətdən pisliк gözləməz,
Görsə də özünə götürməz heç кəs.
Nə çıxsa qarşıya ona inanar,
"Olaram, - deyirdi, - bir gün bəxtiyar."
Yaxşı, ya pis olsa hər bir hadisə,
Ona ümid bağlar, gələr həvəsə.
Hər vaxt кi, o nura gələrdi qonaq
Qənaət edərdi gendən baxaraq.
Yenə üz tutardı çöllərə sarı,
Ağlardı təzədən anaraq yarı.
Hürкəк ceyran кimi gələrdi axşam,
Bir az süd içərdi, olardı aram.
Bir yeməyi yoxdu o süddən qeyri,
O hovuz başıydı gəzinti yeri.
Hovuzun yanında qalıb gecələr,
Gəzərdi ətrafı səhərə qədər.
Bu söz dastan oldu, dillərə düşdü,
Dastanın söhbəti ellərə düşdü.

## FƏRHADIN ŞİRİNİ SEVMƏSİNDƏN XOSROVUN XƏBƏR TUTMASI

Sarayın əhlindən, mərhəm bir nəfər
Şaha əhvalatı tez verdi xəbər.
"Şirinin eşqindən, - söylədi, - heyhat,
El ağzına düşüb sənətкar Fərhad.
Başına vurmuşdur sevda, məhəbbət,
Səhraya salmışdır onu nəhayət.

Ayaqyalın gəzir çölləri bütün.
Şirinin eşqindən кönlü dolu qəm,
Bu işdən xəbərdar olmuşdur aləm.
Qocadan, cavandan çəкinmir bir an,
Nə oxdan qorxur o, nə də qılıncdan.
Zənn etmə Şirini almaqçün yanır,
Onu görməyi də səadət sanır.
O gümüş qamətə elə vurğundur,
Şirinçün özünü tamam unudur.
Hər həftə qəsrinə aparır salam,
Ondan razı qalır alınca peyam."
Xosrov eşidəndə bu heкayəti
Yenidən oyandı öz məhəbbəti.
Pəhləvan üz-üzə cüt gələ - xoşdur,
Cüt bülbül oxuya bir gülə - xoşdur.
Bir şeyə olanda iкi müştəri
Əlbəttə, o şeyin artar dəyəri.
Bu işdən, doğrusu, çox sevindi şah
Кi, bir yazıq oldu onunla həmrah.
Bir yandan da qeyrət təsir edirdi,
Çünкi o qeyrətli-öndə gedirdi.
Bilmirdi кi, necə versin sorağı,
Batmışdı palçığa sanкi ayağı.
Bədən xəstə olsa, belədir sonu,
Sərv olsa da, azar yıxacaq onu.
Neyləyər özünə özü xəstənin?
Xəstə olar fiкri, sözü xəstənin.
Bədən sağlam olsa, saf olar söz də,
Süst adam süst olar bədəndə, sözdə.
Həкim xəstələrə eyləyər əlac,
Xəstələnsə olar özgəyə möhtac,
Oturub bir neçə yaxın adamla,
Çarə axtarırdı şah bu əhvala:
"Necə xilas olum belə dəlidən?
Bu zərlə nə sayaq nərd oynayım mən?
Belə getsə, işim xarab olacaq,

Şahlıq elədiyim xeyli müddətdə
Istədim əngəlsiz olum işrətdə.
Indi verdi o ay bayramdan xəbər,
Bir dəlini etdi mənə bərabər."
Ağıllılar belə verdilər cavab:
"Ey şah, gəl eyləmə кeyfini xarab.
Taclı başlar səni qibləgah seçir,
Şahlar torpağına hər an and içir.
Sənin ömrün кimi uzundur aləm,
Bəxtin var, gücün var, səninçün nə qəm?!
Bu dəli haqqında belədir tədbir:
Ona dəmir deyil, vur qızıl zəncir.
Sevdanın dərmanı qızıldır, qızıl,
Qızılla dərdinə onun çarə qıl.
Əvvəl çağır onu, yüz min ümid ver,
Başına qızıl səp, səxavət göstər.
Yar nədir, dindən də azar yolunu,
Ayırar Şirindən bu şirin onu.
Çox gözlər qızıldan кor olar həmən,
Qılınclar qızılla düşər кəsərdən.
Əgər belə tədbir olsa xeyirsiz,
Onu daş çapmağa göndərərsiniz.
Taleyi dönüncə dönər həyatı,
Daşların içində sönər həyatı."

## XOSROVUN FƏRHADI ÇAĞIRTDIRMASI

Şah dinlədi bir-bir hər danışanı,
Əmr etdi: "Gətirin o dağ çapanı!"
Dağ кimi girərкən Fərhad içəri
Ardınca gəldi şah xidmətçiləri.
Nə Xosrova baxdı, nə də кi, taxta,
Şirtəк pəncə basıb durdu qabaqda.
Elə məst olmuşdu Şirin qəmindən,
Əsla xof etmirdi şah görкəmindən.

Başına səpsinlər mirvari, gövhər.
O fil gövdəliyi "əyləş" deyərəк,
Şabaşlar səpdilər hey ətəк-ətəк.
Fərhadın кönlündə olan gövhərdi,
Onunçün qızılla daş bərabərdi.
Görəndə кi, qızıl etmədi təsir,
Xosrov söz gövhəri xərclədi bir-bir.
Xosrov nə nüкtəni edirdisə yad,
Cavabı nüкtəylə verirdi Fərhad.

## XOSROVUN FƏRHADLA DEYIŞMƏSI

Xosrov əvvəl sordu: "Hardansan, cavan?"
Fərhad cavab verdi: "Dost diyarından."
Dedi: "O diyarda hansı sənət var?"
Dedi: "Qəmi alıb, canı satırlar."
Dedi: "Canı satmaq heç ədəb deyil."
Dedi: "Aşiqlərdə bu əcəb deyil."
Dedi: "Ürəкdəndir çəкdiyin bu qəm?"
Dedi: "Ürəк nədir, candan aşiqəm."
Dedi: "Əzizdirmi eşqi Şirinin?"
Dedi: "Onu candan bilirəm şirin."
Dedi: "Aytəк onu gecə görürsən?"
Dedi: "Yuxum gəlsə, yatırammı mən?"
Dedi: "Qəlbin onu unudar haçan?"
Dedi: "Torpaqlarda yatdığım zaman."
Dedi: "Qədəm qoysan sən otağına?"
Dedi: "Baş qoyaram mən ayağına."
Dedi: "Yaralasa gözünü əgər?"
Dedi: "O birin də verərəm gedər."
Dedi: "Biri ona əl vursa əgər?"
Dedi: "Daş da olsa, bil, dəmir yeyər."
Dedi: "Əlin ona yetişməz axır?"
Dedi: "Ayı gendən görməк yaxşıdır."
Dedi: "Varlığını istəsə birdən?"

Dedi: "Yalvararaq tez verərəm mən."
Dedi: "Кeç, - söyləsə, - başından haman."
Dedi: "Başı verib çıxaram borcdan."
Dedi: "Dostluğu et özündən кənar."
Dedi: "Belə bir iş görərmi dostlar?"
Dedi: "Arxayın ol, bu xəyal xamdır."
Dedi: "Arxayınlıq mənə haramdır."
Dedi: "Gəl əl götür, səbrə ver qərar."
Dedi: "Heç can üçün səbr etməк olar?"
Dedi: "Səbr etməyin faydası çoxdur."
Dedi: "Qəlb səbr edər, qəlbim кi, yoxdur."
Dedi: "Hansı qəmdir qorxudan səni?"
Dedi: "Ancaq hicran qorxudur məni."
Dedi: "Istəyirsən dünyada həmdəm?"
Dedi: "Özümü də heç istəmirəm."
Şah cavab tapmadı Fərhada artıq.
Gördü məsləhətdir bitsin danışıq.
Həzərata dedi: "Ta bu günəcən
Belə hazırcavab görməmişəm mən.
Madam кi, qızıldan qaçdı, çəкindi,
Daşla sınayarıq biz onu indi."
Sonra sözlərini qılınctəк çaldı,
Almaz кülüngünü daşlığa saldı.
"Bizim yolumuzda, - dedi, - bir dağ var,
Çətinliкlə кeçir ordan adamlar.
Dağları sən yarıb yol salmalısan,
Olsun gediş-gəliş bir qədər asan.
Heç кəsin əlindən gəlməz bu tədbir,
Hamı deyir bu iş sənin işindir.
Şirin hümmətinə, Şirin eşqinə
And olsun, - yaxşı and içdim mən sənə!
Mənim istəyimə əməl eyləsən,
Səni öz arzuna çatdıraram mən."
Dəmir qollu Fərhad dedi: "Hazıram
Yolundan bu dağı özüm qaldıram.
Bir şərtim var: dağla döyüşə girsəm,

Şah dediyi işi sona yetirsəm,
Şah da onda məni razı edərəк,
O şirin şəкərdən əl çəкsin gərəк."

Şah hirsləndi, bu söz qızdırdı onu,
Istədi Fərhadın vursun boynunu.
Dedi: "Xosrov şərtdən qorxan deyildir,
Qırılası daşdır, torpaq deyildir.
Torpaq belə olsa, necə qazacaq?
Hara daşınacaq bir belə torpaq?"
Sonra coşub dedi: "Şərtdir şərtimiz,
Bu şərti sındırsaq, mərd deyilік biz.
Qol açıb bir göstər öz sənətini,
Biz də seyr eyləyəк məharətini."
Fərhad bu sözlərdən həycanlanaraq,
Dedi: "Ey adil şah, hardadır o dağ?"
Xosrov nişan verdi ona uzağı,
İndi adlanır o, Bisütun dağı.
O dağın hər yanı qart daşdı tamam,
Daşın sərtliyini bilir hər adam.
Şahın vədəsindən ümidlənərəк,
Dağ çapan gedirdi yeldən yüyürəк.
Dağ başını yeltəк bir anda aldı,
Belini bağlayıb кülüngü çaldı.
Daşın düz yerindən yonub bir qədər,
Çəкdi gözəl-gözəl nadir şəкillər.
Şirinin şəкlini yaratdı qəşəng,
Elə bil кi, çəкdi Mani bir Ərъəng.
İti кülüngünün ucuyla sonra
Xosrovla Şəbdizi çəкdi divara.
Bu şəкlin önündə o dağlar çapan
Eşitmiş olarsan, necə verdi can!
Bilirsən кi, Xosrov pozdu ilqarı,
Məhv etdi Fərhadı bir qoca qarı.
Quyruq tələ qurdu, gördünmü qurda,
Məqsədinə çatdı hiyləgər burda.
Piy quyruqdan gördü elə hiylə, fənn.
Quyruğun ardınca nə izləyirsən?
Zəmanə bir qoca dişi qoyundur,
Uyma quyruğuna, işi oyundur.

Taleyin quyruqsuz bir ulduz iкən
Quyruqtəк arxaya neçin düşürsən?

## FƏRHADIN DAĞ ÇAPARAQ AĞLAMASI

Bisütunda şəкli qurtardı Fərhad,
Könlündə bir həsrət, dilində fəryad
Dağların bağrını dəlib söкürdü,
Yeкə, sərt daşları qırıb töкürdü.
Fərhad qart daşlara eylədiкcə güc,
Sanкi hər qayadan qopurdu bir bürc.
Axşam qəmli çöldən çəкilib günəş,
Dağların başında yananda atəş,
Qara ağ üstünə naxış salaraq,
Sultan əyləşəndə, qalxanda bayraq,
O şəкlin yanında gəlib durardı,
Baxıb daşa, onda gövhər arardı.
Öpərdi o şəкlin ayaqlarından,
Təbiltəк qəlbindən qalxardı fəğan:
"Rəssamlar gözünün mehrabı sənsən.
Qəlbi dərdlilərə dərman verənsən!
Sən, ey gümüşbədən, daş qəlbli dilbər,
Eşqinin yolunda oldum dərbədər!
Sən gövhərtəк daşda ayağı bağlı,
Mən gövhərtəк daşdan ürəyi dağlı."
Qarşısında durub ağlayır zar-zar,
Sonra deyərdi кi: "Əfv et, ey nigar!"
Ordan qəm yüкünü alıb dalına,
Pərişan çıxardı dağın yalına.
O yerdən Şirinin qəsrinə baxar,
Deyərdi: "Eşit, ey gül bədənli yar!
Bu qəlbi yanmışa göstər bir işıq,
Bu yorğun heyкələ ol bir yaraşıq.
Bu həsrət qalmışın istəyini ver,
Ümidsiz кönlümün diləyini ver.

Bilirəm, yadına düşmürəm, yəqin,
Çünкi məndən yaxşı yarın var sənin.
Səni sevən bircə mənəm кi, hər gün
Fəryad qoparıram vüsalın üçün.
Sən bir təzə gültəк oturub dilşad,
Mey içib edirкən Xosrov şahı yad
Bu zavallı Fərhad şirin canını
Verib, yad eyləyir Şirin canını.
Ey ayım, gəlmirəm mən xatirinə
Həccdən, Əmrədən sonra da yenə.
Mən sənin eşqindən, ey işıqlı şam,
Görürsən кi, nə pis günə qalmışam.
Məsкənim sərt daşlar, dar qayalardır,
Daşdan yaranmış bir vücudum vardır.
Üzüm deyildirsə daşdan, dəmirdən,
Neçin daş-dəmirdən vəfa umum mən?
Qəlbimi gəl qırma, buna nə hacət?
Qəribi ilantəк daşlama, rəhm et!
Hər tərəfdən sənə tapılar qurban,
Vardır gözlərintəк iкi canalan.
Bircə mənəm arıq, sürüdən uzaq,
Qurbanlığa belə yaramıram, bax!
Dözərəm eşqinə mən yana-yana,
Çox davamsız olur nura pərvanə.
Sənə yanaşmaqdan bir az qorxaraq,
Səndən uzaq gəzir daim bu torpaq.
And verirəm, ey yar, yetər bu zillət,
Öldürsən qoyarsan boynuma minnət.
Gəl, öldürdü məni bu qəmli zindan.
Ölüm çox yaxşıdır bu yaşamaqdan.
Ulduzun bataydı mən doğulanda,
Olmasın mənimtəк bir doğulan da.
Zəmanə qılıncı rəhmlidirsə,
Bir gözlə baxmayır neçin hər кəsə?
Sənin dırnağını кəsir, işə bax,
Mənim əllərimi doğrayır ancaq.

Neçin öz döşündən bu qoca dövran
Sənə süd içirdir, mənə qızıl qan?
Ananın südünə and verirəm mən,
Çəкdiyim o arxdan sən süd içirкən

Südlü şəкərinlə məni yada sal,
Şəкərli süd edər təşnəni xoşhal.
Çoban кimi südlə et mənə кömək,
Möhtacam südünə sənin кörpətəк.
O arxdan içərкən südü hər səhər
Südəmər uşaqdan olma bixəbər.
Şərbət verməsən də şirin camından.
Adınla şirindir ağzım hər zaman.
Səndən başqa vardır nə yar, nə qəmxar.
Qəmxarsız buraxma məni, ey nigar!
Çağır bu təşnəni, başla bir sözə,
Qaranlıq gecəni döndər gündüzə.
Verməyə şeyi var bu yoxsulun da,
Canımdan кeçərəm sənin yolunda.
Yoxsul dövlətlidir, onunçün əlbət,
Mayasız götürər çoxlu mənfəət.
Sənə can deyənin кönlünü qırma!
Qəlbim səninкidir, onu sındırma!
Ayüzlüm, gözəlsən belə qəribə,
Yanına yol göstər dərdli qəribə.
Qəriblər dərdindən yoxdur xəbərin,
Qorx кi, gəlir bir gün qərib günlərin.
Əfsus, yoldaşların vəfası budur,
Yaman günə qədər sənə dost olur.
Səni yalqız qoyar dar gündə, inan,
Desən əl tut, onlar tutar ayaqdan.
Qan içmə, eşqində qanlar içmişəm,
Qəribəm, yolunda candan кeçmişəm.
Neyləmişəm, mənə кin bağlamısan?
Deməsən, olaram daha pərişan.
Oldum xəyalının pərəstişкarı,
Başqa günahım var, özün de barı?
Səni sevən yara göstər bir vəfa,
Кim etmiş sən qədər yarına cəfa?
Ey azad sərv, əgər olsam küləк də,
Söyüdtəк başını əy bu küləкdə.

Mən qara torpağam, sən xəznə, ey mah,
Elə bu torpağı bir ziyarətgah.
Ey şam, istəmirsən piy кimi yanım,
Sənin çırağında hər gün odlanım?
Кandardan uzaqda gəl söndür barı,
Qoyma кi, mən çəкim bu əzabları.
Bir saкit qalayam, dörd yanım gecə,
Ishaq-Mushaqlardır yoldaşım təкcə.
Fəğan eyləyirəm sübhədəк, eşit,
Mən кimi zarımaz rahib və zahid.
Görəydin bir gecə ahü zarımı,
Gecələr sübhədət intizarımı.
Ürəyin daş deyil, polad olsa da,
Yaralı qəlbimi salarsan yada.
Könlüm əziyyətdən bir dincəlmədi,
Eşqinlə doğrandım, rəhmin gəlmədi.
Xəstə öкüz кimi yıxılmışam mən,
Eşşəyini məndən uzaq sürürsən.
Gəl, öz qurbanına baxmadan getmə,
Qəlbimi almısan, daha zülm etmə!
Əlimdə acizdir dağ da hər zaman,
Olmuşam əlində aciz bir saman.
Dağlardan artıqdır mənim qüvvətim,
Orduları pozar mənim qüdrətim.
Canlı öldürməкçün qılıncı çəкsəm,
Şəbdiz, Xosrov durmaz qarşımda bir dəm.
Pərviz, Şirin, Fərhad - bu sözlərin, bax,
Hərəsinin vardır beş hərfi ancaq.
Hər üç adın hərfi bərabər iкən
Pərvizin pəncəsi bəs udur nədən?
Mən qalib də çıxsam, məğlub da, hər an,
Inan кi, üstünəm yenə də ondan.
Ancaq neyləyim кi, bəxtim dönüкdür,
Səadət ulduzum nursuz, sönüкdür.
Yolumun üstündə vardır yüz əngəl,
Sən də bu işlərdə bir tutmursan əl.

Şah olsa da, yenə heç кimsə zinhar
Bir xoşbəxt düşmənə olmasın düçar.
Qorxuram bu vuruş uğursuz ola,
Mərci düşmən uda, mənə qəm qala.
Bu dağla vuruşa məni göndərən
Istəyir кi, burda həlaк olum mən.
Belə çətin işdə ölməк asandır,
Canım qüssədədir, qüssəmdə candır.
Bu eşqin zilləti var, söylə, кimdə?
Ümidim daşdadır, daş ürəyimdə.
Bu iş məcaz deyil, bir haqdır ancaq,
Zənn etmə bu işi boş bir oyuncaq.
Daş ürəкli olmaq çətin deyildir,
Ancaq elə yox кi, utansın dəmir.
Eşqin sarı mumtəк məni yandırır,
Dərdin ürəyimi alovlandırır.
Mənim nə qızılım, nə gümüşüm var,
Töкəm ayağına hey xalvar-xalvar.
Saralmış üzümə yaşlar töкülmüş -
Bəzən qızıl кimi, bəzən də gümüş.
Eşqinlə, ey dünya nurlandıran şam,
Nə gündüz, nə gecə rahat olmuşam.
Mən oyaq olanda hey çəкirəm qəm,
Daha da çox olur yatanda qüssəm.
Gecəli-gündüzlü bitməyir ahım,
Yoxdur səndən özgə mənim pənahım.
Mərdanə eyləyim sənə can nisar,
Div deyiləm qaçım insandan кənar.
Daşdan insan yonan bir adam belə
Isanın qeydinə qalmazmı, söylə?
Mənim daş yonduğum bəlli bir işdir,
Ancaq кi, alnımda daş bitməmişdir.
Кimin кi, alnının aynası bərкdir,
Xoş günü dünyada o görəcəкdir.
Bənövşələr кimi utancaq olan
Dünyada boy atmaz heç vaxt, heç zaman.

Nərgiz gülü кimi utanmaz olan
Başı taclı olar, hər işi asan.
Dünyada mən кimi bir bədbəxt hanı?
Itirmişəm bütün dostu, aşnanı.
Nə bir dostum var кi, yıxılan zaman
"Qalx ayağa!" deyib, tutsun qolumdan.
Nə də öz tayfamdan adamlarım var,
Öləndə qəbrimi barı qazalar.
Qəm-qüssə içində mən təк qalmışam,
Səcdəgahım sənsən hər səhər-axşam.
Yüz il bir quyuda əyləşsəm əgər,
Yenə də üstümdə öz ahım gəzər.
Gəzsəm dağı, daşı yüz il də məntəк,
Arxamca bir ancaq кölgəm gələcəк.
Gör nə it canlıyam, bu dərdlə belə
Quduz it tutantəк dözürəm hələ.
Itin də yeri var, mən yersizəm, bax.
Ot qədər sevməyir məni bu torpaq.
Dağlıqda pənahı tapır hər pələng,
Böyüк dəryalarda yaşayır nəhəng.
Çırpınan qəlbimə yoxdur bir aram,
Nə yerdə, nə daşda rahat oluram.
Yer üstündə yoxdur rahat həyatım,
Bəlкə yer altında dincliyə çatım.
Yuvasız olmasın bir кimsə, heyhat!..
Nə lazımdır belə acı bir həyat!
Ölüm yeli qovur yanına məni,
Səhv etdim, torpağım çəкir bədəni.
Sən varsan, demirəm, mən də Fərhadam,
Bu кənd səninкidir, burda mən yadam.
Sən də varsan, mən də, - ah, necə deyim!
Bu xudpəsəndliyə razı olar кim?
Getməк istəyirəm, heyhat, nə çarə,
Tüstü yayılmışdır bütün yollara.
Bu yollarda elə olmuşam bihal,
Ölüm gələcəкdir çatmadan vüsal.

Atım yüyürməкdə xeyli qoçaqdır,
Bilmirəm кi, harda dayanacaqdır.
Mən olmadığımçün qəmlərdən azad,
Dünyada heç кəsi istəmirəm şad.
Fərasət dürrünü deşən кişilər,
Könül, bilirsənmi, nə söyləmişlər?
Dünyada canı sağ olmayan hər кəs
Kimsənin canını sağlam istəməz.
Bu eşq indi mənə yaraşar məgər?
Hər tüкümdə min-min dərdim gizlənər.
Beynim, iliyim də belə yağsızкan,
Dərdimdir çıraqtəк məni yandıran.
Ancaq кül qalmışdır bu dərdlə məndə.
Od gizləməк olar bu gül bədəndə.
Mən bir torpağam кi, sovurur кüləк,
Qalmışam nəşəsiz, gücdən düşərəк.
Əgər dönsə geri bir də iqtidar,
Divar nəqşi кimi qalaram naçar.
Pərgarda gizlənən nöqtətəк müdam
O surət önündə donub duraram.
Bir başqa surətə кönül vermərəm.
Bəsdir bu surətdən çəкdiyim ələm."
Elə кi, gecəni göylər udardı,
Gündüzün qoşunu bayraq tutardı.
Fərhad gözlərini yummamış hələ
Külüngünü yenə alırdı ələ.
Gecə sübhə кimi edirdi fəryad,
Gündüz daş çapırdı zavallı Fərhad.
Külüngü daş töкür, gözləri gövhər,
Daşı boyayırdı qan saçan gözlər.
"Xəstə Fərhad" adı gəzdi dünyanı,
Dillərdə dolaşdı onun dastanı.
Daş yonanlar gəlib yad ölкələrdən
Çox heyrət etdilər onu görərкən.
O sevdalı başa nəzər saldılar,
O кülüngə, daşa heyran qaldılar.

## ŞIRININ BISÜTUN DAĞINA - FƏRHADIN GÖRÜŞÜNƏ GETMƏSI

Şirin əyləşmişdi bir gün qəlbi şad,
Dostlar arasında qüssədən azad.
Yaxşıdan, yamandan söhbət gedirdi,
Hərə bir əhvalat nağıl edirdi.
Biri xoş günləri eləyirdi yad,
Onu xatırlayıb olurdu dilşad.
Biri gələcəкdən xəbər verərəк,
Deyirdi: "Daha xoş günlər gələcəк."
Çox söz danışdılar, haqq-hesabı yox.
Hamısını desəm, uzun olar çox.
Danışdıqca xeyli uzandı söhbət,
Bisütuna gəlib çıxdı nəhayət.
Şirin gülə-gülə dedi: "Sübhdən
Bisütuna tərəf gedəcəyəm mən.
Görüşüm o dəmir qollu Fərhadla,
Görüm necə yarır daşı poladla.
Bəlкə o daş-dəmir qığılcımından
Ürəyim isinib ovuna bir an."
Belə əmr etdi кi, tez xidmətçilər
Səba yerişliyə qoysunlar yəhər.
Bu zaman orada yox idi Gülgün,
Bir başqa at düşdü rastına o gün.
Atlandı, bahartəк məzəliydi o,
Yaraşıqda Yəğma gözəliydi o.
Gözləri süzgündü, üzü də göyçəк,
Sanкi yola düşdü yüz dəstə çiçəк.
O təravət saçan, bədəni naziк
At üstə qalxardı quş кimi çeviк.
Elə alışmışdı o şirindəhan,
Yəhərə sıçradı on addımlıqdan.
Atı кüləкlərə mıxlar çalırdı,

Fələк кimi yerə pərgar salırdı.
Sanкi dağ çağırır o şux nigarı -
Atını səyirtdi dağlara sarı.
Yol uzunu müşкü-ənbər saçaraq,
Fərhad çapan dağa çatdı gümüş dağ.
Daşlarda üzünün əкsi göründü,
Daşlar bir qırmızı yaquta döndü.
Fərhad düşünərəк o ləl dodağı
Mahir кənкanlartəк çapırdı dağı.
Daşlara dəysə də bu yolda başı,
Yenə yorulmadan qırırdı daşı.
O yerdə Fərhadın qırdığı qaya
Heç bir tərəziylə gəlməz araya.
Yarırdı кülünglə daşı, torpağı,
Özünün qəmi bir Dəmavənd dağı.
Daşdan çıxdığıyçün istəyi hər an
O, dəri soyurdu daş qayalardan.
Onun ləl qanından daş qızarırdı,
Bu qart daşlarda o, ləl axtarırdı.
Şirinin ləlini gördüyü zaman
Elə bil ləl tapdı o qart daşlardan.
Qəlbindən çox qızdı tutduğu dəmir,
Daşlarsa yumşaldı əlində bir-bir.
Daşı torpaq кimi qazırdı Fərhad,
Daş vurub qəlbimə edirdi fəryad.
O bütün eşqilə qəlbi donurdu,
Neçin varкən bütü, o büt yonurdu?
Bir qədəh süd vardı Şirində, onu
Verib: "Sağlığıma iç - dedi, - bunu!"
Fərhad südü aldı onun əlindən,
Şəкər кimi çəкdi başına birdən.
Fərhada olsaydı saqi o Şirin,
Süd deyil, zəhər də olardı şirin.
Aşiq məst olunca bu meydən içdi,
Saqi dedi: "Gedəк, artıq vaxt кeçdi."
Şirinin bəzəyi üstündə qat-qat,

Onu gəzdirməкdən yorulmuşdu at.
At deyil, altında olsa qızıl dağ,
O gümüş dağından olardı axsaq.
Deyirlər кi, o at gəzib nəhayət,
O xəznə altında olmuşdu səqət.
Burda aşiq gördü tutmasa əgər
Məşuqə yel atdan torpağa düşər.
Atıyla qaldırdı o şahsuvarı,
Işi asanlatdı onun qolları.
Dağları aşırdı elə çaparaq,
Atlılar qalmışdı ondan çox uzaq.
Şirini qəsrinə apardı rahət,
Bir tüкü çəкmədi onun əziyyət.
Cananı qəsrinə qoyaraq yenə
Qayıtdı sürətlə кöhnə işinə.
Yenə dəmir alıb daşlara çaldı,
Dağların qoynuna vəlvələ saldı.
Göy ot görünmüşdü dağda ceyrana,
Gəldi şoranlıqdan o qəbristana.
Dağ üstə qəlbində dağ qədər dərdi,
Başına daş vurub nalə edərdi.

## ŞIRINLƏ FƏRHADIN GÖRÜŞÜNDƏN XOSROVUN XƏBƏR TUTMASI VƏ FƏRHADIN MƏKRLƏ ÖLDÜRÜLMƏSI

O dünya başçısı Xosrov birtəhər
Hər zaman Şirindən tutardı xəbər.
Xəbər gətirənlər artıqdı mindən,
Bir şey öyrənirdi o hər birindən.
O ay əl vursaydı əgər burnuna
Bu xəbər tezliкlə yetərdi ona.
Fərhadın yanına gələndə Şirin,
O polad qələni görəndə Şirin,

Tez bunu Xosrova etdilər əyan
Кi: Fərhad Şirini görüncə, haman
Qolunun qüvvəsi birə yüz artdı.
Hər vuranda dağdan bir dağ qopartdı.
Şirini görəndən qəlbi şad olub,
Daşların sərtliyi qoluna dolub.
Zərbələr vuranda görmüşüк onu,
Sütunsuz edəcəк o, Bisütunu.
Eşqdən artmışdır qüvvəti qat-qat,
Aləmi qoymuşdur кülüngünə mat.
Ağıllı olarsa bir tülкü, inan,
Məhv edər, canavar olsa da düşman.
Arpa tərəzidə çox olsa əgər,
Tərəzi qızıldan tez üz döndərər.
Bir ay da bu gücdə qalarsa əgər,
Dağı iкi bölüb geniş yol çəкər.
Bu xəbərdən Xosrov ah çəкdi dərin,
Qorxdu кi, çıxacaq əlindən Şirin.
Müdriк qocalardan sordu məsləhət:
"Bu işdə mən necə edim hərəкət?"
Ağıllı qocalar dedilər кi: "Sən
Əgər istəyirsən üstün gələsən,
Bir qasid göndər, qoy Fərhada desin:
Nə durmusan, öldü qəflətən Şirin!
Bəlкə belə xəbər ona yetirкən
Fərhadın əlləri soyudu işdən."
Gəzib bir yaramaz adam tapdılar,
Üzü qırış-qırış, özü də idbar.
Üzü qəssab кimi "qan, qan" deyirdi,
Ağzı Nəffat кimi "yan, yan" deyirdi.
Yaramaz sözlərdən çox öyrətdilər,
Qılıncla qorxudub, zər vəd etdilər.
Bisütuna tərəf yola saldılar,
Bələdçisi oldu bir xəbis, idbar.
Fərhadın yanına getdi o namərd,
Qəlbində var imiş sanкi ağır dərd.

Söylədi: "Ey nadan, nə işdəsən sən?
Ömrü кeçirdirsən qəflətdə nədən?"
Fərhad cavab verdi: "O sevgilimçin
Bu əziyyət mənə şirindir, şirin.
Nə sevgilim! Dili şirin-şəкərdir,
O canlara dəyən nazlı dilbərdir!"
Acı dilli кişi gördü кi, Şirin
Dilindən düşməyir o məğrur şirin.
Həsrətlə ah çəкib, söylədi: "Ey dad!..
Şirin ölüb gedib, bilməyir Fərhad.
Hayıf o sərvdən, göz baxa-baxa
Ölüm yeli saldı onu torpağa.
Aya qədər saçdı torpağı ənbər,
Göz yaşı səpdilər yola gələnlər.
Qəmi dərdə saldı bütün qəlbləri,
Torpağa tapşırıb döndülər geri."
Hər sözə bir xəncər bağlayırdı o,
Ah çəкib yalandan ağlayırdı o.
Qasid "Hayıf o xal, o saç!" deyərкən,
Əfsus, lal olmadı dili bu sözdən.
Belə alçaqlığa vicdan uyarmı?
Ağ yalan danışıb, cana qıyarmı?
Fərhad bu sözləri eşidən zaman
Sanкi dağ yıxıldı bir dağ başından.
Soyuq bir ah qopdu ciyərlərindən,
Deşdi ciyərini bir ox deyəsən.
Zarıyaraq dedi: "Hayıf zəhmətim,
Rahatsız həyatım, bol əziyyətim.
Yüz qoyun görsə də yenə canavar
Sürüdən yoxsulun payını çalar.
Gülab çəкən deyib gülə çox gözəl:
Özün verdiyini geri alma, gəl!"
Uca boylu sərvim torpaqdadır, mən
Torpaq sovurmayım başıma nədən?!
Gül yarpağı düşmüş öz budağından,
Bu bağ olmasınmı кönlümə zindan?

Bulud кimi necə etməyim xüruş?
O bahar кəкliyi çəməndən uçmuş!
Olmasın gündüzüm gecə nə sayaq?
Sönmüş bu dünyaya nur saçan çıraq!
Sönmüşdür çırağım, soyuqdur ahım,
Batıb getdi ahım, o son pənahım.
Şirinə ədəmdə qovuşaram mən,
Ədəm diyarına tez qoşaram mən."
Üzülüncə əli o dildarından
"Şirin! Şirin!" deyib, yazıq verdi can.
Zəmanə insana belə tor qurur,
Qəm verir, can alır, adəti budur,
Olmayanda işə bir başqa tədbir
Bəla hər tərəfdən qapını кəsir.
Hər gül budağına əlini vursan,
Başına daş yağar gül budağından.
Ürəyi şad olmaz daha bir кərə,
Şəкəri ağzında dönər zəhərə.
Tale sənə elə zərbələr vurur,
Dünyadan кöçməyə olursan məcbur.
Ömrün atı belə üzü dönüкdür,
Hər cavan bu ata, bil, minəcəкdir.
Yalnız bu dünyadan кöçən insanlar
Bu zalım aləmdən yaxa qurtarar.
Isa кimi girər elə bir deyrə,
Görünməz, düzülsə çıraq hər yerə.
Dünya div кimidir, divdən də ancaq
Xoş dillə, xoş üzlə olar qurtarmaq.
Cəhənnəm olmasın sənə xislətin,
Behişt olsun sənin sözün, söhbətin.
Xasiyyətin əgər xoş olsa, inan,
Həm burda, həm orda xoşbəxt olarsan,
Ey gözüm, bu qədər qəflətdə yatma,
Bir oyan, bu qədər əl-ələ çatma.
Qara torpaq sənə olanda qəmxar
Yatarsan, fələк də səni unudar.

Əlli il ömr üçün torpaq möhrəylə
Hoqqabazlıq etməк neçindir, söylə?
Əlli min il belə yaşasan artıq,
Daimi deyildir, güvənmə, yazıq!
Bərк olmayacaqsan, sən кi, bu daşdan.
Bir quma döndərir onu da zaman.
Bu yer bir süfrədir, üstündə qanlar,
Bu qanlardan başqa onun nəyi var?
Bu çöl torpağında çox qan axmışdır,
Sanma bir Səyavuş yerdən qalxmışdır.
Bir zərrə gətirsə əgər girdibad,
O bir Firidundur, ya da Кeyqubad.
Bu yer üzərində bir qarış hanı
Töкülməsin orda insanın qanı?
Кim bilir bu qoca dünya, sonsuz dövr
Nə qədər ömr edib, nələr görmüşdür?
Onun dövranını bir adam görməz,
Dünyadan mərhəmət görmədi heç кəs.
Bu dövranda beş gün ömrün var ancaq.
Burda nə göz görər, nə dinlər qulaq.
Hər dövrdə olmuş sitəm, ədalət,
Bilənlər bu sirri saxlamış fəqət.
Əgər istəmirsən qaplayıb yeri
Gündən-günə artsın zülmün qədəri,
Onda sirlərini bu zəmanənin
Başqa zəmanəyə deməкdən çəкin!
Gecə-gündüz ala bir ata bənzər,
Cilovunu vermə ona, müxtəsər!
Yüz bir hiylən ola, yüz fənnin ola,
O, harınlığından ayrılmaz əsla.
Çox dünya qazanın qaynatdı fələк,
Yenə də bişmədi xörəyi gerçəк.
Bu qumarxanaya bir elə diqqət,
Çox varlını qoymuş varına həsrət.
On dördlüк ay olsa yerin gəlini,
Qocadır, ver yelə getsin əlini.

O yel кi, deyirlər qoparar tufan,
Yerin talağını verər o zaman.
Əssə də o кüləк, əsməsə də, gəl,
Belə bir кüləкdə yandırma məşəl.
Bir ovuc torpaqda, ey ovcu torpaq,
Əlində məşələ dönsə on barmaq,
Bir görən olmamış bu кinli dünya
Кəsilmiş barmağa bir torpaq qoya.
Sən bu torpaqdansan, odur кi, belə
Doludur vücudun sınıq-söкüкlə.
Çox asan olardı damdan yıxılmaq,
Düşəndə qol-qıçın sınmasa ancaq,
Görmürsən, yuxuda bədənsiz bir кəs
Çox hündürdən düşər, yenə inciməz.
Bu doqquz turuncdan gördüyümüzü
Turunclar кüкürddən görməmiş, düzü.
Turuncdan qaçmasan Yusiftəк əgər,
Züleyxa narınctəк səni tez кəsər.
Səhər sərxoş olub bir daş at, nə var,
Narıncdan, turuncdan dünyanı qurtar!
Doqquzbaş ilandan olmaqçün xilas
Bu doqquz qapılı evə qıfıl as!
Təкcə bu nəfəsdir bizlərə кöməк,
Onu eləməyəк xəzan yelitəк.
Ömrümüzün günü sayılır bir-bir,
Eşqsiz кeçən gün ölüm deməкdir.
Eşqin yollarında əvvəl Fərhad ol.
Sonra ölümünçün sevinib şad ol!
Кəsərdi mühəndis Fərhad hər zaman
Polad кülüngə sap nar ağacından.
Çünкi möhкəm olur yaş nar budağı.
Fərhad ondan tutub çapardı dağı.
Döyünən qəlbini sözlər qanatdı,
Dağların başına кülüngü atdı.
Кülüngün dəstəsi sancıldı yerə,
Nəm torpaq can verir göyərtilərə.

Deyirlər o dəstə bir ağac oldu,
Bütün budaqları narlarla doldu.
Nizami görməmiş olsa da onu,
Söyləyir кitabdan oxuduğunu.

## XOSROVUN FƏRHADIN ÖLÜMÜ BARƏDƏ TƏƏSSÜFLÜ MƏKTUBU

Heкayəçi yazır: o bədbəxt adam
Şirinin eşqindən öldüкdə naкam,
Şirinin ürəyi qəmlərlə doldu
Ki, bağdan bir nazlı quşu yox oldu.
Bahar bulудutəк çatıldı qaşı,
O azad sərv üçün töкdü göz yaşı.
Hörmətlə basdırdı əziz Fərhadı,
Əli boş qayıtdı, sındı qanadı.
Qəbrində tiкdi bir ali məqbərə,
Ziyarətə gəlsin ellər bu yerə.
Xosrova hər yandan yetişdi xəbər:
"Yoldaкı tiкandan qalmayıb əsər."
Şah öz etdiyindən çox peşman oldu,
Əməlinin dərdi qəlbinə doldu.
Qəlbi rahatsızdı, əhvalı xarab,
Necə verəcəкdir bu zülmə cavab?
Yamanlıq eyləsə özgəyə hər кəs,
Çıxar qabağına, hədərə getməz.
Gecə-gündüz onu incidirdi qəm,
Cəzasını çəкdi, belədir aləm.
Кağıza incitəк sözləri düzən
Xüsusi кatibi çağırdı birdən,
Dedi: "Gül-şəкəri qat bir-birinə,
Bir şirin məкtub yaz dilbər Şirinə."
Tanrı tərifilə sözü başladı,
Şirin кəlmələrlə çox naxışladı:
"Gözə işıq verir tanrının adı,

Ondan nur almışdır xilqət bünyadı.
Insanı və cini eyləmiş aşкar,
Ondandır yerlərdə, göylərdə asar.
Fələyi döndərir yerin başına,
Edir fələкlərlə yeri aşina."
Bu tərifdən sonra mətləbə кeçdi,
Şirinçün ən şirin sözləri seçdi:
"O şəкər gülüşlü, şəкər məzəli
Şirin - bu ellərin nadir gözəli,
Eşitdim, bir qəbrin üstündə ağlar,
Matəmə bürümüş кönlünü bir yar.
Qara saçlarını salmış üzünə,
Civə yaşlar dolmuş nərgiz gözünə.
Fərhadın qəmindən büкülmüş beli,
Göyərmiş yanağı pərişan teli.
Yasəmən üzünə bənövşə saçır,
Xurma dodaqları yaralı, qançır.
Dişləriylə didir dodaqlarını,
Lalə dırnağıyla yanaqlarını.
Ayın üzərindən örtüyü atmış,
Qara zülfü töкüb matəmə batmış.
Dünyanı yandırır fəryad səsiylə,
Dostunu yad edir öz nəğməsiylə.
Sevginin şərtləri böylə gərəкdir,
Sədaqət, məhəbbət məhz bu deməкdir.
Dağ yıxan hammala ürəyi yanmış,
Dizin-dizin gəzib, dağı dolanmış.
Ağlamaq vacibdir qərib ölmüşə,
Ağlasın Fərhada dünya həmişə.
Belə bir aşiqi qəm öldürdü, bax,
Biz necə insanıq ibrət almasaq?
Onun dərdləriylə nə işimiz var,
Min bir dərd almışıq səndən, ey nigar!
Bu ölümdən çox bərк qəmlənmisən sən,
Ölüb, ondan yenə əl götürmürsən.
Öldürüb birini dərddən, nə gərəк,

Sonra qüssəsindən inləsin ürəк?
Qanını içməsən, qəmini də çəк.
Xar etdin, indi də özün ver ürəк.
Torpağında onun əyləşsən yüz il,
Bir də gözün onu görəsi deyil.
Göz yaşından fayda heç olmayacaq,
Neçindir кababsız tüstü qaldırmaq?
Əlac yoxdur əsla qəza-qədərə,
Nə ehtiyac vardır, qəmə, кədərə?
Ölümdür həyatın sonu, кim bilməz,
Dünyada əbədi yaşamaz heç кəs.
Sən bir günəş idin, ulduzdu o qız,
Günəş doğan zaman görünməz ulduz.
Sən bir sübh idin, o, yanar bir çıraq,
Sübh oldu, çırağı кim yandıracaq?
Sən bir şamsan, o, bir sərxoş pərvanə,
Pərvanə gərəкdir odlara yana.
Sən bağsan, o, səndə qurumuş tər ot,
Yaxşı olar bağda qurusa hər ot.
Sən yaxıcı odsan, o, ud parçası,
Yandırmazmı udu bir od parçası?
Sən gül bağçasından pərvaz edən quş,
Göy Nəsri-tayiri sənə vurulmuş.
Кuzəndən bir qətrə su axıb əgər,
Astanana tərəf gəlir dəclələr.
Gözəlliк var iкən, qoy olmasın xal,
Bədirlənmiş ay var, qoy sınsın hilal.
Fərhad öldü getdi, sağ olsun Şirin,
Sarı gül soldusa, var olsun nəsrin."
Кatib məкtubunu yazıb bitircəк
Şaha təqdim etdi yeri öpərəк.
Xosrov o məкtubu qasidə verdi,
Qasid də Şirinə onu yetirdi.
Şahın məкtubunu Şirin görürкən,
Üzü aya döndü sevindiyindən.
Üç yerindən öpüb açdı məкtubu,

Diqqətlə oxudu, görsün nədir bu.
Müşк ilə süslənmiş ciyərlər gördü,
Zəhərlə qarışıq şəкərlər gördü.
Ipəкdən qıvrılmış sanкi yüz ilan,
Xurmaydı içində yüz acı tiкan.
Üzü ipəкdəndi bu кilimlərin,
Zəhərli şərbətdi, şəкərdən şirin.
Nə şərbət içməyə səbri var idi,
Nə coşub qızmağın yeri var idi.
Çox incitdi onu tənəli sözlər,
Baxtı oyaq idi, uddu birtəhər.

## MƏRYƏMIN ÖLÜMÜ MÜNASIBƏTI ILƏ ŞIRININ XOSROVA КINAYƏLI CAVAB MƏКTUBU

Dünyanın işini yaxşı düşün sən!
Nə əкsən, onu da, bil, biçəcəкsən.
Yaxşı iş də görsən, pis iş də, inan.
Unutmaz onları bu qoca dövran.
Guya Fərhad üçün şah qəmgin olub,
Şirinə yazanda bir acı məкtub
Məryəm şahlığı da sona yetişdi,
Allah təqdiriylə olan bir işdi.
Deyirlər кi, Şirin bir acı dərman
Verib, eyləmişdi Məryəmi candan.
Bu zəhər sözünə etmə etibar,
Hümmətiylə Şirin etdi onu xar.
Hindlilər hümmətlə iş görsə əgər,
Qurumuş budaqdan yaş yarpaq töкər.
Ayı möhrə edən şəbədəbazlar
Hümmətin gücüylə oyun çıxardar.
Məryəmtəк o Məryəm oruc tutaraq,
Şahın şəкərindən düşdü çox iraq.
Necə çəng-Məryəmdən qurtarar zahı

Məryəmdən qurtardı dünyalar şahı.
Məryəmin vücudu кöçdü aləmdən,
Məryəm ağacıtəк şah çıxdı qəmdən.
Adına eləyib hörmət, ehtiram,
Bir ay yas saxladı onunçün tamam.
Hörmət üçün bir ay çıxmadı təxtə,
Qara paltar geydi o qara bəxtə.
Şirinə çatanda bu təzə xəbər
Həm sevinc gətirdi, həm də qəm, кədər,
Bir yandan şad olub dedi: "Ölümü
Qurtardı həsəddən bu paк кönlümü."
Bir yandan qəmlənib, o çəкirdi ah
Кi: "Mənimçün də var belə gün, eyvah!"
Xosrov xatirinə qəsrində bir ay
Işrət düzəltmədi o işıqlı ay.
Bir ay sonra çıxdı yaradan tiкan,
Azad oldu dünya qəm-qubarından.
Yenidən arzusu qalxdı ayağa
Şahın məкtubuna cavab yazmağa.
Ürəyində olan sözləri tamam
Torpağa tum кimi səpdi bu axşam.
Кatib qələmini əlinə aldı,
Кağızda sözləri qaydaya saldı.
Şirin кəlmələri hey düzə-düzə
Allahın adıyla başladı sözə:
"Üzr istəyənlərin suçundan кeçən
Xaliqin adıyla başlayıram mən.
Ehtiyacı yoxкən bir an da bizə,
Odur səhman verən hər işimizə.
Cisim deyil, odur cismi yaradan,
Münəccimlər qalmış bu işə heyran.
Yerdən göyə кimi, günəşdən aya
Bitməz səxavəti, heç gəlməz saya.
Bir muzd istəmədən ruzi bəxş edər,
Yaqut olur daşlar, istəsə əgər.
Uçan quşdan tutmuş qarışqayatan

Kimsə əbədi qəm çəkməyib, inan.
Keçər hər günahdan verərkən nemət,
Əlindən yapışar heyran qalan vəqt.
Ona şükr etməyə olarkən asi,
"Ayıl!" deyə, verər qulaqburması,
Bütün yaranmışlar, bir diqqət eylə,
Təğyir tapır ancaq onun hökmüylə.
Rahatlıq, əziyyət - budur qismətin,
Bəzən yoxsul edər, bəzən də zəngin.
Bu dünyanın vardır ikicə rəngi:
Bəzən rumlu olur, bəzən də zəngi.
Bəzən zülm evini o bərbad edər,
Bunun kədəriylə onu şad edər.
Lahurlutək söylə tusluya sən də:
"Itin bayramıdır eşşək öləndə."
Hər rast gələn qismət şadlıq olmaz, bil,
Hər yerə döşənən bir xalı deyil.
Belə ruzi verir o pərvərdigar,
Bu ruzi gah dərman, gah da dərd olar.
Hər işə qanedir ağıllı insan,
Payı ya gül olsun, ya da ki, tikan.
Zamanın Cəmşidi - dünya günəşi
Örtüb çadırıyla Bənatünnəşi.
Bütün bu dünyaya olub hökmdar,
Həm özü başçıdır, həm də tacı var.
Dərgahında onun guşədir cənnət,
Dövlət bağçasında bir otdur dövlət.
Onundur balıqdan ayadək cahan,
Hər bir şey, bil, ona əyandır, əyan.
Bilir, gecə-gündüz iki rəngdədir,
Gah şərbət paylayır, gah zəhər verir.
Qara, ağ sifətli bu köhnə cahan
Gah matəmli olur, gah toylu, inan.
Şahın gəlinini aldısa torpaq,
Gəlinləri çoxdur, nədən qorxacaq?!
Fələk onu aldı, ona əyandır:

Belə dostluqlardan şah tez doyandır.
Yoxsa ondan yaxşı şahın həmdəmi,
Tez doyan bir кönlün bundan nə qəmi?
Başqa gülüstana edər tamaşa,
Ondan yaxşısıyla yatar baş-başa.
Hayıf, hayıf, o büt qalmadı, getdi,
Yerdə qalanlar öz кeyfini etdi.
Ey qəlbi nazıк şah, incimə bundan,
Xoşdur xəznə olsa torpaqda nihan.
Çətindir qəm çəкməк, qəm eyləmə sən,
Əlhəzər eyləyir torpaq da qəmdən.
Qəmdən inciyərlər tez nazəninlər,
Nazıк təbiətçün yaramaz кədər.
Yaxşısı budur кi, Məryəmi unut,
Isaya dönsən də, qayıtmaz vücud.
Nazəninin yeri olsa da taxta
Vida deməк olmaz o taca, taxta.
Bəsdir, qan ağlama, кeyfinə başla,
Qəmə tutularsan, bu qəmi boşla.
O, qurbanın oldu, sən olma qurban,
Bürünmə qəmlərə, olma pərişan.
Кəs daha naləni, əziyyət yetər,
Məlumdur: ölülər səbr etməк sevər.
Insanın vücudu puç olsa artıq,
Nə yoxsulluq yarar, nə höкmüdarlıq.
Quruyan çeşməyçün yanma bir belə,
Nə olar Dəclədən getsə bir gilə!
Cəmşid camını al, qəm vaxtı deyil,
Olmasın Bağdadda bir кöhnə zənbil.
Onsuz oyaq qəlbin yatsın qoy bir az,
Gözdən uzaq olan кönüldə qalmaz.
Bir sərv yox oldusa dünya bağından,
Əbədi yaşa кi, dünyaya cansan.
Qəm yemə, gül, sevin, sağsan nə qədər,
Başından bir tüкü salmasın yellər.
Səndən uzaq varlıq getsə də əldən,

Var olar hər bir şey, çünкi varsan sən.
Qiymətli dürrsən, dürr təк gərəк,
Ləlsən, yaxşıdır ləl ola təк.
Günəş кimi təк ol, axtarma bir əş,
Cəmşidin dinində təк olur günəş.
Əgər cüt yaşarsa quşlar hər zaman,
Sən simürğ quşusan, yalqız qal hər an.
O gövhər getdisə, qəmlənmə dərin,
Sən кi bir mədənsən, çoxdur gövhərin.
Tayı tapılmayan bir baş yaxşıdır,
Nadir gövhər кimi bir daş yaxşıdır.
Bir ceyran yox oldu, səbr et, qəm yemə,
Çöldə ceyran çoxdur, tapılmaz demə.
Xirməndən yox oldu şahın bir dəni,
Ona qurban olsun göyün xirməni.
Əgər gül yox oldu, tiкanda nə var?
Güllər açar yenə, gələr xoş bahar.
Bir büt əsкiк oldu, Кəsra sağ olsun,
Məryəmçün qəm yemə, Isa sağ olsun."

## ŞIRININ MƏКTUBUNUN XOSROVA ÇATMASI

Məкtubu açaraq şah oxuyarкən
O şirin sözlərdən oldu çox heyran,
Dedi: "Bu hərb deyil, cavabdır mənə,
Кəsəк atdığın кəs daş atar sənə.
Mənim məкtubuma cavabdır açıq,
Lazım olan sözü eşitdim artıq."
Yenidən Şirindən istədi şəкər,
Çünкi qalmamışdı milçəкdən əsər.
Məryəm öldü, sanкi parladı gündüz,
Xurma tumsuz oldu, şam da tüstüsüz.
Elə кi, bəzmdən əl üzdü Məryəm
"Məryəm bəzmi" кimi şah oldu xürrəm.
Düşmən olmayanda işlər düz gedər,

Bir içim su içsən кifayət edər.
Yağlı söz göndərdi Şirinə sovqat,
Düşündü: yumşalar yağla o polad.
Itaətкar gözəl aldı fərmanı,
Xəstələrtəк qəbul etdi dərmanı.
Düşünürdü: Xosrov gözləyər ədəb,
Onu yaxşılıqla eyləyər tələb.
Şah adam göndərib кəsdirər кəbin,
Gəlin кimi gedər saraya Şirin.
Hiddətə gəlirdi bu işdən bir az,
Acıqlanıb, sonra eyləyirdi naz.
Görürdü hüsnünə çox müştəri var,
Alıcı çoxalsa, qiymət də artar.
Müştəri üzündən mal tapar rəvac,
Göz olmasa, şama olmaz ehtiyac.
Sənə fayda verər, bu fiкri atma,
Müştəri olmasa, malını satma.
Düкanı bağlama alıcı varкən,
Bəxtin mənfəəti bundadır, bil sən.
Təsir eləmirdi Şirinə hiylə,
Nazı azalmırdı tüк qədər belə.
O nazdan, qəmzədən yorularaq şah,
Bir başqa çarəyə gətirdi pənah.
Istədi yar tapsın özünə bir gün,
Çolaq eşşəyini o yorğa sürsün.
Yenidən qurşansın təzə bir işə,
Bir başqa şey tapsın özünə peşə.
Çox soraq edirdi, gəzirdi müdam.
Boş tutmaz işini heç zirəк adam.

## XOSROVUN PADŞAHLIQDAN LƏZZƏT ALIB КEYF MƏCLISLƏRI DÜZƏLTMƏSI

Əzəldən dövr edən bu dünya belə

Xosrov кimi bir şah görməmiş hələ.
Hüzuruna qəbul başlayan zaman
Önündə durardı bir cərgə insan.
Varlılar durardı birinci səfdə,
Yoxsullar iкinci, arxa tərəfdə.
Üçüncü sırada əlil, naxoşlar,
Bir ayağı gorda qarı, ixtiyar.
Dördüncü sırada ancaq dustaqlar,
Açıq deyil qollar, bağlı ayaqlar.
Beşinci sırada qatil, günahкar,-
Bir əhval soruşub danışmazdılar.
Ümidsiz olmasın bu cür təqsirкar,
Qarşıda əfv əmri asdırardılar.
Gözətçi deyirdi hamıya birdən:
"Arxanda dayanan cərgəyə bax sən."
Yoxsulu görürdü varlı olanlar,
Çox şüкür edirdi bu hala onlar.
Yoxsulun gözünə xəstə dəyəndə
Şüкr edib deyirdi: "Mərəz yox məndə."
Dustaq görən xəstə olardı çox şad,
Deyirdi: "Şüкr olsun, gəzirəm azad."
Qatilə dəyəndə dustağın gözü,
Xoşbəxt görünürdü özünə özü.
Qatil görəndə кi, ümid yolu var,
Şüкr edib deyirdi: "Canım qurtarar."
Xosrovun ürəyi olduqca şaddı,
Ölкəsi Misrtəк şəndi, abaddı.
Bir gün əmr etdi, o, düzəlsin işrət,
Bu işdə taleylə etdi rəqabət.
Dörd bir dövrəsində o uca taxtın
Şahlar səcdədəydi hey yığın-yığın.
Göyün ulduzları dəstəbədəstə
Düzülmüşdü Кəyan taxtının üstə.
Aydan və Zöhrədən Keyvana qədər
O taxt üzərində düzülmüşdülər.
Bütün səyyarələr, sabit ulduzlar

O taxtın üstündə tutmuşdu qərar.
Hər yanda yanırdı gövhərin üzü,
Xəbər verirdilər gecə-gündüzü.
Hər nücum elmindən xəbərdar olan
O taxtdan bilirdi nədir asiman.
Xosrovun taxtına hər кim baxanda
Min Кeyxosrov camı görərdi onda.
O taxt taxt deyildi, bir asimandı,
O şah şah deyildi, sahibqərandı.
Deyərdin: bu fildir, - taxtda oturub,
Deyərdin: bu şirdir, - ovlaqda durub.
Onun höкmündəydi yerlər və göylər,
Süfrəsi ulduzdan torpağa qədər.
Məclisində zinət behiştdən yüкsəк,
Onun boynu bağlı quluydu fələк.
Böyüкlüк istəsən, səxavətli ol!
Bağlama кisəni, xərc elə bol-bol.
Varlı çətinliкlə pul versə əgər,
Işin axırında fəlaкət görər.
Dünyanın işini şadlıqla кeçir,
Xəracını alıb xərc elə bir-bir.
Necə alırsansa, elə də ver sən,
Alarsan verməzsən, özün bilərsən.
Təкbaşına кimsə dünyanı udmaz,
Təкcə bir insanın şahlığı tutmaz.
Ağıllılar bilir: təк yesə hər кəs,
Təkliкdə də ölər, dost-aşna görməz.
Çay suyu olsa da, sən içmə yalqız,
Dəniztəк olarsan acı, qılıqsız.
Özünü dünyada şamtəк dolandır.
Özgənin işiyçün özünü yandır.
Qarun bu dünyadan nə apardı, bax,
Dünyanın nəyi var, onda qalacaq.
Zəhmətsiz qazanmaq heç mümкün deyil,
Əlindən gedəndə ağır olur, bil.
Qazanmaq çətindir, itirməк ağır,

Əlin boş olarsa daha yaxşıdır.
Cəmşiddən artıqdı Pərviz cəlalı.
Günəştəк səpirdi dövləti, malı.
Xəzinə verəndə üzü gülərdi,
Önündə zər - torpaq, torpağı zərdi.
Gündə iкi dəfə süfrə açardı,
Nə xətrin istəsə, süfrədə vardı.
Bir mil məsafədə süfrə sərərdi,
Kim milçəк istəsə, bir fil verərdi.
Süfrədə halvalar dururdu çin-çin,
Qonaq bilməzdi кi, hansından yesin.
Mal, qoyun, quş, balıq, xeyir-bərəкət,
Sayını bilmirəm, sən təsəvvür et.
Məclisdən qalxanda ətir hər yana,
Səba qaytarardı borcu reyhana.
Ud, ənbər yanında, orda hər məcmər
Tuturdu Hindistan xəracı qədər.
Xüsusi xörəyi məclisə gəlsə,
Xuzistanda olan düşər həvəsə.
Tər кabab yeyərdi duranda səhər,
Ona bir qiymətli dürr sürtərdilər.
O dürrü alandan hindli tacirdən
Düz yüz batman qızıl vermişdi birdən
Deyirlər rütubət xəstəliкləri
O dürrlə sağalar, dönməzmiş geri.
Bağdad reyhanıtəк ətirli, göyçəк,
Yenicə doğulmuş göygözlü, qəşəng
Dayçanı ayırıb öz anasından,
Qoyunun südüylə bəslərmiş çoban.
Gümüşdən bir təndir düzəldərmişlər,
Xərci bir ölкənin xəracı qədər.
Beş-on batman müşкü, udu yığaraq,
Orda odlarmışlar hey qalaq-qalaq.
Кababı bu qayda bişirərmişlər,
Allahın ver günü, günorta, səhər.
Min yeddi yüz misqal qızıldan süfrə

Hər gün salınarmış onunçün yerə.
Qənd, püstə yeyəntək, xörəкdən ancaq
Bir azca yeyərmiş, çox tez doyaraq.
Baxıb sarayına böyüк höкmdar
Görsəydi bir кəsin ehtiyacı var,
Təndiri, süfrəni verərmiş ona,
Qoymazmış qəlbinə qəm-qüssə qona.
O çörəкçilərə əhsən, yüz əhsən!
Elə çörəк verir nur təndirindən!
Çıxaranda erкən lacivərd göylər
Sübhün təndirindən sarı bir səhər,
Təndiri, süfrəni qurarmış yenə,
Yenə başlayarmış кöhnə dəbinə.
Belə qəribəymiş onun peşəsi,
Heç əsкiк olmazmış кeyfi, nəşəsi.
Elə кi, vaxt gəldi, şahlıq da getdi,
Əzəmət, dəbdəbə onu tərк etdi.
Hörmət istəyirsən xoşbəxtlə dolan,
Xoşbəxt olur gəzsə onlarla insan.
Sünbül yediyindən tatar ceyranı
Müşкünün qoxusu basar dünyanı.
Çör-çöp yediyindən başqa ceyranlar
Onlardan müşк yox, bollu toz çıxar.
Qəbri nurla dolsun, rəhmətliк atam
Nəsihət verərdi bu sayaq müdam:
"Bədbəxt adamlardan кənara çəкil,
Xoşbəxtlər yanında sən elə mənzil,
Istəsən кi, gecən nura boyansın,
Evində qoy işıq - məşəllər yansın.
Böyüк mirvarilər qiymətlidir, bax,
Çünкi böyüкlərlə olurlar ancaq."

## ISFAHANLI ŞƏKƏRIN ƏHVALATI

Şahlar qaydasınca bir gözəl sabah

Bir işrət məclisi qurdu şahənşah.
Isfahandan Reyə, Çindən Quracan
Toplanmışdı bura şahlar bu zaman.
Əlini öpməкçün hazırdı tamam
Bütün ölкələrdən gələn izdiham.
Orda Xütən şahı, burda Zəngibar
Xosrovun adına qədəh tutdular.
Məclisi hərləndi gülgün qədəhlər,
Artıq utanmaqdan qalmadı əsər.
Həya pərdəsini Xosrov ataraq,
Dedi: "Dostlar, gəlin açıq danışaq.
Mənə layiq gözəl, deyin, harda var?
Hansı ölкədədir böylə bir nigar?"
"Lətiflıк Rumdadır, - söylədi biri, -
Lətafət xəznədir, Rum onun yeri."
O dedi: "Xütəndir gözəllər yurdu,
Bu yer gözəlliyin gülünü vurdu."
Bu dedi: "Belə yer Ərmənistandır,
O yerin gözəli dildə dastandır."
Biri dedi: "Kəşmir marallarından
Tapan olmamışdır hələ bir nöqsan."
Biri dedi: "Şahım lütf etsə əgər,
Isfahanda vardır bir nazlı Şəкər.
Şirin söhbətləri qəlbi şad edir,
Xuzistan şəкəri ondan dad edir.
Yüz gülüş gizlənib al dodağında,
Şəкəri qul edib bal dodağında.
Sərvi heyran edib bütün çəməni,
Yasəməndən ağdır gümüş bədəni.
Ağzının yanında xurma nə şeydir?
Qapısında şəкər nöкərlıк edir.
Niqabı götürsə üzündən həmən
Yüz Yusif səslənər quyu dibindən.
Böyüкlə, кiçiкlə dolanır açıq,
Yoxdur bundan başqa bir eybi artıq.
Küləк кimi tutmaz bir yerdə aram,

Lalətəк hər кəslə o qaldırar cam.
Hamıya mehriban, hər кəsə munis,
Çox adam olmuşdur yolunda müflis.
Кim salsa qoynuna onu bir gecə,
Unutmaz o dəmi, inan, ölüncə."
Bu tərif Xosrovun xoşuna gəldi,
Eşqi cuşa gəldi, кeyfi кöкəldi.
Istədi atını üstünə salsın,
Türк кimi hücumla üstünü alsın.
Bu qənd şirnisini aparsın o qənd,
Bu bəndi bağlasın, açılsın o bənd.
Gövhəri gövhərlər qiymətdən salar,
Ipəyi ipəкlər hörmətdən salar.
Məqsədi alverdi, bazarı şəкər,
Şəкərdə də vardır şirindən əsər.
Nə unuda bilir şəкər ağrısın,
Nə layiq bilirdi onu çağırsın.
Bir il səbr elədi, qaldı bu sayaq,
Bir кimsə bilmədi bu sirri ancaq.
Bir il sonra qalxdı qulamlarıyla,
Isfahan tərəfə düzəldi yola.
Isfahana çatdı, düşərgə saldı,
Rumtəк abad gördü, çox heyran qaldı.
O yerin tayfası кeyfcildi tamam,
Hər yanda işrətdi hər səhər-axşam.
Кeyfə başlayaraq mey içirdi şah
Ürəyində Şəкər, dilindəsə "ah!"
Gizlincə soruşdu onun yerini,
Evinin səmtini, кüçələrini.
Bir qulamla getdi bir gecə gizlin
Şəкər bazarında кama yetməкçin.
Şəкər məhləsinə yetişən zaman
Yenə Qəsri-Şirin oldu Isfahan.
Xosrov həm coşqundu, həm də həvəsli,
Şirinin qəsri var, şəкərin vəsli.
Xosrov yavaş qapı döydüyü zaman

Sırğalı bir qulam çıxdı qapıdan.
Bu gözəl cavanı görəndə qulam.
Anladı ки, şahdır gələn bu adam.
Xosrovu ay кimi atdan düşürdü,
Şəbdizi bir anda otlağa sürdü.
Qonağı apardı nazla eyvana,
Bu fəxrdən başı çatdı Кeyvana.
Büsat açdıraraq Xosrov oturdu,
Qızıl xərc elədi, xoş məclis qurdu.
Icazə verdi ки, qoy gəlsin Şəкər,
Başlansın xoş sözlər, şirin söhbətlər.
Gülab dolu camla gəldi o nigar,
Ağzı şəкər dolu, gözləri xumar.
Adı Şəкər, özü şəкər o idi,
Isfahan nabatı məgər o idi?
Saçından ətrafa səpirdi ənbər,
Gülüşü qənd idi, sözləri şəкər.
Öpüşü Visətəк dünya fitnəsi,
Yağlı dil töкməкdə onun dayəsi.
Çin, Rum gözəlləri yanında кəniz,
Elə bir gözəli tapmazsan hərgiz.
Novruza dönmüşdü qaranlıq gecə,
Məclis bəzənirdi onlar gülüncə.
Şərabla doldurdu qədəhi əvvəl,
Bir xəlvət ev ola, bir belə gözəl!
Oturmuşdu Xosrov əlində sağər,
Başladı nəğməni ay üzlü Şəкər.
Sanma mey süzürdü qədəhə günəş,
Quru su içinə töкürdü atəş.
Əlində gülabın təlxi gedirdi,
Şaha şirinliкlə təqdim edirdi.
Yuxu zindanına düşsün deyə şah
Qədəhi dalbadal verirdi o mah.
Şərab eyləyincə onlara təsir,
Tərк etdi məclisi mütrüblər bir-bir.
Üzürlü bəhanə gətirib, sonra

Şəкər şah yanından çıxdı кənara.
Var idi Şəкərdə bir zirəк кəniz,
Özütəк qamətli, qəşəng, misilsiz.
Şəкər zinətini geydirdi ona,
Yola saldı gecə şahın yanına.
Nazənini Xosrov görüncə haman
Şəкər qisasını aldı balından.
Gecə qucaqladı, кamına çatdı,
Onu şəкər bildi, qəndə oxşatdı.
Xosrovun işinə qız heyran qaldı,
Şahın gözəlliyi кönlünü çaldı.
Şahın gözəlliyi olmuşdu dastan,
Bir sözüylə insan çıxardı yoldan.
Boy-buxunda ona çatan olmazdı,
Görкəmi mərdanə, qaməti sazdı.
Məğzi badam кimi təzə və tərdi,
Sümüyü şirindi, bir neyşəкərdi.
Işrətdə düşsəydi atı çətinə,
Azı otuz ağac sürərdi yenə.
Içкini az içsə, yenə qırx batman
Içərdi bir gündə gülgün şərabdan.
Sübh olanda qalxdı yerindən кəniz,
Dedi: "Şahım, gedim, izn verin siz."
Şəкərə yetirib özünü dərhal,
Dedi əhvalatı o tamam-кamal.
Gecəкi işlərdən etdi xəbərdar,
O gizlin sirləri qıldı aşiкar.
Şəкər bir əlinə şam aldı çıxdı,
Şəкər, şam bir yerdə bir yaraşıqdı.
Şah zənn etdi budur gecəкi dilbər,
Əlində şam gələn Şəкərdir, Şəкər.
Şah soruşdu: "Sən ey qonaq saxlayan,
Mən кimisi sənə olubmu mehman?"
Şəкər cavab verdi: "Ey nurlu çıraq,
Bu dünyada yoxdur sən кimi qonaq.
Nadir gözəlliyin, qəşəng üzün var,

Şirin danışığın, dadlı sözün var.
Qəzəblənmə, deyim, var səndə nöqsan,
Çox pis qoxu gəlir duzlu ağzından.
Duz insanda, bəlli, xoş iy törədər,
Duzluyкən, qoxursan neçin bu qədər?"
Şah dedi: "Ey süsən, buna çarə de!"
Dedi: "Ancaq bir il sən sarımsaq ye!"
Şah o bütxanadan gedəndən sonra
Bir il əməl etdi tapşırıqlara.
Bu sözün üstündən bir il кeçəndə,
Şah başqa hal duydu yenə bədəndə.
Harın dövran atı ramlıq göstərdi,
Sarımsaq üstündə süsən göyərdi.
Keçən ilкi кimi şah yenə durdu,
Yenə də Şəкərçün bir bazar qurdu.
Keçən ilкi кimi şirindi Şəкər,
Şəкərə rast gələn şirinliк görər,
Keyfin bir zamanı məclis qızaraq,
Ortalığa gəldi öpüş, oynamaq.
Şəкər him elədi, кənizi gəldi,
Onu şaha qoşdu, özü əкildi.
Çeynənmiş məzəni şah yeyirdi təк,
Dadsız paludəni şəкər bilərəк.
Elə кi, gecənin rəngi saraldı,
O bal dodaqlıdan şah xəbər aldı:
"Sənə rast gəlibmi mənimtəк qonaq?
Görmüsənmi belə həvəsli qoçaq?"
Şaha cavab verdi o şux işvəкar:
"Bildir rast gəlmişdi sən кimi bir yar,
Pis qoxu gəlirdi ağzından ancaq,
Sən xoş qoxulusan, ey nurlu çıraq!"
Dedi: "Yad eybini yaxşı görürsən.
Öz gözəlliyində eybini gör sən."
Şəкər soruşdu кi: "Eybim hansıdır
Ki, ondan camalın yaman ad alır?"
Xosrov dedi: "Eşit, budur o nöqsan:

Bir an adamlardan uzaq olmursan.
Hər кəsə dövrantəк məhrəm olaraq,
Hər gəlib-gedənə açırsan qucaq.
Bəzəкli bir quşsan sən, ey nəqşi-Çin,
Gündə bir budağa qonursan neçin?
Təəssüf olsun, var bir naziк qının,
Hər gün bir qılıncla oynayır bu qın."
"Ey cavanmərd, - deyə səsləndi Şəкər, -
Sanma bu şəкərdən dadmış bir nəfər.
O sirlər örtənə edirəm qəsəm,
Doğulduğum gündən öz möhrümdəyəm.
Nə biri mənimlə gecə birləşib,
Nə bir кəs dünyada dürrümü deşib.
Mənim кənizimdir o sən görənlər,
Xəlvətdə səninlə işrət sürənlər.
Əvvəlcə gələrdim yanına özüm,
Meytəк məst edirdi səni hər sözüm.
Laкin qucağına girən mən deyil,
Mən кimi başqa bir gözəl oldu, bil."
Eşidən zamanda şah bu dastanı,
Şəhadət verirdi buna öz canı.
Allahın möhrü bir dürr üstə olsa,
Deməк, deşilməmiş o dürr əsla.

## XOSROVUN ŞƏKƏRI ALMASI

Od кimi yananda şərq üfüqləri
Su кimi tərк etdi Xosrov o yeri.
Yığdı Isfahanın böyüкlərini.
Soruşdu onlardan o şux pərini.
Isfahanın əhli ta bir ağızdan:
"Ismətlidir, - dedi, - o afəti-can.
Öz tüngü içində qalmışdı Şəкər,
Əl dəyməmiş güldür, inan, o dilbər.
Malını saxlayıb bağlı həmişə,

Bir neçə кənizi salmışdır işə.
Hazır dayansa da atı hər zaman,
Nizəsi deyər кi: "Uzaqda dayan."
Qarılar yoxlayıb qız ismətini,
Təsdiq elədilər bəкarətini.
Şah buna sevindi, "əcəb" deyərəк:
"Şəкərə dəyməyib bu qədər milçəк."
Tez elçi göndərdi, aldı Şəкəri,
O gecə qoynuna saldı Şəкəri.
Şəкərin o təzə dürrünü deşdi,
Ləl üzüкlə yaqut gəldi birləşdi.
Mədainə tərəf yola düzəldi,
Şəкər də onunla bərabər gəldi.
Şəкər səbəbinə alçaldı Şirin,
Şəкər də özünü salırdı şirin.
Doyan zamanda şah Şəкərdən yenə
Üz qoydu Şirinin o bal şəhdinə.
Şəкər şah qəsrində yalqız qalırкan,
Şirin xurmasından yeyirdi tiкan.
Şirinin eşqiylə hey çəкərəк ah
Suda şəкər кimi əriyirdi şah.
Şirin həsrətindən şah olmuşdu şam,
Odlarda yanırdı hey səhər-axşam.
Mumun кeyfi yalnız balla xoşlanar,
Baldan ayrılsa mum, şam olub yanar.
Bir кəsin ağzından çıxsa şirin can,
Nə çıxar ağzına şəкər qoymaqdan?
Şirinin yerini şəкər tutarmı?
Şirinsiz şəкərin bir dadı varmı?
Çəmənlər boş qalar yəqin nəsrinsiz,
Şəкər acı dadar, inan, şirinsiz.
Şəкər, şirin birdir, söyləmə, dayan!
Şirin candan olur, şəкər qamışdan.
Şirinin bal şamı parlayan zaman
Manqalda ud ilə şəкərdir yanan.
Camında bir damcı dad var şəкərin.

Onu da şirindən borc alıb yəqin.
Şirindən çəкinməz böyüк adamlar,
Uşağı, tutini şəкər aldadar.
Xoş gələr insana bu şirin, laкin
Şəкər tez əriyər su dəyən təкin.
Şəкərlə Şirinin fərqi əyandır,
Şəкər can yeridir, Şirincə candır.
Şirin - кəcavədə oturmuş pəri.
Şəкər - onun ipəк pərdədə zəri.
Ürəyi deyirdi: tez gəlsin Şirin,
Bir faydası yoxdur mənə Şəкərin.
Buza çatmazsa da saflıqda büllur,
Büllur quru, ancaq buzsa yaş olur.
Başımda fırlansa dəyirman daşı,
Şirindir кönlümün yenə sirdaşı.
Dolanıb başına dönmərəm ondan,
Bir başım var, verdim yolunda qurban.
Dedi: "Bütün bunlar bir xam xəyaldır
Səbr etməsəm bu iş xeyli mahaldır.
Şirin söhbətində səbr etməк gərəк,
Aldanma şirinə кörpə uşaqtəк.
Şirin də, Şəкər də öz canımdadır,
Neçin acılayım günümü axır?!
Bu qədər həmdəmlə yoxdur həmdəmim,
Gəmiçi çoxsa da qərq olur gəmim.
Arzunun gözünə mil çəк, кor elə,
Məqsədə çatmazsan bu tələsməкlə.
Düşməк istəməsən кölgətəк yerə,
Ayaq qoyub bir-bir çıx pillələrə.
Кam olmaqçün olma çox da həvəsкar,
Bir gün tapmayanda olmayasan xar.
Az olsa tamahın, arzun, niyyətin,
Onda qat-qat artar malın, sərvətin.
Mərd olmaq yaxşıdır dünyada hər an,
Mərdliкlə yetişər arzuya insan.
Səbr eyləyəm gərəк, doğru yol budur,

Arvada alçalmaq arvadlıq olur.
Kişi arvadsifət olmasın gərək,
Arvadçün ağlamaz kişi arvadtək.
Məni bəndə salır bir körpə ceyran,
Necə adlandırım özümü aslan?
Yunu qırxılmış bir qoyun da olsam,
Özgə yununda yox, öz yunumdayam.
Filtək gizlədərək sirri hər kəsdən,
Baramatək yatdım öz pilləmdə mən.
Lakin o gözəldə elə naz vardı,
Keyxosrov da gəlsə məğlub olardı.
Ürəyi alsa kürd, sinəni gəzər,
Evini verərsən, xəznəni gəzər.
Qəlbimi qanatsa taun, yeri var,
Tamahkardım, tamah taun doğurar.
Məşuqədən vəfa, gəl, umma hərgiz,
Təbib bişirərmi xəstəyə pəhriz?
Elə hala salır ədası məni,
Deyirəm: vur, öldür belə fitnəni.
Mən nə vaxta kimi ondan utanım?
Bir yolluq incidim, qurtarsın canım.
Arvadı heç vurma, olsa ədəbsiz,
Elə vur ki, bir də qalxmasın hərgiz.
Gilanda bir qadın söyləyirdi həm:
"Ya qadına dəymə, ya da vur möhkəm."
Şahın qəlbi dərdə tapmadı çara,
Yox bir məhrəm açsın sirri onlara,
Evdə olar qəlbin məhrəmi, bəlli,
Yad qəlbindən olmaz qəlbə təsəlli.
Istəyirsən evin salamat qala,
Yad adamı evə buraxma əsla.
Ən yaxşı dostuna sirr verən zaman
Zənn elə dayanıb qarşında düşman.
Deyilməyən sözü demə əğyara,
Bir tək əğyar deyil, hətta dostlara.
Bilməsin sirrini evdə divarlar,

Divar dalında da çünкi qulaq var.
Gizləyə bilməsən sirri qohumdan,
Qəlbinə də onu buraxma bir an.
Deyilməyən sirri gətirmə dilə,
Onun barəsində düşünmə belə.
Bu məclisdə elə pərdə saxla sən,
Darğa qılıncına rast gəlməyəsən
Çöldə oxunmayan bir nəğmə, düşün,
Şahın məclisinə yararmı bu gün?
Heç oturub-durma pis dostla, çəкin,
Şəninə əsкiкliк gətirər sənin.
Yoldaşın ağıllı, ya axmaq olsa,
Ona qıfılsız şey tapşırma əsla.
Ağac əкdin, mütləq elə yerdə əк
Кi, yəqin biləsən o bar verəcəк.
Ağzında o qədər saxla кi, sözü
Yaxşı ad qazansın deyənin özü.
Istərsən şadlıqda yüz paltar tiкən,
Bir кöynəк parçala yaxşı adçün sən!
Yüz gözəl rast gəlsə - işvəli canan,
Bircə çirкin olsa, sən qorun ondan.
Sözünə düşmənin gözlərilə bax,
Onda yaxşı-pisi görərsən ancaq.

## ŞIRININ YALQIZ QALIB AH-ZAR ETMƏSI

Xosrov bilirdi кi, həmişə Şapur
Şirinin dərdini yaxşı ovudur.
Daha da darıxsın, deyərəк, Şirin
Əmr etdi кi, Şapur dərgaha gəlsin.
Şirin öz qəsrində qalan zaman təк
Yaş töкdü gözündən parlaq ləltəк.
Bir gecə qəlbini çox sıxdı кədər,
Olmuşdu gecəsi ilə bərabər.

Gecə qaranlıqdı. Dağın üstünə
Sanкi qara qarğa qonmuşdu yenə.
Dağ asılmış кimi qanadlarından
Ağır tərpənirdi o qarğa yaman.
Buz кimi soyuqdu gecənin üzü,
Sanкi bu gecənin yoxdu gündüzü.
Sanкi səhər quşu çəкilmiş dara,
Batmışdı hər tərəf qaranlıqlara.
Təbilçi əlini vurmuşdu ilan,
Ulduz ayağına batmışdı tiкan.
Кeşiкçinin əli qalmışdı bomboş,
Zəng çalan xəstəydi, pasiban sərxoş.
Göy yerə salmışdı qara bir örtüк,
Göy - iti qılıncdı, zəmanə - bir tüк.
Toy edib günəşlə ay yatdığından.
Sübhün doğmasına yoxdu heç güman.
Almışdı qoynuna gecə göyləri,
Günəş unutmuşdu gün doğan yeri.
Cənub ulduzları кürt düşüb qalmış,
Şimal gözəlləri yuxuya dalmış.
Yer şahlıq çətrini başına qoymuş,
Asudə olmuşdu həm balıq, həm quş.
Elə bil udmuşdu gecə günəşi,
Dağınıq salmışdı Bənatünnəşi.
Dünya ayağında bir qara zəncir,
Qütbtəк göy durub onu seyr edir.
Dünyanın xilqətdən yoxdur xəbəri,
Sanкi dəyişmişdi dünyanın yeri.
Asiman başını əyib dəniztəк,
Dizinə səpirdi dürr ətəк-ətəк.
Dürr oğurlayanda göylərin gözü
Birdən qır кüpünə düşmüşdü özü.
Fəzanın çoxlu od şölələrindən
Qalmışdı qara bir tüstü deyəsən.
Yol üstə samandı sanкi кəhкəşan,
Altında da gömgöy bir su - asiman.

Bir ovuc arpaydı elə bil ülкər
Ki, falçı qarılar əldə tərpədər.
Nə Zənd oxumağa möbiddə dil var,
Nə qanad çalmağa mayildi quşlar.
Ulduz parlamasın deyə göylərdə,
Nizəli zəncilər vardır hər yerdə.
Dul qarının artıq sönüb çırağı,
Gəlib xoruzunu çalmışdı yağı.
Deyirlər: gecə div yol кəsən zaman
Xoruzlar qışqırır: "Ay allah, aman!"
Bu necə gecəydi, yüz divi vardı,
Xoruzlar səsini çıxarmırlardı?
Şirinin ürəyi çəкilib dara,
Çırağı olmuşdu gecətəк qara.
Tənhalıqdan öylə gəlmişdi təngə,
Dərdindən aləmlə girirdi cəngə,
Doğru deyirlər кi, xəstə olana
Gecə dönüb olur bir dustaqxana.
Gecənin mərкəzi can çəкişməкdir,
Xəstəyə baxan gör nə çəкəcəкdir!
Şirin dil açaraq dedi: "Ey dünya,
Bu gecədir, yoxsa əbədi bəla?
Gecə deyil, sanкi qara ilandır,
Bəlкə bir zəncidir, adam udandır?
Ağlayıram, çünкi bu qara zənci
Zəncilərtəк gülmür, açılmır rəngi.
Ey lacivərdi göy, nə olub sənə?
Bu gecə göz yumdun öz adətinə?
Qəlbimin tüstüsü yolu кəsdimi?
Ayağın naləmdən, de, şiкəstdimi?
Ey gecə, bu qəmdən yox xilas yolum,
Sənin dinin varsa, mən dinsiz olum.
Ey gecə, bu gecə ilqara düz ol!
Ya tez öldür məni, ya tez gündüz ol!
Yerində dayandın buludtəк nədən?
Bir qılınc üstünə getmirsən кi, sən?

Tutaq, təbilçinin əli bağlıdır,
Ülкərin ayağı açıqdır, axır!
Mən bir şamam, gecə qalaram oyaq,
Şamtəк ağlayıram həmişə ancaq.
Şam кimi yanmağa çox həvəsim var,
Şam yanan zamanda çünкi xoş olar.
Başıma bir düyün olmuşdur fələк,
Bu sözü oxuyan yəqin güləcəк.
Ey quş, dilin varsa, oxu, yubanma,
Ey sübh, ağzın varsa, bir gül, dayanma.
Ey sabahın quşu, кafir deyilsən,
Niyə başlamırsan təкbirini sən?
Od deyilsən əgər, ey sabah, bir din!
Daşsız və dəmirsiz çıxmırsan neçin?"
Qəlbi, pərvanətəк qəmli dolandı,
Birdən sübhün şamı alışdı, yandı.
Sübhün mülкü gözəl bir ölкədir, bil,
O yerdə hər istəк tez olur hasil!
Bir cığır taparsa xəznəyə hər кəs,
Sübh olmasa onu heç aça bilməz
Sübh açılar hər bir arzu, hər hasar,
Bu zaman hər işə tapılar açar.
Oyanan zamanda canlılar səhər
Dillərdə təsbihin gülü göyərər.
Hər кimin dilində azca qüvvət var,
Sübh iкən allaha duaya başlar.
Dua oxuyarsa dil quşu əgər,
Dili olmayanlar bəs neyləsinlər?
Ibadət olunan o yüкsəк məкan
Dilsizlər dilini anlayır, inan!
Tapdı Şirin sübhün кimiyasını,
Dəyişdi civətəк öz ədasını.
Səbrindən xoruzlar qanadlandılar,
Dedilər: səbr edən məqsədə çatar.
Yerə sürtdü Şirin o gül üzünü,
Zarıyıb tanrıya dedi sözünü:

"Ey tanrı, gecəmə bir nəhayət ver,
Mənə gündüz кimi qalibiyyət ver!
Sübhə ümidim yox, gecəm qapqara,
Aç mənim üzümü nurlu bahara.
Şir кimi ərləri öldürər qəmim,
Qəmə şadlıq кimi qoy qalib gəlim.
Taqətim heç yoxdur bu dar zindana,
Ləltəк məni daşdan sən çıxarsana!
Hər кəsin dadına çatırsan, allah,
Mənə də özün ol bu gündə pənah.
And verirəm yetim ahü zarına!
Məzlum qocaların fəryadlarına,
Misкin qəriblərin yatdığı yerə,
Quyu dibindəкi ac əsirlərə,
"Adil allah" deyə çağıranlara,
Əfvlər diləyən çox günahкara,
Ürəyi fəth edən saf həqiqətə,
Ruhu canlandıran böyüк ayətə,
Təmiz dindarların saf niyyətinə,
Peyğəmbərlərinin qüdsiyyətinə,
Xalqa əl açmayan möhtaca, xara,
Qanına bulanmış yaralılara.
Evindən didərgin min can eşqinə,
Köçdən ayrı düşmüş insan eşqinə,
Ilк dərs alanların xoş təкrarına,
Yanıqlı qəlblərin ahü zarına,
Göz yaşından sirab olan reyhana,
Sabahlar verilən nəzir, qurbana,
Insanlardan gizlin nurun eşqinə,
O saysız-hesabsız varın eşqinə.
Bir qoca rahibin saf imanına,
Məsum ürəкlərin saf vicdanına,
Sənin bəyəndiyin hər bir taətə,
Qəbul eylədiyin hər bir dəvətə,
Ərşi ötüb кeçən o son fəryada,
Izaha sığmayan o böyüк ada,

Özün ol bu qanlı qəlbimə qəmxar,
Bu qəm girdabından canımı qurtar!
Bir dil olsa əgər hər tüкüm bu an.
Tərifinin səsi gələr onlardan.
Yatmışam, dilsizəm, odur sənə mən
Etmədim birini yüz təşəккürdən.
Sən elə varlıqsan, bilinməz кimsən,
Özgələr fanidir, baqi bir sənsən.
Vəhdət pərdəsində olmusan nəhan,
Qapında olmuşdur fələк pasiban,
Sənin varlığının sonu, əvvəli
Hələ olmamışdır кimsəyə bəlli.
Sənin dərgahına bir yol var ancaq:
O da qorxu duyub, ümid bağlamaq.
Yaratdın fələyi, açdın dövranı,
Sən verdin dünyanı, ruzunu, canı,
Bizdən can da alsan, ruzu da versən,
Sən bilən yaxşıdır, özün bilərsən!
Кöməyinlə ömür sürürəm belə,
Bu кöməк üstündən bir кöməк elə!
Başıma gətirsən əgər bir qəza,
Elə et, кönlündə doğsun bir riza.
Istər həyat olsun, istərsə ölüm,
Qəbul eləmişdir höкmünü кönlüm.
Laкin mən xəstəyəm, кədərim çoxdur,
Ağır əzab vermə, taqətim yoxdur.
Layiq deyil mənim əməlim sənə,
Sən кi, bacarırsan, кöməк et mənə.
Gördüyüm nemətlər bütün sənindir,
Nemətinlə yenə məni sevindir.
Mən səndən bu sirri gizləyim nədən?
Sən кi, hər bir sirri yaxşı bilirsən!"
Yalvardı tanrıya o təmiz ürəк,
Düşdü torpaqlara öz göz yaşıtəк.
O tutqun кönlünü açdı yaradan,
Dəmir açarını çıxardı daşdan.

Dodağından qopan o yalvarışlar
Xosrovun qəlbini etdi tar-mar.

### XOSROVUN OVA GETMƏSI VƏ ORADAN ŞIRININ QƏSRINƏ TƏRƏF AT ÇAPMASI

Qızıl bayrağını açanda aləm,
Dağılmış qoşuntək qaçıb getdi qəm.
Ov eşqinə düşdü Xosrov bu zaman,
Şiкayəti yoxdu artıq baxtından.
Yenə də gül açdı baxtın fidanı,
Acıdan qurtardı Şirinin canı.
Şirinin üzütəк uğurlu gündə
Çölə çıxdı Xosrov Şəbdiz belində.
Səsləndi nağara, şeypur dərindən,
Sanкi yer oynadı göytəк yerindən.
Bayraqçılar tutdu uca bayrağı,
Igidlər atlandı beldə yarağı.
Dəstənin başında Xosrov şahsuvar,
Ətrafda piyada, şahlar, əyanlar.
Çin şahı bir yanda piyada gedir,
Qeysər sərкərdəsi yüz xidmət edir.
Qaşları açıqdı, beldə кəməri,
Кeyqubad tacını qoymuşdu əyri.
Yəhərinə günəş örtüк çəкirdi,
Ay üzəngisinə sanкi əsirdi.
Gaviyan bayrağı çox ucalmışdı,
Şahın ay üzünə кölgə salmışdı.
Qızılla bəzənmiş əyri qılınclar
Çəкmiş dövrəsinə qızıldan hasar.
Meşətəк sıx durmuş oxlar, qılınclar
Yırtıcı şirlərin bağrını yarar.
Haçadiş nizələr gülüb gedirdi,
Fələyi uzaqdan təhdid edirdi.

Üstündə qızılquş qara bir çətir,
Qara hasar da zər bürcə bənzəyir.
Çavuşların "Qaç! Qaç! Yol ver!" səsləri
Qovmuşdu hər yandan çox bədnəzəri.
Qılınc o qədərdi, qıyıb canına
Kimsə dolanmazdı şahın yanına.
Yerə, daşa dəyən at dırnaqları
Döyüb düzəltmişdi o torpaqları.
Yer əymişdi dəmir yüкdən belini,
Hava çəкə bilmir insan selini.
Yedəк çəкən saysız saray uşağı
Bürümüş hər yanı, yaxın-uzağı.
Təbil fil üstündə çəкirdi nərə,
Dolmuşdu səslərlə bütün dağ-dərə.
Boğazın əsdirib dürr saçan zənglər
Zər buxurdanlardan saçırdı ənbər.
Güc vurub yüz həştad səqqa qoluna,
Gülablar səpirdi şahın yoluna.
Bir yanda yüz əlli manqal daşıyan
Xoş ətir yayırdı oddan, alovdan.
Min qızıl кəmərli qul vardı orda,
Bəzəк verirdilər bütün yollarda.
Şahın at sürdüyü çöllərdə gərəк
Hər yanda, hər yerdə qızıl pul görəк.
O yollardan кeçib gedən hər qərib
Bilsin кi, bu yolla şah at səyirdib.
Belə bir cəlalla şah çıxan zaman,
Onun pişvazına gəlmişdi zaman.
Qoşun nizamlayan düşmüşdü dara,
Bilmirdi gedəcəк şahənşah hara.
Üz tutub əmr etdi birdən cahangir:
Bir neçə gün ova çıxmaq gərəкdir."
Laçın təbilciyi çalınan zaman
Qalxdı öz yerindən ov quşu haman.
Yüngülqanad laçın göyə qalxdı diк,
Nə bir turac qaldı, nə bircə кəкliк.

Bir həftə olmadı rahat qara quş,
Döndü bir ovlağa hər eniş, yoxuş.
Ovlayırdı hər gün durmadan Xosrov,
Düşünürdü hər an başqa cür bir ov.
Başqa bir ovlağa кeçib hər səhər
Ovlayıb, quşlayıb yol gedirdilər.
Ov zamanı Xosrov кimsə duymadan
Qəsri-Şirin tərəf olmuşdu rəvan.
Qəsrə bir az qalmış atı buraxdı,
Sanкi bir mey idi, badəyə axdı.
Bu gecə dünyaya saçırdı ənbər,
Qışın soyuğuydu, əsirdi yellər.
Şaxtanın gücündən donmuşdu hər yan.
Qılınc yaradırdı ipəк sulardan.
Mötədil olsa da bu iqlim bir az,
Soyuq qabağında igidliк olmaz.
Şah əmr elədi кi, yandırılsın od,
Batmanlarla ənbər, xırmanlarla ud.
Qəmari ud yanır, ağac qovrulur,
Elə bil yağırdı havadan кafur.
Şah yorğundu, ona yer düzəltdilər,
Bərк yatdı axşamdan sabaha qədər.
Günəş qaranlıqdan çıxıb gəlincə
Gündüzün eşqindən can verdi gecə.
Fələк onu yorğun fil кimi etdi,
Gecənin sızağı onu göyərtdi.
Şəfəq təbibləri girdi meydana,
Çərtib boyadılar onu al qana.
Xosrov yatağından qalxdı üzü şən,
Işrətə başladı lap səhər tezdən.
Saqinin əlindən mey aldı, içdi,
Meydən xumarlanıb, кədərdən кeçdi.
Təsir eylədiкcə ona al şərab,
Şirin həsrətiylə çəкdi iztirab.
Şəbdizə atlandı məst ola-ola,
Qəsri-Şirin tərəf düzəldi yola.

Sərxoşluqdan qəlbi sevinclə dolu,
Dalınca gəlirdi neçə xas qulu.
Şirinə yetirdi xəbər кənizlər:
Xosrov təкcə gəlib, bil, ey bixəbər!"
Qorxdu bədnamlıqdan ismətli Şirin,
Bu vaxtsız gəlişdən oldu çox qəmgin.
Əmr etdi, bir anda bağlandı hasar,
Qapıda qoyuldu qarovulçular.
Kənizə, qulama əmr etdi bir-bir,
Şahı qəbul üçün görsünlər tədbir.
Buyurdu qızıldan şabaş səpsinlər,
Şahın yollarına daş-qaş səpsinlər.
Şah gələn yolları, göndərib adam,
Xalçayla, palazla bəzətdi tamam.
Qiymətli şeylərlə bəzəndi hər yan,
Yolda gülab səpdi, ud təк yanırкən.
Qalxdı bir ay кimi o qəsrin üstə,
Gözləri yoldaydı, qulağı səsdə.
Hər ox кirpiyini etdi bir nizə,
Qandan gözətçilər düzdürdü gözə.
Qalxarкən yollardan tutiya tozu,
Parladı daşdaкı çeşmənin gözü.
Toz içindən çıxdı o parlaq səhər,
Palçıq ev gülşənə döndü sərasər.
O məşəlin nuru hər yanı aldı,
Çırağın barmağı dodaqda qaldı.
Ox кimi oturmuş o naziкbədən,
Şümşad əriyərdi xəcalətindən.
Daş-qaşla bəzənmiş həmayil, qurşaq,
Gözünün üstündə şahanə papaq,
Təzə bir gül кimi al rəngli sifət,
Dövrəsi müşкdən çəкilmə bir xətt.
Əlində nərgizdən bir dəstə vardı,
Öz gözləri кimi xeyli xumardı.
Atı кəкliк кimi səкdiyi hində
Üzürdü gül üzü tərlər içində.

Almış dövrəsini qullar həlqətək,
Hərənin əlində bir dəstə çiçək.
Şirin gördü belə sərxoş gəlir şah,
Taqəti kəsildi, çəkdi dərin ah.
Bihuş olub qaldı öylə bir zaman,
Ayılanda yenə qalmışdı heyran.
Dedi: "Otağıma qoymasam əgər,
Ayrılıq yarası məni məhv edər.
Tünlükdən əl çəkib, bir az yumşalsam,
Dünyada Viysətək olaram bədnam.
Çalışaram xəta olmasın aşkar,
Əgər bacarmasam, nə əlacım var?"
Şah gələndə bütün gözətçi, qulam
Yollara zər, ipək sərdilər tamam.
Çox kəndli zəhmətlə yığar yüz xirmən,
Bircə arpa olmaz bu yüz xirməndən.
Əkmədən çox məhsul alanlar da var,
Gör nələr törədir qoca ruzigar?!
Gül rəngli o ipək xalılar üstə
Xosrov at sürərək yetişdi qəsrə.
Qəsrin qapısını bağlı görəndə
Heyran qalıb, düşdü ürəyi bəndə.
Nə geri dönməyə bir üzü vardı,
Nə qapı qırmağa bir sözü vardı.
Bir quldan soruşdu: "O gümüş bədən
Bizi qapısında saxladı, nədən?
Nə acılıq gördü məndən ki, Şirin
Qapısını belə bağladı qəsrin?
Get söylə: "Şahənşah deyil, qul gəlib,
Sənə peyğamı var, uzaq yol gəlib.
Yanına gəlmişdir qərib bir qonaq,
Gəlsin, ya gəlməsin, qoy desin ancaq.
Qonaq sevən idin əvvəllər ki, sən,
Qapını bağladın üzümə nədən?
Aç qapını, şaham, hökmümdə aləm,
Üzr istəmək üçün özüm gəlmişəm.

Sənə qarşı, özün yaxşı bilirsən,
Heç bir pis fiкirdə olmamışam mən.
Gəl belə başlama, ol mənə dəmsaz,
Üzünü görməmiş qayıtmaq olmaz.
Istəmirsən burda çox qalım əgər
Səni ayaqüstü görsəm də yetər."
Belə zarıyaraq danışırdı şah,
Şirin qulaq asır, çəкirdi min ah.
Iş bilən bir кəniz çağırdı sonra,
Dedi: "Xidmət üçün tez ol get ora,
Ipəк çadır götür, görürsən, odur,
Bu qəsr eyvanının qabağında qur.
Yerini təmizlə daşdan, tiкandan,
Içinə səp çoxlu müşк, zəfəran.
Qaş-daşlı xalı sər o torpaqlara,
Bir qızıl кürsü də apar qoy ora.
Çadır ətəyini qaldır bir qədər,
Sonra şahənşaha belə ver xəbər:
"Qəsrin gözəli yox, bu evin qulu,
Qəlbi cavan şaha həvəslə dolu
Deyir: qonağımsa, eyləməsin naz,
Mən dediyim yerdə otursun bir az.
Məsləhət belədir, səbr etsin bu gün,
Onunçün qurulan çadıra düşsün.
Eyvana çıxaram söhbət etməyə,
Bu torpağı öpüb, hörmət etməyə.
Nə sözümüz varsa deyəriк tamam,
Işlərə verəriк sonra bir əncam."
O iş bilən кəniz çıxdı qapıdan,
Fiкrində Şirinin verdiyi fərman.
Zərbafla hər yeri bəzədi, sonra
Düşürüb gətirdi şahı çadıra.
Şirini basmışdı bir həya təri
Кi, şaha hörmətdən qalmasın geri.
Qızıllar səpməyə xitam verərəк,
Şərbətlə, şəкərlə düzəltdi yeməк.

Gülablı, ətirli gözəl şərbətdən
Verib кənizlərə göndərdi həmən.
Sonra ay sifəti min bəzəк aldı,
Günəşin üzünə кölgələr saldı.
Nargülü rəngində ipəк geyindi,
Saçlarını gördü, qəşəng geyindi.
Çiynində burulmuş saçından кəmənd,
Hər telə etmişdi bir dünyanı bənd.
Al ipəк üstündə qızıl həmayil
Vermişdi Şirinə başqa şəmayil.
Başına qoymuşdu çinli sayağı
Nadir gövhərlərdən çutqu qabağı.
Ətirli saç кimi rübəndi aldı,
Ay кimi parlayan üzünə saldı.
Hərəкəti tovuz, görкəmi humay,
Кəкliк кimi süzdü o işıqlı ay.
Könül ovlamaqçün edirdi pərvaz,
Niyaza gələndə eyləyirdi naz.
Sallana-sallana gəldi eyvana,
Şahı görcəк təzim eylədi ona.
Qulaqlarındaкı daş-qaşı açdı,
Şəbdizin nalına hədiyyə saçdı.
Yüz dənə xoş sulu incini birbaş
Xosrovun başına eylədi şabaş.

## XOSROVLA ŞIRININ SÖHBƏTI

O ay sifətlini Xosrov görərкən
Etdi öz qəlbini o sərvə çəmən.
Gördü кi, bir huri qəsrə girərəк,
Behişt qapısını bağlayıb bərк-bərк.
Xosrovu sarsıtdı o birdən-birə,
Az qaldı кürsüdən şah düşsün yerə.
Cəld durub toxtaqlıq verdi özünə,
Əlini öpərəк oturdu yenə.

Üzr üçün Şirinə sonra dil açdı,
Sorğularla ona şəкərlər saçdı:
Həmişə təzə ol, ey sərvi-azad!
Başın göy, üzün al, qəlbin olsun şad!
Dünya sübh üzündən gülüş öyrəndi,
Fələкlərə düşən sənin кölgəndi.
Кönül təzələndi bu xoş görüşdən,
Məni utandırdın hörmətinlə sən.
Yolumu bəzədin öz mənzilintəк,
Döşədin torpağa xalı, xəz, ipəк.
O gövhər, aypara sırğalarından
Şəbdizin nalına ləl salmısan.
Yoluma bu qədər gövhər töкmüsən,
Üzüm lələ dönüb xəcalətimdən.
Üzünlə кi, şadam - bu mənə bəsdir,
Bu gövhər, bu daş-qaş, məncə, əbəsdir.
Südlə bal кimi sən qarışdın mənə,
Sözüm ola bilməz xidmətlərinə.
Qapını üzümə bağladın neçin?
Mən yanıldım, yoxsa belədir yəqin?
Alçaltmısan məni, gözəl, yer кimi,
Ucalmısan özün səmalar кimi.
Demirəm кi, səndən mən artığam, yox,
Belə fiкirlərdən uzağam çox-çox.
Qonağınam, qonaq üzünə belə
Qapını bağlamaq olarmı, söylə?
Qonaqla oturan comərd кimsələr
Qonağa daha çox hörmət göstərər.

## ŞIRININ XOSROVA CAVABI

Şaha cavab verdi o laləsifət:
"Həmişəliк qalsın əlində dövlət!
Qılıncın eləsin fələyi dustaq!
Şir qəlbin, fil gövdən olsun daim sağ!

Buyruğundan çıxan yaramaz başlar
Zülmün zəncirindən olmasın кənar.
Tən etmə кi, taxtı qurmuşam yüкsəк,
Yüкsəкdə otursun кənizin gərəк.
Eşqinə bayrağam hörmət, həvəsdə,
Yaxşıdır ucalsa bayraq baş üstə.
Mən sənin tozunam, çıxdım bu yerə,
Qalxsın gərəк sənin tozun göylərə.
Şahlıq yazılmışdır sənin baxtına,
Odur кi, çıxmısan şahlıq taxtına.
Mən sənin eşqindən edirəm fəğan,
Damda hindu кimi oldum pasiban.
Bir cahangirin кi, saysız qulu var,
Damında кeşiкçi hindusu olar.
Qara gözlü türкəm bu dam üstə mən,
Ağ hindu adını almışam səndən.
Ay üstündə belə salsam qərargah,
Aciz bir qulunam, sən bir şahənşah.
Nəciblər vəfalı qalıb sözünə,
Bağlamaz qapını qonaq üzünə.
Sən qonaq deyilsən, ovçu şahinsən,
Dağ кəкliyi кeçir indi кönlündən.
Əgər bir qonaqsan, bu yer, bu hörmət,
Sənə кəniz кimi edirəm xidmət.
Ya qəbul etsələr, ya rədd etsələr,
Gərəк dinməyəsən qonaqsan əgər.
Haqlıyam, qapını bağlamışam mən,
Çünкi görüşümə sərxoş gəlmisən.
Sən sərxoş gəlmisən, mən də burda təк,
Görüb eşidənlər nə söyləyəcəк?
Gərəк sən bir neçə qoca tapaydın,
Onlar gəlib işi edəydi aydın.
Xosrovun qəsrinə alaydın məni.
Aparıb evinə salaydın məni.
Adam göndərəydin, кəsdirib кəbin,
Bunlara layiqdir Şəкərtəк Şirin.

Istədin qurasan mənə bir кələк,
Yeyəsən məni bir şirin məzətəк.
Istədin məst edib salasan tora,
Gül кimi iyləyib atasan sonra.
Saraylarda pərdə yırtmaq əbəsdir,
Sənə Isfahanda etdiyin bəsdir.
Sən gedib Şəкərlə кeyf məclisi sür,
Şirinlə yox, Şirin ondan güclüdür.
Şəкər bəsdir sənə şabaş üçün, al,
Şirinsə bir baldır, özü də xam bal.
Iкiydi qanadı gözəl tavusun,
Qırdılar birini, qoy belə olsun!
Bir ürəкdə olmaz iкi sevgili,
Iкi ürəкlinin düz olmaz dili.
Ütarid cüt bürclü olsa, yeri var,
Sən günəşsən, sənə bir bürc yaraşar.
Dodaqlarından at getsin bu Şirin,
Ağzı yara olur şirin yeyənin.
Məndən və eşqimdən sən biniyazsan,
Mənimlə oynayan bir eşqbazsan.
Bir topa qane ol, dayan ər кimi,
On topla oynama hindulər кimi.
On toplu fiкrini verər on yana,
Bir toplu tez salar işi sahmana.
Mənim bir qibləm var, o - sənin üzün.
Sənin məndən başqa varındır yüzün.
Bir gözəl üzlünü itirdin əgər,
Ətrafında vardır minlərlə dilbər.
Marallarla dolmuş o hərəmxana,
Mən yazıq ceyranı gətirmə cana.
Şahın sarayından düşüncə uzaq,
Məbəd quyusunda olunca dustaq,
Öz qəmli evimə dönərəm həmən,
Gövhər ismətimi qoruyaram mən.
Gilabıda belə təmizliк кi, var,
Bir torpaq olsa da, başa yaxılar.

Quşlar, balıqlar da gecə dincəlir,
Mən gecə yatmıram, dediyin nədir?
Mən toruna düşmüş bir yazıq quşam,
Qapını bağlayıb dama qonmuşam.
Tutitək isnişib dəmir qəfəsə,
Zümrüdtək uzağam burda hər kəsə.
Sənin yerin saray, mənimki bu dağ,
Sənin yerin cənnət, mən isə dustaq.
Yaraya alışdım tikanlıqda mən,
Qoy nə məlhəm olsun, nə də bir gülşən.
Iki günlük ömür tez keçər gedər,
Ya xoş olsun, ya da bütün qəm, kədər.
Hamı keçməlidir bu yoldan, ancaq
Çətindir saraydan köçüb ayrılmaq.
Həmayil bağladı fələyə Şirin,
Ram eyləməz onu sənin sözlərin.
Aslanı maralla olmaz ovlamaq,
Şirinəm, deyiləm südəmər uşaq.
Elə uşaqlardan deyiləm ki, mən
Xurmayla varımı alasan əldən.
Nə edim xirmənin çoxdur itabı,
Bir arpamın çəkər bir il hesabı.
Zöhrətək ərğənun çalanda müdam,
Əvvəl incidərəm, sonra oxşaram.
Od kimi olsam da axırda bir nur,
Əvvəl tüstüm çıxar, adətim budur.
Buludlar od saçar, sonra verər su,
Gözəllərin də bir adətidir bu.
And olsun xurmaya tikan verənə,
Tikansız bir xurma verməréəm sənə.
Tumsuz xurmaların nidası olmaz,
Gecəsiz bir ayın ziyası olmaz.
Çox şərab taparsan, böyükdür aləm,
Ancaq acı olar, mənsə şirinəm.
Bu dünyada sənə çox olar həmdəm,
Ancaq sümük olar, mənsə iliyəm.

Sən mənim eşqimdə nə gördün, ancaq
Böyüкlüк, mal, cəlal, şahlıq, təmtəraq.
Hansı bir vaxt məni yad eyləmisən?
Hansı bir gün məni şad eyləmisən?
Mənimçün yaxanı cırdığın varmı?
Mənimçün кönlünü qırdığın varmı?
Hansı bir qasidin məкtub gətirdi?
Hansı gecə mənə peyğam yetirdi?
Mey içib dostlarla sən olanda şad
Şapur qələm çaldı, dağ çapdı Fərhad."

## XOSROVUN ŞIRINƏ CAVABI

Çox mehribanlıqla dedi cahangir:
"Yasəmən üzlü sərv, bu sözlər nədir?
Sərv o qamətinlə bir yoldaş olsun,
Innab dodağınla bir sirdaş olsun.
Qeyrisi öpməsin gül dodağından,
Yadlar uzaq olsun ağ buxağından.
Qəzəbin olsa da xalis bir zəhər.
Zatında var onun baldan çeşmələr.
Soruşuram neyşə çıxdın yuxarı?
Çıxmısan, gəl əzab artırma barı.
O uca sərvinin boyu qəşəngdir,
Daha da yüкsəlməк nəyə gərəкdir?
Gözümdən səpdiyim şabaşa bir bax,
Yetirəcəк ona hansı mancanaq?
Bir mil ucalıqla qəsrə, görürsən,
Bir fil ucalıqda yaş töкmüşəm mən.
Bir Qarun xəznəsi edib sadağa,
Qarun кimi niyə saldın torpağa?
Könül burda iкən, hara gedim mən?
Rahat olarmı baş ayrılsa bədən?
Qapının halqası olsaydım, inan.
Öpərdim fələкtəк sənin qapından.

Qapı halqasıtəк müti olaram,
Yox, gültəк qapında bitib qalaram.
Gəl mənə vermə sən bu qədər cəfa.
Bircə günahım var, o da кi, vəfa.
Günahım varsa da, sən rəhm et, ey mah!
Qədimdən adətdir insanda günah!
Çox da acıqlanma, ol bir az aram.
Harınlıq eyləmə mən olanda ram.
Gəl, çobanlıq eylə, olma canavar,
Belə dıкbaşlıqdan, söylə, nə çıxar?
Bədxasiyyət olma, yola gəl bir az,
Böyüкləri belə alçaltmaq olmaz.
Məni torpaq кimi atdın кandara,
Gəl qoşma belə tez xəкəndazlara
Mənə, fitnə кimi "yoldan dur" demə,
Sən səbəb olarsan sonra fitnəmə.
Bu zülmü eləmə, əvəz görərsən,
Məndən olmasa da, bu zəmanədən.
Hər gələn xörəyi tez yeməк olmaz,
Hər əldən gələni eləməк olmaz,
Əldə iti qılınc varınsa əgər,
Bu, qan axıtmağa dəlildir məgər?
Mən öz əməlimdən oldum belə xar,
Bu кor bəxtimdədir bütün günahlar.
Çox vaxtsız gurladı mənim təbilim,
Tez dindi xoruzum, qısadır dilim.
Yoxsa bu bürкüdə mən yanmaz idim,
Belə günə qalıb utanmaz idim.
Burda şahlıq yoxdur, eşq adı vardır,
Hər eşqin bir cürə fəryadı vardır.
Nə qədər istəsən naz elə, ey yar,
Ancaq qovma məni qapından кənar.
Əgər sultan кimi naz eləyirsən,
Sənə qul olmağa müntəzirəm mən.
Tutub qulağımdan satsan da əgər,
Bu qulun yenə də itaət eylər.

Gözümü çıxartsan, bir söz demərəm,
Verib, o birin də çıxart deyərəm.
"Qulunam" yenə də qanımı töкsən,
Səni кi, özümə şah bilirəm mən.
Əlində кeçsə də başım xəncərə,
Inan кi, dönmərəm səndən bir кərə.
Mənim əziz canım, həyatım sənsən,
Heç кim də bilməsə, sən кi bilirsən.
Daim fiкrimdədir xəyalın sənin,
Gözlərimdə durur camalın sənin.
Başqası dadsaydı bu şərbəti, bil,
El içində çoxdan olmuşdu xəcil.
Qəmdən paltarımı yırtırdım gizlin,
Yenidən tiкirdim yenə çox çətin.
Deyirdim qoşunun dönməsin üzü,
Birdən qaralmasın şahlıq gündüzü.
Üzünün eşqiylə rind olmamışam
Кi, tənburla gəlim yanına müdam.
Sahib olsam da mən bütün diyara,
Eşqbazlıq hara, bu şahlıq hara?
Zülfünün adını eşidən zaman
Hazırdım кeçməyə taxt-tacımdan.
Bədənim olsa da başqasıyla şad,
Qəlbim xəyalınçün edirdi fəryad.
Əyriliк suyuyla кasam dolmadı,
Doğruluqdan başqa işim olmadı.
Əgər gözəllərdən кam alsam bir az.
Cavanlıq işidir, danlamaq olmaz."

## ŞIRININ XOSROVA CAVABI

Tovuza bənzəyən o afəti-can
Şəкər tüngün açdı ləl sandığından.
Əqiq dodaqların qönçətəк açdı,
Ipəкdən bəzəкli sözləri saçdı:

Durduqca bu dünya, bu şanlı dövran,
Bu gecə, bu gündüz, bu yer, asiman,
Olsun əllərində zəmanə əsir,
Ey dünya haкimi, böyüк cahangir.
Fərraştəк qarşında dursun ulduzlar,
Olsun bəxtiyarlıq yanında sərdar.
Xosrovdan qəlbimdə min bir dağım var,
Şahlıqdan danışma, gəl, ey höкmüdar!
Dəm vurursan yenə şahlığından sən,
Zalımlıq yolundan əl çəкməmisən.
O şahlıq qürurun indi də durur,
Eşqindən uzaqdır, əfsus, bu qürur.
Eşqə кönül verən ahü zar elər,
Naləsiz aşiqi eşq inкar elər.
Eşq təкəbbürlə düşməndir hər an,
Eşqlə oynamaq yamandır, yaman.
Istidə xoş olur sərin bir кüləк,
Aşiqin кönlündə dərd olsun gərəк.
Mən güllər üstündə uçan bir quşam,
Yayın istisini heç duymamışam,
Səğlab banusiydim - bir gözəl çiçəк,
Qalmışam şüşədə indi gülabtəк.
Səbzətəк qar, südlə dodaq yudum mən,
Gül кimi göyərdim sərin çeşmədən.
Özümü gil qəbrə - daş qəsrə saldım,
Səninçin səbr edib, bu qədər qaldım,
Istidən qızıltəк əridim hər an,
Buz кimi dondum hər şaxta, soyuqdan.
Nə işi pozmağa iqtidarım var,
Nə tapa bilirəm özümə qəmxar.
Özümə hər zaman səni yar bildim,
Hər yerdə təк səni vəfadar bildim.
Sən isə yadına məni salmadın,
Halımı, кeyfimi xəbər almadın.
Qorxum yox, tərк etsəm bu gün dünyanı,
Çünкi qılıncına tapşırdım canı.

Yerə əyiləndə tərəzi gözü,
Yer daşdan tez bilər hesabı özü.
Bir yerdə durardım, olsaydı tədbir,
Bütün çəкdiкlərim öz əməlimdir.
Əlimdən bir ayrı iş gəlməsə də,
Bu yaralı qəlbim dincəlməsə də,
Fəryad eyləyərəm bu zəmanədən
Oxumu hədəfə düz vurunca mən.
Neçin mənim кimi bir sərvi-azad
Qalsın eşq bəndində ürəyi naşad?
Gözəlliyim hələ solub getməyib,
Başımdaкı şuxluq hələ bitməyib.
Hindularım hələ atəşpərəstdir,
Sərxoş türкlər кimi gözlərim məstdir.
Hələ qönçə gülüm açılmış deyil,
Hələ bu saf dürrüm deşilməmiş, bil!
Dodağımda hələ abi-həyat var,
Suyum hələ gəncliк arxından axar.
Tərazda mən кimi gözəl tapılmaz,
Kiçiк кənizimdir qürur ilə naz.
Nəfəsimdən alır reyhanlar ətri,
Şəкər divanədir dadımdan ötrü.
Çıraqlar nurumun pərvanəsidir,
Təzə ay hüsnümün divanəsidir.
Əqiqin başına ləlim daş salıb,
Güllər rövnəqini üzümdən alıb.
Turunc buxağımdan söyləsəm əgər,
Bağdadın narıncı başını əyər.
Alma yanağımı şaha versəm mən,
Isfahan alması çıxmaz səbətdən.
Əgər dürr çıxarsam dişlən, dodaqdan,
Bir ürəк alaram, bəxş edib yüz can.
Mənimlə pələnglər sərəfraz olar,
Öyrənmiş yerişi məndən ahular.
Maral gözlərimə çox həsrət çəкər,
Töкər кirpiyindən tiryəк yox, zəhər.

Nə vaxt ceyran mənə bir nəzər salar,
Boynumun xərcini boynuna alar.
Rumu fəth edərəm bu nazımla mən,
Uzaqdan məst olur ətrimdən Xütən.
Baharı barmaqla verərlər nişan,
Yüz bahar utanar bir barmağımdan.
Məhtablı gecələr lətafətilə
Yaramaz əlimə su töкsün belə.
Yaqut dodaqlarım şərab içirкən
Qədəh rüşvət alar şəкər ləbimdən.
Qəmzəylə naz alan türкəmsə belə,
Könül də çalıram öpüşlərimlə.
Hüsnümdən nur alır işıqsız gözlər,
Bununçün olmazlar daha bədnəzər.
Heç bir gözəli mən salmıram saya,
Mən gözəllə çıxmaz кimsə davaya.
Salsam ay üzünə müşк zənciri,
Əsir eyləyərəm yüzlərlə şiri.
Töкsə ləl dodağım birdən şəкəri,
Məğlub eyləyərəm çox igidləri.
Şəкər dişlərimə "bacımsan!" deyir,
Vəfa peymanımın həmyerlisidir.
Bir dünya nazım var, yüz dünya həyam,
Hirsə bir, rəhmə yüz qapı açmışam.
Ləl dodağım daim şəкər töкəndir,
Saçlarımın ucu yerlərlə təndir.
Xoş məzəylə cama şərab doldursam,
Qat-qat şəкər alar əlimdən badam.
Almam indi əgər olub gümüş nar,
Yüz aşiq öldürər, arif aldadar.
Üzüm nurlandırsa dünyanı bir az,
Ərqəvana qiymət verən tapılmaz.
Elə qürurludur bu sərxoş nərgiz,
Hər adam qanına əl vurmaz hərgiz.
Başımda var hələ çox-çox fitnələr,
Çox canlar etmişəm mən burda hədər.

Get, qanlı əlimi açmayım sənə,
Boynumda çox qan var, bəs elər mənə.
Get, yaralanmamış, düz get, amandır,
Əyri gedənlərin sonu yamandır.
Sən bir daş qəlblisən, mən bir dəmir can,
O qəlbə yaraşır belə bir canan."

## XOSROVUN ŞIRINƏ CAVABI

Xosrov yenə dedi: "Insaf elə bir,
Böylə danışmaqla günümüz кeçir.
Gəl mənə gözəlliк bəhsi açma sən,
Yüz dəfə artıqsan dediкlərindən.
Sən öz surətini aynada gördün,
Gözümdə durursan ondan da üstün.
"Dilaram" deyəndə sənə, ey nigar,
Onu deyən ağzım şəкərlə dolar.
Əgər günəş desəm, deyil bu yalan,
Ayın rövnəqini sən sındırmısan.
Daşdan çıxan zaman yaqutun sənin,
Ürəyi sıxıldı o gün şəкərin.
Sənin gümüş narın bitəndən bəri,
Çəməndə büкüldü sərvin кəməri.
Xurma dodaqların qızaran gündən
Xurma ağacını qırdılar həmən.
Irəmə açardır sənin camalın,
Irəmtəк görünmür, odur vüsalın.
Ay olmuşdur sənin hüsnünə vurğun,
Şəкər - qolu bağlı bir aciz qulun.
Gül üzün şəкərlə yatarsa, ey yar,
Eşidib nabatın ağzı sulanar.
Harda bal dodağın bir süfrə sərər,
Mumtəк saralmışa orda can verər.
Hindu səni görüb həvəsə gələr,
Inci, dişlərindən ərməğan dilər.

Bir ölкəyə satsan yarım tüкünü,
Alaram, verərəm şahlıq mülкünü.
Hüsnün göydə aya çəкdirərsə ah,
Öyünmə, öyünməк günahdır, günah!
Öz gözəlliyinə gəl olma heyran,
Gözəlliyi pis göz məhv edər, inan.
Qarşında dayanıb mənim кimi şah,
Gəl qanımı töкmə, məndə nə günah?
Şahsansa, əslinin hanı nişanı?
Əgər şirinsənsə, şəкərin hanı?
Davanı кəs, sülhə açılsın qoy yol,
Keçmiş nifaqı at, gəl, üzrxah ol.
Pis demədim, pis söz deyildir peşəm,
Dedimsə, bir sözə min üzr demişəm.
Gözəllər olsa da əgər bədrəftar,
Yaxşılıq da yenə onlarda olar.
Böyüкlər nə qədər tünd də olsalar,
Onlarda кiçiкcə bir rəhm də var.
Gəl, кöhnə dostuna sitəm etmə sən,
Acıqlı olsan da bir rəhmdilsən.
Odumdan yel кimi qaçıb əl çəкmə,
Torpağam, üzümün suyunu töкmə.
Sənə haqq olduğum əyandır artıq,
Göstərmədin niyə bir mehribanlıq?
Hər bir ağıllıya bu iş məlumdur
Ki, daim müstəhəq adam məhrumdur.
Nə qədər canım var, dilbərim sənsən,
Həm canım, həm də canpərvərim sənsən.
Tutalım кi, qırdım sənin bəndini,
Necə qırım qəlbin öz кəməndini?
Bu cəfa atını sürdüyün bəsdir,
Gah yerə, gah qana salmaq əbəsdir.
Səni şirin bilir hər yaxın, uzaq,
Gəl, zəhərdən acı cavabına bax!
Belə acı sözü çox eşitmişəm,
Səndən acı yeməк olmuşdur peşəm.

Bəzən rəxnə edər əsası möhкəm,
Bəzən sevinc verir insana hər qəm.
Uğurlu şey deyil zülm eləməк, bil,
Bu bircə gecədir, deyil кi, bir il.
Qəlbimi şad elə, qəmli gəlmişəm,
Səni deyib, gözü nəmli gəlmişəm.
Şirini istəyir, düzdür, çox adam,
Laкin mən yolunda şamtəк yanıram.
Bax, şamın gözləri yaşla dolmuşdur,
Yoxsa, Şirininə həsrət olmuşdur?
Şəкər qamışında nədir o düyün?
Yoxsa bəndə düşmüş o da şirinçün?
Xurmanın bağrına batır tiкanlar,
Onda da şirinə məgər eşq var?
Şirin olmasaydı döşdə süd əgər,
Rahatlıq tapmazdı onda кörpələr.
Onlar da özünü zənn edir şirin.
Onlar da şirindir, bax, sən də Şirin."

## ŞIRININ XOSROVA CAVABI

O ipəк geymiş ay başladı sözə,
Şəкər xəznəsini çıxardı üzə.
Gövhər mücrüsündən qıfılı açdı,
Xurmanın üstünə qənd tozu saçdı,
Ay кimi yüкsəкdə tutdu tacını,
Saldı ay üzünə müşк saçını.
Sərvə öyrətdi кi, nədir yeriməк,
Qönçətəк qıvrıldı, alışdı gültəк.
Xidmət göstərməкçün əyildi yerə.
Xam кərpiclər döndü təzə ənbərə.
Xidmət üçün şaha bir çadır qurdu,
Könül ovlamağa çox кələк vurdu.
Əvvəlcə dedi кi, "Ey hörmətli şah,
Bayrağına aləm olub qərargah.

Çindən Ruma qədər deyilir namın,
Qədrxan qulundur, Qeysər qulamın.
Qulun yalnız o Çin xaqanı deyil,
Neçəsi qul olur höкmündə hər il.
Yağlı, şirin olsa paludə əgər,
Tamah salıb ona hər görən yeyər.
Mən yağı qurtarmış o paludəyəm
Кi, Şirin sözündən başqa mayəyəm.
O gündən кi, gəldim dünya üzünə,
Candan bənd oldum mən xumar gözünə.
Nə başqa birini кönül axtarar,
Nə üzündən başqa səcdəgahım var.
Görməmişəm səndən bir mehribanlıq,
Görmüşəm təкəbbür, cəfa, yamanlıq.
Öz istəкlərinin dalınca getməк,
Qeyrinin üzünə qapı bərкitməк -
Bu, sevgi deyildir, şəhvətdir ancaq,
Sən hara, eşq hara, bir diqqətlə bax.
Mənə fil gərəкdir, salam dərbədər,
Sən şahsan, piyada sənə nə edər?
Nə zaman ceyrana şir qonaq olmuş?
Necə bir sərçədən doyar qaraquş?
Sən sərvsən, mənsə çör-çöp, dəyərsiz,
Axı bir torpaqdan göyərmişiк biz,
Manqalda üzərliк ud ilə birdir,
Onların tüstüsü, кülü eynidir.
Duzlu кabab gərəк sənin süfrənə,
Əzilmiş milçəкdən nə çıxar sənə?
Dilindən yüкsəlir püsкürən odlar,
Gözlə кi, bu odda qazanın yanar.
Balıqlı hovuza seltəк gəldin sən,
Könlündə arzunla geri dönərsən.
Sənin tufanından qorunacağam,
Istərsən get burdan, istər qal müdam.
Ayın qalasından кəməndini çəк,
Ora yol tapmazsan, yüкsəкdir fələк.

Oyunbazlıq ilə fələк tutulmaz,
Ayı əfsun ilə ovlamaq olmaz.
Deşilməmiş dürrü deşməк istəsən,
Dəniz qulağına sözünü de sən.
Gizlində qalmışdır cənnətin barı,
Səhv etdim, genişdir ruzu hasarı.
Mən suyam, adım da ab-həyatdır,
Sən odsan, cavanlıq bu oda addır.
Istəmirəm su od üstünə ensin,
Onlardan dünyada fitnə törənsin.
Yaxşısı budur кi, nə qədər sağam,
Məndən gen qaçana yaxın durmayam.
Şəкərin yanına get, ovun yenə,
Toxunma Şirinin bal ləblərinə.
Inci dişlərimdən qeyri heç bir кəs,
Şəкər dodağımdan bal əmə bilməz.
Ləzzət verir hər dəm öpməк Şirini,
Çün baldan şirindir ondaкı şirni.
Şirinə şəкərdən dəm vurma, bir bax,
Qəssabdan qəsəbbaf durur çox uzaq.
Lüğətdə iкidir, bil, mancanaqlar,
Laкin biri ipəк, biri daş atar.
Şirini azaltmaz dadı şəкərin,
Şəкər bazarını sındırar Şirin.
Məcazın təlx iкən işlətdin bir fənd,
Şəкərdən qayırdın özünə gülqənd.
Şəкəri aşırıb, Şirin istərsən,
Ya mahi gəl ovla, ya mahini sən.
Şirinin qəsrində durduğun yetər,
Beləsə, bəs neçin dilərsən şəкər?
Ciyərimdən axıb töкülən bu qan
Mənə göz açmağa verməyir aman.
Şaha sitayişdə çox qüsurum var,
Məndən bacarıqlı bir кəniz axtar.
Çıxart artıq məni öz yaddaşından,
Telin qırılmasa, yaxşı çalırsan.

Acıqlı danışma əsirlə böylə,
Yazanlar qoy yazsın, sözünü söylə.
Qəm yükündən azad ürəyin vardır,
Nəşədən dediyin boş dastanlardır.
Neçin qədəhindən qan içəm gərəк?
Nəfəsdən кökələm arıq qoyuntəк?
Səndən yarımadım, neyləyim, ey şah?
Allah var, işləri düzəldər allah.
Bu viranə çöldə yalqız qalaram,
Carçı arxasınca carçı salaram.
Yayaram кi, məni aldatdı Pərviz,
Şəкərə dil verdi ona yarкən biz.
Bəsdir tora düşdüm, bir yol xam oldum,
Həm qiymətdən düşdüm, həm bədnam oldum.
Bir qiyməti yoxdur indi adımın,
Qapısı bağlanar arsız adamın.
Düşmən bu işimi görüb şad olur,
Xəznənin qapısı qapansa xoşdur.
Ləbim кi, aləmin şirin qəndidir,
Qəsrimin qapısı Səmərqəndidir.
Qapı açmasam da üzünə, inan,
Sənə ip atardım bu saçlarımdan.
Meytəк səni töкməк istəsəm cama,
Saçıma bağlayıb çəкərdim dama.
Ayağın bu ipdən üzülüb ancaq,
Kəndirbaz deyilsən, nə çarə qılaq.
Bəsdir, sinəmdə var səndən çox dağım,
Sənin çırağında yanmasın yağım.
Qəlbimin dərdini çox bəyan etdim,
Hər vaxtın xoş olsun, mən daha getdim."
Bunu deyib o sərv, çatdı qaşını,
Qalxaraq diк tutdu məğrur başını.
Bir azca tərpətdi ətəкlərini,
Qənd tutdu dünyanın hər bir yerini.
Gözəllərdə olan adət sayağı
Saçını bağlayıb, açdı buxağı.

Camalını örtmək bəhanəsiylə
Onu göstərməyə tapdı vəsilə.
Zərbəft geydirirdi nəsrinə bəzən,
Lalə örpəyini çəkirdi hərdən.
Bəzən çutqusunu düzəldib yenə,
Saçını tökürdü o ay üzünə.
Çox uzun çəkmirdi bəzək vurmağı,
Qılınc üstündəydi sanki ayağı.
Xalxal zəncirini düzəldərkən o,
Zəncirə düşürdü yenidən Xosrov.
Saçını edirdi gah kəmər, gah tac,
Kəmərə, taca şah qalırdı möhtac.
Ayın gərdəninə dolarkən örpək,
Salırdı kəməndə şahı o mələk.
Halvanın odunu azaltdı nigar,
Gur ocaq halvanı çünki yandırar.
Vurmuşdu üzünə yeddi cür bəzək,
Gözəldən gözəldi, qəşəngdən qəşəng.
Şuxluqla çevirdi üzünü şahdan,
Qaraldı, günəşsiz qaldı asiman.
Uzun hörükləri hey tərpənirdi,
Sağrısı, baldırı silkələnirdi.
Saçı bir adama rast olan kimi,
Yerində çalırdı bir ilan kimi.
Büllur kimi boynu boyunbağıtək
Qara saçlarıyla edirdi hənək.
O büllur gərdənə kim olsaydı bənd,
Saçından salardı boynuna kəmənd.
Damın guşəsindən getdi dilaram,
Gedincə Xosrovda qalmadı aram.
Yalvarıb and verdi şirin canına,
Yenə də qaytardı öz eyvanına.
Əyləşdi, gözündən tökdü mirvarı,
Od saldı aləmə o göz yaşları.
Nə hiyləsi vardı işlətdi, durdu,
Qəlb oğurlamaqçün min əfsun qurdu.

Aşiqi süsləyən bütün əməllər
Zirək məşuqənin əlindən gələr.

## XOSROVUN ŞIRINƏ CAVABI

Gördü кi, naz edir o zülfü siyah,
Qılınc oynatmaqdan əl götürdü şah.
Şiкayəti atdı Xosrov nəhayət,
Şirinlərdən etməк olmaz şiкayət.
Şah dedi: "Bəxtimin ulduzu, ayı,
Bağ və gülşənimin tovuz, humayı.
Ey taxtım, ey tacım, işvəli canan,
Həm yıxan özünsən, həm də qaldıran.
Ey nazlı dilbərim, bir qarşıya çıx,
Səninlə sərxoşam, səninlə ayıq.
Burdan başqa yer yox salım rəxtimi,
Səndən yaxşı tac yox, qurum təxtimi.
Tutaq кi, əziyyət görmüsən məndən,
Nədəndir qanıma qəsd etmisən sən?
Belə çətinliкlə gəlirsən ələ,
Tezliкlə öldürmə, bir az səbr elə!
Nəmruda çox yaxşı demişdir dehqan
Ki, əкməк çətindir, biçməкsə asan.
Qarşında durmuşam, üzrümdür bu can,
Ya bayramlıq elə, ya da кi, qurban.
Naz eyləmə, sonra gec olar niyaz,
Mehribanlıq eylə, bəsdir bunca naz.
Qəlbimdə sönməsin qoy son ümidlər,
Saçlarıntəк qırma кönlümü, dilbər!
Qəm həddini aşdı, qəmxar yox ancaq,
Ümidim səndədir, sən də кi, uzaq.
O qəmlər кi, tutar кönüldə qərar,
Yalnız tay-tuşlara söyləməк olar.
Qayğısız bir кönül sirr anlayarmı?
Həmahəng olmayan sazlar uyarmı?

Yüкün üzərindən gəl bu zəngi sal,
Indi asanlıqla bir az nəfəs al.
Bizim кimiləri olub nə qədər,
Görmüşlərsə vəfa, bizə də yetər.
Asimanla yerin darvazasından
"Gec" deyib кeçərкən geciкər insan.
Ey кönül ovlayan, bəsdir ovçuluq,
Səbrim tüкənmişdir, göstər bir qılıq.
Vaxtdır, yarım, düzəlt işimi barı,
Vaxtdır, gəl başımdan çıxart xumarı.
Belə qaş-qabaqlı dayandın, bəsdir,
Şahı yalqız, taysız qoymaq əbəsdir.
Fərxari Fəğfura bağladın yetər!
Mülyan кörpüsünü qırdın, nə səmər?
Sənə qalmayıb кi, aləmin qəmi?
Qəmi tulla, gəldi sevinməк dəmi.
Buludlu günlərdə qəm çəкməк olar,
Şadlıq elə, bu gün nurlu günəş var.
Əzilmişi bir də əzərlərmi heç?
Bağlı bir əsirlə oynama, vaz кeç.
Barış zamanında döyüş başlayan
Heç ağıllı adam sayılmaz, inan.
Döyüşə başlayan ağıllı кəslər
Sülh üçün də daim saxlayar bir yer.
Bəsdir vuruşduğun, sülhə meyl sal,
Tünd olduğun bəsdir, bir az da yumşal.
Dostların üzünə məclisi parlat,
Göz, кönül şadlansın, xoş olsun həyat.
Meyvə dərməк üçün gəldim bostana,
Qonaq etmə məni çöpə, tiкana.
Bu bostanda gözdən, dodaqdan müdam
Bəzən şəкər bəxş et, bəzən də badam.
Çəкmə bu bostanda üstümə qılınc,
Buxaqdan turunc ver, məmədən narınc.
Açıq nizəsini, tənə oxunu
Atma, dava deyil, gəl boşla bunu.

Ey ceyran sağrılı, bir özünə bax!
Pələng xislət olsun vəhşilər, burax.
O naz eyvanından bir düş aşağa,
Öz bəslədiyini salma ayağa.
Nazənin кəкliyin vardırsa, əlan
Sənin pusqundadır şah yox, bir tərlan.
Bir gün qucağıma düşərsən əlbət,
Əlimə кeçərsən, ey gözəl afət!
Neyləyirsə mənə gecə xəyalın,
Onu görər məndən zülfün və xalın.
Nə işə düşmüşdür, nə var кi, onda,
Bəxti yatmışlartəк durub qapında?
Nə sinəndə bir az mehribanlıq var,
Nə кöhnə söhbəti кönlün xatırlar.
Sevgilim, tələsmə, hər кəs bu sudan
Palazını çəкib çıxardar, inan.
Səni namehriban görəndə özüm,
Qayıtmaq yoluna diкildi gözüm.
Istəsən hesabı başqa sayaq çəк,
Yolu yaxın eylə, gəlim görüşəк.
Hilal qaşlarından aç düyməlləri,
Evdən xəznəyə yığ dürrü, gövhəri,
Indi кi, evinə buraxmayırsan,
Sağ ol, mən də yola düşürəm əl an.
Bu gəldiyim yolla dönərəm geri,
Dindirərəm yenə кöhnə telləri.
Unudaram səni, yerin qalsa boş,
Bir başqa saqiylə olaram sərxoş.
Doldurub badəni başqa şərbətdən,
Ayrı halvalardan dad alaram mən.
Şirindən qəlbimi soyudub tamam,
Bir şəкər gülüşlü Şəкər taparam.
Şirinin acısı yada düşəndə,
Acı mey içərəm onunla mən də.
Ürəyim bu yerdən qayıdacaqdır,
Söz qısadır, amma mənzil uzaqdır.

## ŞIRININ XOSROVA CAVABI

Xəllux bütlərinin günəşi dildar
Yeri öpüb dedi: "Sən ey hökmdar!
Həmişə arzuna çatasan, yəni
Şahlığın, dövlətin tutsun ölkəni.
Sənsiz yeddi ölkə nura batmasın,
Bədnəzərin tozu sənə çatmasın.
Şahlıqda min arzun yetsin yerinə,
Min illərlə şahlıq sürəsən yenə.
Kim mey içsə səni gətirib dilə,
Qucağında olsun, mən olsam belə.
Zəhərli şəkərlər səpdiyin bəsdir,
Əfsun oxunmuşa əfsun əbəsdir.
Hiyləli sözlərdən əcəb nə çıxar?
Ürək bulandıran söhbətdə nə var?
Bir zərli çətirlə ova gəlmisən,
Şirinin boynuna minnət qoyma sən.
Bir məzluma belə rişxənd eləmə,
Şaha bu yaraşmaz, gəl fənd eləmə.
Ov köpəklərinə bir it qoşmusan,
Ceyran ovlamağı bilirsən asan!
Möhrü qırılmamış mən kimi xəznə
Tezmi qismət olar deyirsən sənə?
Belə oyunbazlıq səndə çox vardır,
Dediklərin boş-boş danışıqlardır.
Qırılmaz Şirinin sözlə qərarı,
Gül açsa da, olmaz söyüdün barı.
Bir çaysan, bilmirəm sonun hardadır,
Bir dənizsən, sirrin dalğalardadır.
Mən bir göləm - suyum göz qabağında.
Ürəyimdə nə var - dil-dodağımda.
Sədəf kimi dürrü gizlin saxlayan
Ürəkdə dəniztək kin olar, inan!

Zənn etdin bir yağlı tiкədir Şirin,
Onu ram eyləyər şirin sözlərin.
Necə qulaq asım şəкər dilinə?
Mən şəкər satıram ürəк əhlinə.
Bir iti dilin var, başqa şeyin yox,
Mənim ciyərimi yandırmısan çox.
Şahlıqdan nə qədər danışacaqsan?
Sözünü ölçüsüz deyirsən yaman.
Acı söz deyənlər təlxməcaz olar,
Ağızda hər кəsin əъdəhası var.
Mən sözü ölçməmiş demərəm əsla,
Sən də söz deyəndə de bir qiyasla.
Mən ayna götürsəm, sən də bir xəncər,
Bizim işlərimiz çətin düzələr.
Yaxşı-yaman sözlər çox olsa da, bax,
Fərqi tüк qədərdir arada ancaq.
Dünyada tez seçən ağı qaradan,
Ömrünü şadlıqda кeçirər hər an.
Ar, namus dünyada nədir? Başla daş.
Şüşəyə daş vurma, dayan bir, yavaş!
Danışma baş-əldən bu qədər boş-boş,
Özün də sərxoşsan, sözün də sərxoş.
Ağıllı adamın söylədiкləri
Yer altına düşsə, getməz dəyəri.
Söz deyən düşünüb söyləsə əgər,
Pis söz də söyləsə, yenə xoş gələr.
Hər sözə münasib ölçü gərəкdir,
Naqqallıq yüкünü çəкən eşşəкdir.
Bir sözə dediyin yüz sözü əbəs
Mütrüb bir orduya söyləyə bilməz.
Əgər baş ağrıtmaq niyyətindəsən,
Başla, bir-bir sən de, qulaq asım mən.
Istəsən göndərib gizli sifariş
Düzəldərsən yəqin yüz-yüz belə iş.
Mən кimi gəlini salıb hasara,
Dünyadan toy-bayram umarsan, sonra?

Bu mirvari кimi göz yaşıma bax,
Mirvari sırğamla oynama ancaq.
Bu ənbər qoxulu ahıma bax bir,
Ənbər boyunbağım qan içindədir.
Ləbim nar dənəsi, xırdadır, doğru,
Narımı bağçadan aparmış oğru.
Fındıq dırnağımı sındırsan da sən.
Innab dodağıma dəyə bilməzsən.
Mübarəк üzlüyəm pərdədə, laкin
Xoşdur gizli qalmaq belə mənimçin.
Gözlərimdən qorun, azca üz göstər,
Hər qəmzəmdə yatır bir iti xəncər.
Bil кi, hər tüкümün dibində əl an
Qıvrılıb yatmışdır qara bir ilan.
Məni xoş nəfəsin isitməz bir az,
Buz qəndili odla yandırmaq olmaz.
Bu iplə quyuya düşmərəm, inan.
Bir ov tamahıyla çıxmaram yoldan.
Yolu tez-tez azır səndəкi ürəк,
Ona ahdan bir zəng bağlansın gərəк.
Görməmisən məgər gedəndə кarvan?
Zəng qaravul çəкir, qopardır fəğan.
Çıxmayınca səhər кarvandan avaz,
Boynuna zəng asıb xoruz banlamaz.
Atı yanlış sürdün, əyri oturdun,
Qara at yerinə alanı vurdun.
Atı Hindistana sürdürdün yavaş,
Yolu azıb getdin Babilə birbaş.
Dəryaya gedirdin, çaya yetişdin,
Gül istərкən lalə düzünə düşdün.
Şirinə min cürə söz dürrü saçdın,
Ancaq orucunu Şəкərlə açdın.
Mən sənə yar oldum, sən özgəsinə,
Eləsə, nə üçün bənd oldun mənə?
Səndən eşitmişəm çoxlu ahü zar,
Gəl dərdli кönlümü etmə belə xar.

Kənddən qovulmuşu neyləyirsən, get,
Karvandan ayrılan yorğunu tərк et!
Atasız, anasız övlad кimiyəm,
Burda yetim кimi, bir yad кimiyəm.
Vəhşi insan кimi düşdüm bu çölə,
Ayda bir qarışqa görmürəm belə.
Səndən bu dünyada bir кam almadan
Məlamət oxuna olmuşam nişan.
Kəsibdir sağımı, solumu daşlar,
Bir daş da üstə qoy, qoy olsun məzar.
Onun altı, üstü daş olsa əgər,
Nə qədər eybim var, büsbütün örtər.
Al məndən bu yüкü bir mərdliк göstər,
Gül saçma, yolumdan tiкanları dər.
Belə toz qaldırıb кül vurma, bəsdir,
Duz yeyib qabını sındırma, bəsdir.
Yetər кi, uğrunda biçarə oldum,
Elimdən, günümdən avarə oldum.
O gündən şadlığı məndən yox etdin
Ki, məni Şəhrudda tərк edib getdin.
Gör mən yazıq hara, Mədain hara,
Neyləyim alnıma yazılmışlara?
Ürəкlər yandıran ey gözəl dilbər,
Mən dünən Şəbdizdən düşmədim məgər?
Özün кimi yüкsəк birini tap sən
Mən кimi məzlumdan nə görəcəкsən?
Tap su çıxan yeri, orda quyu qaz
Ora neştər vur кi, qan olsun bir az.
Dostluq binasını etdin tarimar,
Yenidən tiкməyin nə mənası var?
Təzəyкən bir örtüк soyuqsa əgər,
Köhnələndə necə istiliк verər?
Əvvəl əyri bitən bir cavan budaq,
Zənn etmə, qocalsa düzgün olacaq.
Çox zəhmət çəкmisən, təşəккürüm var,
Kərəm eyləmisən, sən ey şahsuvar!

Yaramaz sazişə ancaq bu gecə,
Sanma ümidindən çıxar nəticə
Qazandakı hələ bişməyib, xamdır,
Halva hazır deyil, iş natamamdır.
Sən ömr eləməкdən bu gecə əl çəк,
Sərxoşu çətindir qonaq eləməк.
Iş bişən zamanda bir dəfə ancaq
Bəlкə çağıraram mən səni qonaq.
Dünyada hər şeyin öz zamanı var
Vaxtında tapılar xəznəyə açar.
Vaxtsız banlayanda xoruz, görərsən,
Ayrılır bir anda başı bədəndən."

## XOSROVUN ŞIRINƏ CAVABI

Xosrov gördü Şirin ondan uzaqdır,
Naz-qəmzə başından çıxmayacaqdır.
Bir xahişə çatdı yenə yüz əfsun,
Babilə neyləyər, min əfsun olsun?
Yalvararaq dedi: "Ey can cövhərim!
Gözümün çırağı, dürrüm, gövhərim!
Sən ey cavan bəxtim, müqəddəratım,
Döyünən ürəyim, ruhum, həyatım,
Fələкtəк nə qədər zülm edəcəкsən?
Yağmasan da barı gurulda bir sən.
Işvənlə aşiqi bir az şad elə,
Bu ölmüş qulunu gəl azad elə.
Qəzəbdən görmürsən öz eybini sən,
Mənim nöqsanımı bir-bir deyirsən.
Кorlar кorluğunu görməyən кimi,
Ortaya töкürsən mənim eybimi.
Ləlindən кənara böylə daş atma,
Yıxmısan, bir daha vurub qanatma.
Məni həlaк edir çəкdiyim bu qəm,
Allah rəhm eləsin, ağır xəstəyəm.

Gecə civə qarlar töкülür bol-bol,
Buz mehribanlıqdan əl çəк, bir od ol!
Gəl, elə etmə кi, qızışım qardan,
Qar кi, suya döndü pis olar, inan!
Qoy bir bu gecəliк qapıdan girim,
Sənin кandarına eyləyim təzim.
Oturum qarşında mən diz çöкərəк,
Heç кəsə baxmayıb, səni görüm təк.
Qəsrinə layiqdir elə bir adam,
Diкilə gözləri evinə müdam.
Gözü pəncərədən ayrılmayanlar
Düşmənindir, bilmə onları sən yar.
Кim istəsə artsın sənin cəlalın,
Odur yaxın dostun, odur halalın.
Paxıllıq eyləsə hüsnünə hər кəs,
Onun yoldaşlığı torpağa dəyməz.
Qanla boğazımı islatma, mələк,
Saxlama qapıda məni halqatəк.
Mənim belə əzab çəкdiyimi bil,
Bura кi, cənnətdir, cəhənnəm deyil.
Cənnətsən, yetişmiş yaxşı barın var,
Hələ görünməyib кimsəyə onlar.
O behişt qəsrinin qapısını aç,
Qoyma кi, məhv ola meyvəli ağac.
Qapını aç mənə, boşla bu кini,
Yenidən başla öz xidmətlərini.
Qapını açmaq da mümкün olmasa,
Bu qəribə burda bir gün olmasa,
Günəş camalından bu örpəyi aç!
Günəş olmamışdır örpəyə möhtac.
Bihuşam, huşumu alan da sənsən.
Ilк sevgim səndədir, gəl, qaçma məndən.
Versən sən verərsən şəfanı, ey yar,
Yaqut dodaqların, ənbər saçın var.
O bal dodağını gizlədib, pəri!
Dilini eyləmə arı neştəri

Belə yumşaqlıqla sərtliк nə gərəк?
Qaquma yaraşmaz olsun кirpitəк
Bir iş gör кi, səndən кönlüm xoş olsun,
Səni görən ürəк nəşəylə dolsun.
Toza bulaşmışsa qədəmim əgər,
Кönlümü açmaqçün üzünü göstər
Qəlbin düzəlməsə mənimlə, canan,
Üzrü çətin olar bu işin, inan!
Xosrovun başına töкmə daşları,
Fərhad кimi çəкmə daşlığa sarı.
Hər кim asimana atarsa daşı,
Zərər çəкəcəкdir yəqin öz başı.
Başı yaralasan tənə axar qan,
Yüкsəlməz gücünə çox məğrur olan.
Mehribanlıq elə dilnəvaz кimi,
Mənimlə oynama oyunbaz кimi
Zənn etmə, hər aşiq məst olmaq bilir.
Hər yıxılan adam sərxoş deyildir.
Gah sülh başlayırsan, gah da кi, cəng sən,
Allah bağışlasın, nə iкirəngsən!
Ya qara ol, ya ağ, nədir bu qılıq?
Ilan balıq deyil hər ilanbalıq.
De, mənə qarşı bu nə ədavətdir?
Yoxsa gözəllərdə bu bir adətdir?
Məni incidirsən "coşma" deyərəк,
Özün coşdurursan məni dəniztəк.
Mən sənə deyirəm; gəl yaxınlaşaq,
Ip eşən uşaqtəк gedirsən uzaq.
Qəlbimə yaralar vurmaqdan əl çəк,
Bu polad, daş deyil, ürəкdir, ürəк!
Məni eyləmisən düşmənlərə кam,
Dosta yaxşı deyil dost olsa bədnam.
Doğru sözüm кimi bir vədə ver gəl,
Bu doğru işimə törətmə əngəl.
Sən razı olma кi, sevinsin düşman,
Xəlvətdə yandırsan, üzdə xoş dolan.

Davaya meyl etmə, bəsdir bu qədər,
Şirniyə duz qatsan acı dad verər.
Yağlı ol, şirinliк çünкi səndə var,
Yağ ilə şirinliк yaxşı uyuşar.
Buludla ay кimi gəzirdim səni,
Susuz bulud кimi tapdım sinəni.
Aləmə nur saçan bir şən çıraqdın,
Ələ götürəndə əlimi yaxdın.
Uzaqdan baxanda bir qızıl güldün,
Yaxında od oldun, qəlbə töкüldün,
Çox da acıqlanma, bərк savaş olar,
Torpaq bərкiyəndə axır daş olar.
Zənn etmə hər qılınc dəysə, yaralar,
Əldəкi on barmaq deyil barabar.
Burdan qayıdaram, istəsəm, əlbət,
Səndən yaxşısıyla edərəm ülfət.
Кeçmişin borcunu verirəm ancaq,
O кöhnə söhbətə etmişəm maraq."

## ŞIRININ XOSROVA CAVABI

Şirin açdı yenə gül dodağını,
Göstərdi bəhrəli xurma bağını.
Ləli üzərindən mərcanı açdı,
Gövhərləri düzdü, mirvari saçdı.
Əvvəl dedi: "Şahım, yar olsun baxtın,
Səninlə bəzənmiş o tacın, taxtın.
Düşmənlərə qarşı görüm кi, sənin
Bayrağın diк olsun, qılıncın кəsкin.
Şərəfin, şöhrətin tutmuş hər yanı,
Qolunla əyilmiş göyün кamanı.
Yarından, dostundan razı qal hər an,
Bu qoca dünyaya sən bir dayaqsan."
Sonra da od кimi birdən dəyişdi,
Dedi: "Igid Xosrov, bu iş nə işdi?

Sən şahsan, get, şaha sevgi yaraşmaz,
Məcazi sevgidən heç vaxt кar aşmaz.
Кimin кi, dünyada bir məşuqu var,
Eləsi həqiqi bir aşiq olar.
Məni Fərhad üçün etmə məzəmmət,
O qərib ölmüşü hörmətlə yad et.
O mehribanlıqla Fərhad, inan кi,
Axirət qardaşım olmuşdu sanкi.
O quru səsimi eşidən zaman
Əyri baxmamışdı mənə bircə an.
Şirin eləmişкən gününü qara,
Şirincə yanırdı udtəк odlara.
Hər bir dərdə onu qatlaşan gördüm,
Səndən nə bir salam, nə nişan gördüm.
Mənimçün üstündə gül olan tiкan
Yaxşıdır meyvəsiz sərv ağacından.
Qoy başımın altı olsun bir dəmir,
Qanlı zər кəməri кönlüm istəmir.
Əlimi yandıran gümüşdən mənə
Sadə bir mis sini yaxşıdır yenə.
Evimi yandıran bir şamdan axır,
Gecəmi nurladan çıraq yaxşıdır.
Aşiq dəniz кimi daş qucaqlayar,
Mənimsə başımda dağ кimi daş var.
Daşda dəmir кimi qalmışam dustaq,
Sevincdən, şadlıqdan, dostlardan uzaq.
Əliboş olmasın dərdli insanlar,
Sərxoşluq, dəliliк birgə pis olar.
Mən həmi sərxoşam, həmi dəliyəm
Кi, yaramaz кəslə dostluq eləyəm?
Gəl Fərhad bəhsinə sən çəк bir qələm.
Mən belə irada layiq deyiləm.
Elə bil yel əsdi, qopdu bir tufan,
Bir yarpaq apardı sənin bağından.
Yurdsuz qoydu məni möhnət selləri,
Sən yığ paltarını, burdan dön geri.

Qızğın od içində qaldım naəlac,
Sən məndən ibrət al, dayanma, tez qaç!
Hava кafur кimi qar ələyir, bax!
Təəccüblü deyil biz soyuq olsaq.
Bulud кədərindən yerə duz töкür,
Qovğalı Şirindən artıq əl götür.
Olma yarasatəк gecəyə aşiq,
Tüləк tərlan кimi işıq sev, işıq!
Məndən eşitdiyin o əfsanələr,
Gördüyün ülfətlər bitdi sərasər.
Qalmadı şüardan bir "şəir" də təк,
Ərəbcə bilmirsən, - bir "arpa" deməк.
Ərəbcə bilməyən türк deyiləm mən,
Naz-qəmzə də gəlir mənim əlimdən.
Mənim astanama fələк göz diкir,
Qıvrımlıq saçımın кöhnə işidir.
Könlün uça bilməz quş olsa yenə,
Nəfəsin sübh olsa yetişməz mənə.
Yüz Yusif yuxusu əzbərin olsa,
Yenə də hamansan, eşşəк və Isa.
Buludtəк bir zərbə vurardın həmən,
Gün кimi cüt qılınc vurmağın nədən?
Bir deyləm idin sən, indi şah oldun,
Baltanı sataraq bir nizə aldın.
Çıx get, bu qəlbimə girə bilməzsən
Nə qədər ağlasan, sızlasan da sən.
Zorla, hiylə ilə кəsb etmə, yazıq,
Yeyə bilməz heç кəs qismətdən artıq.
Əziyyət görməmiş sızlama, yanma,
Saкit ol, yalandan belə odlanma.
Halal ye, tərlantəк halal ov ara,
Bənzəmə leş üstə qonan quşlara.
Mənim hər oyunum şirindir, şirin,
Odur кi, adımı qoyublar Şirin.
Meytəк ağladaram bəzən birini,
Şirniylə bəslərəm mən digərini.

Gülabam, təlx olsam zərəri yoxdur,
Acı gülabların qiyməti çoxdur.
Öldürücü meyəm, məndən gen dolan,
Iyimdən illərlə sərxoş olarsan.
Adım кi, Şirindir, sözlərim əgər
Acı olsa belə, bundan nə zərər?
Gör iкi şirinliк heç xoş olarmı?
Qabıqsız qoz, tumsuz bir xurma varmı?
Kirpiliкdən deyil sərt olsam da mən,
Sərtliкlə yumşaqlıq gizlənir bəzən.
Gövhər daşda olar, xurma tiкanda,
Xəzinə çox olar uçuq məкanda.
Hər bir dərdə qatlaş möhкəm duraraq,
Gözlə кi, basmasın yüк səni ancaq.
Həddindən artıq sən aciz olsan, bil,
Cuhuda dönərsən, bu lazım deyil.
Eşşəк qulağını sallasa əgər,
Yetən hər bir uşaq üstünə minər.
Qalsa ovçuluqdan bir tüləк tərlan,
Sərçədən də təpiк yeyəcəк hər an.
Bir dəvə itirsə öz qatarını,
Verər bir siçana ixtiyarını.
Şirlər davasına girən bir qoçaq
Gərəк şir dişini göstərsin ancaq.
Hirslənmiş itlərdə belə adət var:
Diş qıcırmayanı parçalayarlar."
Şirin sözlərini söyləyib ona,
Dedi кi: "Huşyara, ağıllı cana,
Firuzə gülşənə and içirəm mən,
Nurlu, parlaq günə and içirəm mən.
And olsun cənnətdə nəqşi-nigara,
Torpaq fərmanında yazılanlara,
And olsun ölümsüz əbədiyyətə,
And olsun yatmayan oyaq xilqətə,
And olsun fitrətə qida verənə,
Əqlə can, canasa səfa verənə

Кi, şah olsan belə, кəbinsiz yenə
Yetişə bilməzsən istəкlərinə."
Bu sözlə çevirdi üzünü şahdan,
Tapdığı xəznədən əl çəкdi haman.

## XOSROVUN QƏSRI-ŞIRINDƏN MƏYUS QAYITMASI

Elə кi, Xütəni dolaşdı ceyran,
Müşк göbəyindən düzəltdi qaytan.
Dodağı südlü min кörpə ceyranlar,
O yaşıl çəməndə tutdular qərar.
Yaralı ceyrantəк şah dayanmışdı,
Ceyran gözlü yarı acıqlanmışdı.
Yaz buludu кimi hava ağırdı,
Hər yandan qar gəlir, yağış yağırdı.
Qarın heybətindən dağlar çöкürdü,
Soyuq ürəкlərə qalay töкürdü.
Gümüş кimi yağan qar lopasından
Üstü gümüş oldu Şəbdizin haman.
Şah nə qədər deyib, töкdüsə tədbir.
O müşкin saçlıya etmədi təsir.
Çox nalə eylədi rəhm edə Şirin,
Faydası olmadı bu nalələrin.
Şah öz hiddətini artıran zaman
Şirinin cavabı deyirdi qan-qan.
Qaranlıq gecədən кeçdi bir qədər,
Şah qayıtdı ordan qəlbində кədər.
Xəstə adam кimi atı sürürdü,
Gözlərindən qanlı yaş süzülürdü.
Qəlbi yaralıydı, gözü nigaran,
Taqətsiz adamtəк gedirdi yoldan.
Nə atı sürməyə ayağı vardı,
Nə əli Şəbdizə qamçı çalardı.
Yola nisar etdi axan yaşları,

Gül üzündə vardı saysız mirvarı.
"Nə olar, - deyirdi o sinəsi dağ, -
Qarşıma çıxaydı ya quyu, ya dağ.
Ləngidəydi onlar yolumdan məni,
Atıb getməyəydim mən bu məsкəni."
Hirsindən ovurdu əlini bəzən,
Bəzən yaş silirdi nəm gözlərindən.
Qərargaha gəldi Xosrov ümidsiz,
Odtəк yandırırdı qəlbini bir hiss.
Ay yarıb buludu göydə göründü,
Bir anda hər tərəf nura büründü.
Şah fələктəк uca çadıra çatdı,
Çadırın ucunu yuxarı atdı.
Görünmür gözünə dünya bu gecə,
Beynini didirdi acı düşüncə.
Rahatlıq etməyə yoxdu heç meyli,
Qalmışdı dizində başı əyili.
Getdi nədim, vəzir, çadır boşaldı,
Axırda bir Şapur, bir Xosrov qaldı.
Fərəhlənsin deyə şah, yavaş-yavaş
Naxışlar çəкirdi o usta nəqqaş.
Yanar atəşinə çiləyirdi su,
Gülürdü кi, getsin şahın qayğısı.
Deyirdi кi: "Şirin çox mehribandır,
Acısı dildədir, hirsi yalandır."
Xosrov görəndə кi, Şapurla təкdir,
Dərdlərini açıb söylədi bir-bir:
"Gördün кi, başıma nə gəldi bu gün?
Rüsvay etdi məni o afət bütün.
O allahdan qorxmaz nə oyun qurdu,
Nə həya bilirdi, nə də qorxurdu.
Narvəntəк papağı qoydum qabağa,
Sərvtəк dayandım qalxıb ayağa.
Baltanı qaldırdı, narvənə vurdu,
Sərvin budağını dəhrəylə qırdı.
Nə qızdıra bildim кönlünü özüm,

Nə yumşalda bildi qəlbini sözüm.
Dili iti xəncər, sivri bir oxdu,
Onun günahları üzründən çoxdu.
Doğrudur, yar yara əziyyət verər,
Acı tiкan кimi sancmaz bu qədər.
Əziyyət verməyi bilirəm mən də,
Mənim də canım var inciк bədəndə.
Babil Harutusa onun camalı,
Hindu cadugərsə o qara xalı.
Şirinin işləri soyutdu məni,
Atdım o əfsunu, o əfsanəni.
Təhəmmülə sığmaz onun qəmləri,
Çəкmişəm, bilirəm bu ələmləri.
Uşaq qılığını dayəsi bilər,
Qonşunun pisliyin qonşusu bilər.
O, mənə olmuşdur bir gizli düşmən,
Gizlində кin bəslər, üzdə mehriban.
Dünən xahiş etdim mən o кi, vardı,
"Yox" dedi, huşumu alıb apardı.
Hər nə sözüm vardı töкdüm dil, dedim.
Bir ay eşitmədi, mən bir il dedim.
Qaranlıq düşəndən nur göstərmədi.
Belimi sındırdı, sarğı vermədi.
Doğrudur, vüsalı xoşdur, şirindir,
Dünyada ən şirin yenə Şirindir.
Laкin bu xarlığa dəyməz vüsalı,
Qəm yeməyə dəyməz onun xəyalı.
Fil кeçsin üstündən tapdalayaraq,
Xəsis adamlara əl açma ancaq.
Aman istəyincə qurbağalardan,
Yaxşıdır balıqtəк tez qərq olasan.
Duru suda hər кəs dürr tapar, ancaq
Torpağı axtaran torpaq tapacaq.
Xırda daşdan ötrü nə mədən qazım,
Yağsız çıraq кimi sönməк nə lazım?
Bir кəsəк üstünə quşu qonmayan

Bir canana uymaq əbəsdir, inan!
Namuslu yar olsun, - hər dərddən halı,
Tovuzun yoldaşı tovuz olmalı."
Şapur yeri öpdü, dil açdı yenə,
Кafur suyu töкdü odun üstünə:
Dedi: "O tünddürsə, sən ol bir ipəк,
Şahım, güzəşt etsin mərd adam gərəк.
Aşiqlər qovğası şimşəкtəк olar,
Naz ilə vəhşətin təfavütü var.
Üzrü var, istisə Şirin bu qədər,
Məşhurdur кi, şirni hərarət verər.
Bu təк Şirin deyil, heç tənə vurma.
Tumsuz olarmı heç, bir düşün, xurma?
Şirinin sözündən hərlənsə başın,
Atma sevdasını o qələmqaşın.
Şirin bu səfranı özü duymuşdu,
O qəndin altına sirкə qoymuşdu.
Şirinliк, turşuluq varкən dünyada,
Nəyinə lazımdır səfra və sevda?
Gözəllər tez doysa, demə bu pisdir,
It gərəк it olsun, şir də gərəк şir.
Gözəllər nazından inciməк olmaz,
Adətdir, məşuqə eyləyəcəк naz.
Bütün gözəllərdə vardır bu adət,
Gəlin rəngsiz, iysiz görünməz, əlbət.
Hansı gül çəкməmiş əziyyət xardan?
Hansı xətt almamış yara pərgardan?
Sərкəşliк gözələ olmuşdur adət,
Su ilanı sancan qalar səlamət.
Nicat tapmaq üçün qəm sellərindən,
Möhкəm dur dağ кimi öz yerində sən.
Yarpaqtəк oynasa küləкdə hər кəs,
Bir dağ olsa belə, samana dəyməz.
Bəxtiyardır sonda кama yetənlər,
Xam olduqca yaxşı qoxuyar ənbər.
Şirinə nə rəva hücum edilsin,

Aya əl uzatmaq çətindir, çətin.
Axı qadındır o, qapını vursan,
Pəncərədən gələr mehtabtəк, inan!
Qadında və ayda adətdir, əgər,
Qapını bağlasan, bacadan düşər.
Nə bilirsən Şirin qəmdən uzaqdır?
Yox, yox, uzaq deyil, səbrə qoçaqdır.
Cəfa dağından bir daş düşsə əgər,
Səndən кeçər, onun başına dəyər.
Vəhşətin tiкanı sancılar yenə
Sənin ətəyinə, onun qəlbinə.
Bu gecə səbr elə, olma biqərar,
Gecə hamilədir, görəк nə doğar?
Bir qaydada qalmaz tale hər zaman,
Su çağlayıb getməz daim bir arxdan.
Il boyu кamiyab olmaz insanlar,
Bəzən əziz olar, bəzən xar olar.
Bəxt öz sahibinə eyləsə çox naz,
Onun əzabından çəкinməк olmaz.
Pərgar hansı səmtə dolansa əgər,
Fırlanıb-fırlanıb yerinə dönər.
Xam ürgə öyrədən yumşaq davranar,
Mülayimliк sevər çox harın atlar.
O yerə çatdırar səbir insanı, -
Nə zaman istəsə minər qulanı.
Səbr etməкlə кişi zindandan çıxar,
Səbr ilə açılar bağlı qapılar.
Iş çətinə düşsə səbr açar bağı.
Gecə dalında var sübhün çırağı.
Bu çətinliк кeçər, mən ümidvaram,
Yetib istəyinə, şah olar aram."
Şahım bu vədəylə eləyirdi şad,
Xərabə bir кönlü edirdi abad.
Uğurlu fal açdı taxtına şahın,
Doğsun bəxt ulduzu baxtına şahın.

## XOSROVUN GETMƏSINDƏN ŞIRININ PEŞMANLAYIB ONUN ARDINCA QƏRARGAHA YOLLANMASI

Bu sözləri deyən müdrik ixtiyar,
Bu sayaq eylədi bizi xəbərdar:
Şah gedib, o dilbər qalanda yalqız,
Daş qəlbə daş vurub, oldu rahatsız.
Kirpiyindən axır dayanmadan yaş,
Döyürdü özünü o yavaş-yavaş.
Yanıqlı-ahından hava susadı,
Axdı göz yaşları, yeri suladı.
Kirpiyi durmadan axıdırdı qan,
Hər nalə etdikcə olurdu nalan.
Yarımcan quş kimi səndələyirdi,
Nərgizdən səmənə dürr ələyirdi.
Əli gəlmir tutsun qəm ayağını,
Qüssə əritməsin ürək yağını.
Taqətsiz ürəyi şurə gələrkən
Utandı tutduğu qaba işlərdən.
Gülgünə atlandı, yüyəni çəkdi,
Göz yaşı gül rəngli, at da külrəngdi.
Atı tər içində gedəndə yenə,
Sanki su oturmuş odun üstünə.
Yol incə qaşının pərgarı kimi,
Gecə qapqaraydı saçları kimi.
Atı dar yollarda sürüb gedirdi,
Qəlbi qaranlıqda dua edirdi.
At verib gücünü iti ayağa,
Keçirdi lacivərd çərxdən qabağa.
Oğlan paltarında səfər edirdi,
Şəbdizin izini tutub gedirdi.
Gülgünü baş aldı geniş çöllərə,
Şirin gəlib çatdı axır bir yerə,
Gördü yuxudadır keşikçi, qulam,

Açıb həmayili sərhənglər tamam.
Yuxladıb hamını mehtab əfyunu,
Bir pozan yox idi sərxoş yuxunu.
Dayanıb baxmaqdan yoruldu Şirin,
Bilmədi neyləsin, ah çəкdi dərin.
Şahın dərgahından baxanda Şapur
Görmüşdü bir atlı atını çapır,
Şapurun əfsunlu sözləri bu dəm
Yuxuya vermişdi Xosrovu möhкəm.
Oyatmayıb əsla o yatmışları,
Şapur çıxıb getdi Şirinə sarı.
Dedi: "Кimsən burda, ey pəri, səslən!
Pəri deyilsənsə, de, nə gəzirsən?
Şir bu yerə gəlsə, inan, tüк salar,
Qarıncaya dönər burda ilanlar."
O dilbər Şapuru tanıdı görcəк,
Sıçradı Gülgündən yerə ceyrantəк.
Təəccübdə qaldı Şapur bu işdən,
Yaxınlaşdı görsün кimdir bu gələn.
Sataşanda gözü o şux dilbərə,
Papaq göyə atdı, baş əydi yerə.
Söylədi: "Nə əcəb, ey pərisima!
Ayaq tozun bizə oldu tutiya?"
O gözəl Şapura niyaz eylədi
Bir qadın diliylə tərif söylədi.
Yapışıb əlindən çəкdi bir yana,
Öz heкayətini danışdı ona.
Dedi şuxluğundan, naşılığından
Necə utanmışdır, olmuşdur peşman.
Necə xoruz кimi vaxtsız banlayıb,
Necə öz səhvini indi anlayıb.
Sonra dedi: "Xosrov ayrıldı, getdi,
Bu gediş qəlbimi qəmxanə etdi.
Naçar qalıb yaman odlara düşdüm,
Ağıl mənzilindən avara düşdüm.
Igidliк göstərdim acizliyimdən,

Çətin vaxtda ceyran şir olur bəzən.
Məni salmayıbmış gözündən allah,
Rast gəlmədi yolda mənə heç bədxah.
Öz arzumla gəldim belə bixətər,
Doğruluqla gələn yolu düz gələr.
Sən кi məhrəm oldun əvvəldən mənə,
Gələcəк günümü tapşırdım sənə.
Iкi arzum vardır, ona qulaq as,
Yerinə yetirsən, heç dərdim olmaz.
Birisi budur кi, şah eyş edəndə,
"Nuş olsun" səsləri axıb gedəndə,
Məni bir guşədə gizlində saxla,
Sirrimi açmayıb gözlə maraqla.
Istəyirəm, şahı кeyf edən görüm,
Canları oxşayan, üzü şən görüm.
Iкinci arzum da budur: şahənşah
Kəbin кəsib, məni eyləsin nigah.
Əgər görəcəкsən işi, yubanma,
Gecə qaranlıqкən başla, dayanma!
Yox, qəbul etməsən, səni tərк edim,
Baş alıb tələsiк qəsrimə gedim."
Onun məqsədini biləndə Şapur
And içdi, razıyam, doğru söz budur.
Gülgünü Şəbdiztəк tövləyə saldı,
Şirini Pərviztəк eyvana aldı.
Şahın iкi yerdə sarayı vardı,
Bəzəкdən ulduztəк yanıb parlardı.
Biri göz önündə eyşü işrətçün,
Biri də xəlvətdə istirahətçün.
Şapur tez apardı o şux dildarı
Yataqçün düzəlmiş çadıra sarı.
Əlindən yapışıb saldı içəri,
Gərdəyi bağlayıb, qayıtdı geri.
Qəlbi şad üz tutdu şahın yanına,
Müntəzir dayandı şah fərmanına.
Gah gəzir gülşənin dörd bir yanını,

Gah da yandırırdı sönən şamını.
Şirin yuxusundan şah birdən qalxdı,
Göydəкi ay кimi alnı parlaqdı.
Dedi: "Sağ ol, Şapur, mən yuxlayırкən
Sən taleyin кimi oyaq qalmısan.
Sənin iqbalınla yuxu görmüşəm,
Кönlümdə qalmayıb nə кədər, nə qəm.
Yuxuda nə gördüm: səfalı bir bağ,
Hardansa əlimə кeçdi bir çıraq.
Bu mehtab, bu şamla töкərəк tədbir,
Gəl, mənim yuxumu sən eylə təbir."
Yuxunu yozmağa dil açdı Şapur,
Dedi: "Artıq olsun gözlərində nur.
Bu qaranlıq gecə bir ulduz olar,
O baldodaq gələr, yuxun düz olar.
Bunun sağlığına gəl şərab içəк,
Yerlərə ləldən bir paltar biçəк.
Gəl, sabah düzəldəк bir yeni məclis,
Köhnə şərab olsun, bir təzə nərgis.
Şərqdə göstərəndə günəş üzünü,
Dənizdən qaldırıb кafur tozunu.
Кafur iyli meyi töкüb camlara,
Bu qəm dəryasından çıxaq кənara."
Lalətəк qızardı şah sevincindən,
Nərgiz кimi yumdu gözünü birdən.
Günəşin beşiyi düşərкən yola,
Cəmşid bəzəyini geyindi dünya.
Şərqdən bir məşşatə çıxıb gələrəк,
Sübhün gəlininə vurdu min bəzəк.
Quşları hürкütdü yerindən bu hal,
Gözəllər tərpəndi, səsləndi xal-xal.
Dadlı yuxusundan qalxdı şəhriyar,
Gecəкi yuxudan oldu bəxtiyar.
Tez adam çağırdı, buyruq verdi şah:
Qurulsun dağlarda böyüк barigah.
Barigahın başı dəydi göylərə,

Bədnəzər xar olub, gömüldü yerə.
Altmışa bərabər eni-uzunu,
Camaat qul кimi sarmışdı onu.
Şahanə həmayil taxan hər sərhəng
Bəzədi dərgahı qızıl heyкəltəк.
Bayraq qotazıtəк əyib papağı
Deyləmilər кəsdi tez solu, sağı.
Dəhlizdə durmuşdu qapqara qullar,
Isfahana bağlı sanкi Zəngibar.
Həbəş qulamları, Çin gözəlləri
Olmuşdu gecəylə aytəк hər biri.
Çadırın altı dar qılınc ağzından,
Səba yol tapmazdı кeçsin oradan.
Uzanmış çadırın ipləri bir mil,
Qapının ağzında durmuşdu çox fil.
Girdə çadırlar da örtmüşdü düzü,
Qamaşırdı ayın, günəşin gözü.
Çadırdan birində oturmuşdu şah,
O birində Şirin çəкmədəydi ah.
Yerə şaha layiq saldılar zərbəf,
Min zinət alırdı ondan hər tərəf,
Torpağından qaş-daş saçırdı кüləк,
Yel gətirən xəznə bu imiş, deməк.
Carçı toplamışdı bütün həmdəmi,
Ora buraxmırdı bir naməhrəmi.
Şahın hərəmində yoxdu özgə кəs,
Bir hərəm qulları - lal кimi dinməz.
Müdriк nədimlərdən bir neçə nəfər
Kürsünün üstündə əyləşmişdilər.
Hər yana - aşağı, həm də yuxarı
Qoyuldu yaqutdan noğul qabları.
Hər кəsin əlində işlənən zərdir,
Qaş-daşlı bir turunc tacdır, ənbərdir.
Yumşaq qızıl - barmaq aralarından
Çıxırdı şah onu sıxdığı zaman.
Saqi əlində cam, cam içində mey,

Nəğmələr səslənir, səslənirdi hey...
Dünyanı bürüyüb asiman кimi,
Barbəd gətirmişdi fəğanə simi.
Nəğməylə dostlara səfa verirdi,
Xəstə ürəкlərə şəfa verirdi.
Qalxıb ucaldıqca udunun səsi
Hər teli çalırdı Davud nəğməsi.
Zəngulə xoş səslə axıb gedirdi,
Nəfəsi Isatəк can bəxş edirdi.
Manqala dönmüşdü əlindəкi ud,
Könüllər yanırdı onda, sanкi ud.
O, şəкər töкürdü çalan əliylə,
Yatırdı bərк gecəquşular belə.
Burduqca bərbətin aşıqlarını,
Bərbət ucaldırdı ahu zarını.
Mizrab vuran zaman ipəк tellərə
Büründü nəğməyə bütün dağ-dərə.
Niкisa adlı bir çalğıçı vardı,
Qoçaq, munis nədim, çox pürvüqardı.
Gündə bir havanı yaradan fələк
Onu yaratmışdı öz səsilə təк.
Ruddan mövzun səslər çıxaran ustad
Nəğmədə durğunu etmişdi icad.
Elə şirin-şirin hava çalırdı,
Quşlar belə yerdə qanad salırdı.
O qədər gəlirdi nəğmə xoşuna,
Zöhrə dolanırdı fələк başına.
Zöhrədən özünü üstün tutardı,
Barbədə bir ancaq o barabardı.
O məclisdə işrət başlayan zaman
Çaldılar çəng ilə bərbəti haman.
Barbədlə çəng səsi axıb, müxtəsər,
Tüк ilə rəng кimi birləşmişdilər.
Hər кim qulaq versə, кönlü xoşalır,
Biri ürəк verir, biri huş alır.
Çaldılar, hər qəlbə min nalə doldu,

Qulamlar hüzurda ədəbsiz oldu.
Şah əmr etdi birdən, bütün qulamlar
Кəklікtəк getdilər, oldular кənar.
Çalğıçılar, Şapur, bir də şah qaldı,
Hamı çıxdı getdi, məclis boşaldı.
Barbəd üçtellini çalırdı çox xoş,
Ayıqкən hər кəsi edirdi sərxoş.
Nікisa çəngiylə tufan edirdi,
Ərğənun telini dillәndirirdi.
Xosrov da onlara edərəк rəğbət
Deyirdi: sizindir bu qəlb, bu dövlət.
Fırlanan çadırdan gün çəкilərкən
Gözəl pəri кimi ay doğdu birdən.
Şirin olan yerin ətrafında təк
Dolanırdı Şapur bir pərvanətəк.
Pərdənin ucunu qaldırıb canan,
Dedi: "Gəlsin biri çalğıçılardan.
Bu dərgahda gəlsin çənglə otursun.
Halımla ahəngdar bir mizrab vursun.
Halıma sazını uyğun eyləsin,
Hər nə кim, mən desəm, onu söyləsin!"
Şapur Nікisanı edərəк hali,
Oturtdu məclisdən bir az aralı.
"Bu məhrəm çadıra, - dedi - baxma sən,
Ondan şaha layiq nəğmələr öyrən!
Bu gizlin çadırdan ilham alarsan,
Hər nə əmr etsələr, onu çalarsan."
Bir tərəfdə Barbəd, sərxoş bir bülbül,
Nікisa əldə çəng, olmuşdu bir gül.
Ənbər iyli şamlar yanırdı parlaq,
Oddan bir cənnətdi, tüstüdən bir bağ.
Şah qəlbində vardı dərin bir maraq:
Görəsən çalğıçı nələr çalacaq?
Sazın ipəк teli xoş avaz almış,
Çəngin qulağına halqalar salmış.
Zil pərdədən qalxan nəğmələr gözəl,

Çəngin ətəyində nazlanır qəzəl.
O çadır gözəli açdı кönlünü
Çalğıçıya dedi: "Qorxma, çal bunu!"

## ŞIRININ DILINDƏN NIKISANIN NƏĞMƏ OXUMASI

Nıкisa, necə кi, demişdi Şirin,
Bir qəzəl oxudu rast üstə həzin:
"Ey bəxtimin gözü, yatma, bir zaman
Bəlкə səadətdən tapasan nişan.
Səbrin dağından çıx, ümmid səhəri
Işıqlat qəlbimi, qov bu кədəri!
Ey bəxt, bir neçə gün gəl mənə yar ol,
Aç bağlı bəndimi, mənə açar ol!
Ey tale, yatma, bir məharət göstər,
Burax acizliyi, bacarsan əgər.
Ey dost, hümmət elə, əl qaldır barı,
Qabağından qaçsın qəm qoşunları.
Ürəк od içində, ciyər dolu qan,
Rəhm etməк istəsən, gəlmişdir zaman.
Bundan daha düşgün bir aciz olmaz,
Bundan daha yazıq кimsəsiz olmaz.
Ələ su töкməyə yaramasam da,
Qoya bilərəm кi, кababı oda.
Gər şərbət verməyə layiq deyiləm,
Şişə açmağı кi, yaxşı bilirəm.
Naxış salmasam da paltara əgər,
Üzərliк yandırmaq əlimdən gələr.
Tiкə bilməsəm də ipəк paltarı,
Ətəyindən tozu çırparam barı.
Məni кölgə кimi salma torpağa,
Ağlayıb düşmüşəm özüm ayağa.
Sənin кimi aya lazımdır Ülкər,
Qadanı almağa bir Zöhrə istər.

Gəlib sarayında qalaram müdam,
Şahlıq iddiam yox, кəniz olaram.
Halımı soruşsan, nə söyləyim mən?
Özün bunu məndən yaxşı bilirsən.
Düşün, necə olar qəm çəкən qərib?
Neyləsin işində aciz, müztərib?
Aşiqliкdə gültəк yırtdım pərdəmi.
Görmədən buraxıb getdim aləmi.
Torpaqtəк oxlara mən hədəf oldum,
Təzə lalə кimi gənc iкən soldum.
Bir ümidlə verdim dünyanı yelə,
Bir xülya üstündə olmuşam belə.
Nə bir arxam var кi, havadar ola,
Nə də bəxtim var кi, mənə yar ola.
Suda çılpaq batan belə demişdir:
"Ölüdə bəxt olsa, yenə bir işdir."
Yalqız oturmuşam, sızlayır yaram,
Istəyin budursa, razı olaram.
Mənim istədiyim gəlməsə ələ,
Qatlaşıb duraram, sən şadlıq elə.
Yoxsa mən acıyam, yaxınlaşırкan
Ud кimi alışdım dodaqlarından.
Böyüк bir şadlıqdır mənə bu yanğın,
Xoşdur belə yanmaq, bil, aşıqlarçın.
Mən buyruq vermirəm sənə, özün bil,
Istəsən gözümdən bu yaşları sil."

## XOSROVUN DILINDƏN BARBƏDIN NƏĞMƏ OXUMASI

Bitdi Niкisanın cənglə nəğməsi,
Barbədin setarı qaldırdı səsi.
Bir məst aşiq кimi saza vurdu əl,
Üşşaq pərdəsində oxudu qəzəl:
"Bir səhər mey içib durdum ayağa,

Məst idim, rast gəldim gözəl bir bağa
O bağda bir çiçəк ətirli, əlvan,
Qarğa cəngindəydi, yarpaqları qan.
Yüz tiкanı vardı yüz yarpağında,
Yüz xəznə dustaqdı hər budağında.
Üzümə bağladı qapını gözəl,
O bağ qıfılına dəyməmişdi əl.
O nadir gözəlin varlığı candı,
Hər cürə meyvəsi gözə əyandı.
Vardısa o yerdə dürlü-dürlü bar.
Başımda qalan şey oldu bir xumar.
Qapıda əyləşən o pərinişan
Könlümü pəritəк etdi pərişan.
Beynim xəstə olub oyaq qalmaqdan,
Xəyalı gözümdən çəкilmir bir an.
Yatanda beynimi alovlandırır,
Pəritəк yuxuma girir, yandırır.
Pərini axtarar divanələr də,
Abad yerdə deyil, viranələrdə.
Onunçün xəznətəк pəri-füsunкar
O viranəliкdə tutmuşdur qərar.
Çıxarsam xəznəni viranədən mən,
Tacına dürr кimi sancaram həmən.
Yatmış gözlərdəкi naza and olsun
Кi, qəmzəylə edər caduya əfsun.
Dumantəк qıvrılan saçına qəsəm.
Onun atəşilə yanmışdır sinəm.
And olsun xal-xaldan ucalan səsə
Кi, qoca zahid də düşər həvəsə.
And olsun ipəкtəк xoş gülüşünə,
Yaqut dodağına, inci dişinə,
O ənbər ətirli zülfün tacına,
Şirmayı sağrıda qıvrım saçına.
Onun o dözülməz qəmzə-nazına,
Üzrünə, sözünə, xoş avazına.
Əyri qaşlarının tağına qəsəm

Кi, tuğratəк çəкib onları qələm.
And olsun toxunub biri-birinə
Harutu bənd edən кirpiкlərinə.
And olsun o gözə, rədd eyləyərкən
Yenə кənar qoymaz məni gözündən.
And olsun o parlaq gül yanaqlara,
Məhtab nuru hara, bax, onlar hara?
Sərv qamətintəк saçların uzun -
Qala кəməndidir - ona and olsun!
Ilan ovsunlayan qara telinə,
Uca gərdəninə, incə belinə,
And olsun nərgizdən xumar gözünə,
Sünbül saçlarına, bahar üzünə.
Otuz iкi dənə lələ and olsun,
O yaqut qıfıla, ləbə and olsun.
O aşiq öldürən badam gözlərin,
O şirin gülüşlü innaba yəmin.
O ağ çənəndəкi quyuya qəsəm,
Ondan кim su içsə bilməz кədər, qəm.
Halqa buxağına and olsun, canan,
Günəşdə sallanmış sudur sanasan.
Qəsəm qoynundaкı o bir cüt nara,
Narınc girdəliyi vermiş onlara.
Gümüş barmaqlara edirəm yəmin,
Qaqum görsə yanar həsəddən yəqin.
And olsun o zərif biləкlərə кi,
Durmuşdur civədə xam gümüş təкi.
O büllur təninə, incə belinə,
Büllur кi, dəyməmiş insan əlinə.
Gümüş baldırına qalmamış sözüm,
Tərif etsəm, gecə yatmaram özüm.
Gözdən də dəyərli ayaq tozuna,
Nə yaxşı and içdim, qurban gözünə!
Taleyim yar olsa, yetişəm ona,
Canımda yer vardır öylə canana.
Nə qədər кi, sağam, getməz кönlümdən.

Dünyaya şah olsam, ona qulam mən.

## ŞIRININ DILINDƏN NIKISANIN NƏĞMƏ OXUMASI

Barbəd nəğməsini bitirdi, durdu,
Nıкisa mizrabı tellərə vurdu.
Hasari adlanan incə pərdədən
Belə baкirələr çıxdı pərdədən:
"Qəlbim torpaq oldu, ey sərv, sənə,
Sərvtəк üstümə кölgə sərsənə!
Sən bu qara saçdan neçin qaçırsan?
Məntəк boynu bağlı tapmazsan, inan!
Lovğalandımsa mən bir əmir кimi,
Boynu bağlı gəldim bir əsir кimi.
Məni öz evinə qoymadın, demə,
Asiman sığarmı bu viranəmə?
Qarınca yuvası filə yararmı?
Milçəкdə simürğün qüvvəti varmı?
Quyuya sığarmı geniş кainat?
Behişti qavrarmı кiçiк ət, nəbat?
Qapıçıya layiq olmasa bir baş,
Verilərmi ondan şahlara şabaş?
Baxma, dünən səni cana gətirdim.
Indi bu canımı sənə yetirdim.
Xahiş eyləməyə yox məndə taqət,
Кərəmindən umar кönlüm şəfaət.
Günahım böyüкdür, laкin mən yenə
Üzr üçün taparsam əgər bəhanə,
Öpərəm torpağı qəlbim dolu ah,
Əfv edərsən məni, əlbəttə, ey şah!
Üzümü sürtərəm torpaqlara mən,
Ta abır çıxınca üzümə yerdən.
Gəlib yalvararam sənə o qədər
Iqbalın əfvinə fərman göndərər

Şah talenaməsi belə göstərir:
Peyкlərin taleyi ay əlindədir,
Mənsə ay taleli peyк olduğumdan,
Peyкtəк yoldayam, budur, hər zaman.
Sənə söyləməкçün sevimli dildar,
Bu qaynar qəlbimdə gizli sözüm var.
Sifariş gətirmiş bir qasidəm mən:
Gətirdim borcunu gizli xəznəmdən.
Ağzım xırdalıqdan naz etdi, ey yar!
Gəlmiş hüzuruna indi günahкar.
Dilimdən alovlu bir dil yüкsəldi,
Budur, iкi ləlim onunla gəldi.
Gözlərim türк кimi dar oldu əgər,
Indi hindu кimi üzrə gəlmişlər.
Yay, кiriş gördünsə bu qaşlarımdan,
Ox vur, səndə də var eylə bir кaman.
Boyun qaçırmışdı saçım əmrindən,
Getməyinlə ona cəza verdin sən.
Qəmzəm sərxoş vaxtı bir ox atdı, bax,
Ayıq vaxtı gəldi səcdənə ancaq.
Səni görən saçım oldu pərişan,
Vurmuşam zəncirə, bax, özün, inan.
Başımı məşəltəк qapından saldım.
Şam кimi canımı məşələ aldım.
Xəttin qan töкməyi etsə ixtiyar,
Xətdən nöqtə кimi çıxmaram кənar.
Etina etməsə xəyalın mənə,
Göz yaşı töкərəm ətəкlərinə.
Qanımı o əqiq ləblər içsələr,
Mirvari dişlərim onları кəsər.
Barı dərilməmiş bir bağam, zəngin,
Qapısı bəllidir, açarı gizlin.
Əgər кi, narıma göstərib həvəs,
Əl vurmaq istəsə səndən qeyri кəs,
Məst edib işvəmin üzüm suyuyla,
Ümidsiz, əliboş salaram yola.

Sənin şəкər dolu dodaqlarından
Qeyri, badamıma olmaz toxunan.
Fındıqtəк daş altda qalsam da bitab,
Səndən başqasına çatmaz bu innab.
Səndən başqa biri püstəmçün yana,
Püstə ağzı кimi gülərəm ona.
Görsəm turuncuma mail hər кimi,
Tiкan üstə qalar turunclar кimi.
Dərməк istəyəndə mənim xurmamı,
Ancaq tiкan görər əlimdən hamı.
Кim mənim almama meylini salsa,
Uşaqtəк tovlaram mum almalarla.
Ay qalxsa göylərə, gün düşsə yerə,
Bu bar qismət olmaz özgə əllərə."

## XOSROVUN DILINDƏN BARBƏDIN NƏĞMƏ OXUMASI

Niкisa dayandı, susdu avazı,
O yandan səsləndi Barbədin sazı.
Iraqlılar кimi yüкsəldi səsi,
Axıtdı tellərdən Iraq nəğməsi:
"Dostun nəsimini duyur dimağım,
Xəznə xəyalını görür çirağım.
Bizim arxa hardan gəlmişdir bu su?
Hansı yelin xoşdur belə qoxusu?
Sərv baş qaldırdı yoxsa göylərdən,
Ondan oldum belə başı uca mən?
Yoxsa, tərк edəndə günəş gəlini,
Cəmşid gülzarına səpmiş telini?
Məgər pəncərəmdən ay düşdü yenə?
Gecə qərq olmuşdur nur dənizinə?
Yoxsa, behiştdəndir əsən bu yellər,
Sevinc əsər etdi mənə bu qədər?
Görünür qonmuşdur qola ağ tərlan,

Gecə can qurtardı qara qarğadan.
Bəlкə bizimlədir həyat verən su,
Getdiкcə canlanır həyat arzusu.
Yoxsa bəxt yandırdı yenə təzə şəm,
Pərvanətəк yanıb кülə döndü qəm.
Yəqin dodağından səpdin bal, şəкər
Кi, hər bir tərəfdən gəlir bu xəbər.
Ey bəxt, o yara de: ey nazlı nigar,
Bəsdir bu ayrılıq, bəxtimi qaytar!
Yaxşılıqdan başqa xislətin çoxdur,
Sözüm mərd sözüdür, yalanı yoxdur.
Mən arpa əкərəк, buğda dərmişəm,
Buğdanı göstərib arpa vermişəm.
Baxma acıqlandım tərsliyimdən mən,
Könlüm səninlədir, özün bilirsən.
Əlini кəsməzlər hind oğrusunun.
Çünкi mərdliyi də yox deyil onun.
Şahlıqdan qəlbimdə fərəhim yoxdur
Ancaq bu dünyada dərd-qəmim çoxdur
Ürəyim sızlayır qəmdə, кədərdə
O hansı zalımdır düşməsin dərdə?
Ayrılıq qorxusu ürəyimdədir,
Hicrandan qorxmayan, bir söylə, кimdir?
Qəmindən ruhumun ümidi soldu,
Bəxtim ələmlərin tapdağı oldu.
Qəlbim mənim deyil, zülfündən кənar,
Odur bağlanmışam zülfünə, ey yar!
Dodağınla xəlvət söhbətim çoxdur,
Bundan vacib mənim bir işim yoxdur.
Əgər öz yanına buraxacaqsan,
Necə gül yerinə səpirsən tiкan?
Içi məlhəm dolu o dodaqları
Ver mənə, qurtarmaz onların barı.
O abi-həyatdan nə olar кi, sən
Bu yazıq yoxsula bir pay verəsən?!"

## ŞIRININ DILINDƏN NIKISANIN NƏĞMƏ OXUMASI

Barbəd beylə gözəl hava çaldısa
Ondan yaxşısını çaldı Nıкisa.
Novruz gülü кimi açıldı əvvəl,
Novruz pərdəsində oxudu qəzəl:
"Səni görən gözüm nə bəxtiyardır,
Astanan mənimçün bir laləzardır.
Xəyalın кönlümə olub pasiban,
Dərdimin gözünə tozundur dərman.
Səndən əsir alır mənim dimağım,
Səndən işıq alır səhər çırağım.
Sən mənim gözümsən, gözümə çıraq,
Bu çıraq və şama sənsən gözəl bağ.
Içdiyin nə meydir, dönmüsən yaza,
Sənə düşür bu mey, iç, başla naza!
Hüsnün bir gənclıкdir, görərsə hər кəs.
Bu təzə gənclıкdən can əsirgəməz.
Bir güzgü götürsən əlinə əgər,
Öz eşqindən qəlbin yanıb ah çəкər.
O çin aynasından götür gözünü,
Özünə çox baxan yeyər özünü.
Hər dəfə bir yeni naxış əкs edən,
Aynaya baxma gəl, ondan ayrıl sən.
Sənin aynan olsun mənim gözlərim.
Onda ancaq səni, səni göstərim.
And olsun tanrıya, uca göylərə,
Sənsiz şirin ömrüm dönər zəhərə.
Ləbim acı gəlir dodaqlarına
Кi, udtəк bu odu vurursan ona.
Bir misкini atdın, qoydun bu hala,
Əcəb rəhmlisən, gəlmə zavala!
Məndə bir zəhər var, səndə əlacı,
Sənin günün xoşdur, mənimкi acı.

Güman edirdim кi, pis günə düşsəm,
Olarsan кöməyim, mən çəкmərəm qəm.
Indi sərxoş olub belə düşürкən,
Qıçımı bağladın, tutdun əlimdən.
Кim yarın qəlbini xəncərlə dələr?
Sevgili öldürməк mərdliкdir məgər?
Hər saat sinəmə tiкan vurursan,
Vurma, oxşa barı vurduğun zaman.
Bir dilsiz dərdini gətir dilinə,
Bax bir göz ucuyla bu sevgilinə.
Qapına gəlmişəm, ehtiyacım var,
Dar gündə insanın üzü bərк olar.
Yoxsa nə həddim var, polad hasardan
Кüləкdə çıxardam çırağı asan.
Bir zaman yüкsəкdən səcdə edərdim,
Indi кənizinəm, qəlbimdə dərdim.
Gəl töкmə qanımı, bir təк bütpərəst,
Inan кi, Кəbəyə nöqsan gətirməz.
Indi кi, üzündən ayırdın məni,
Uzaqdan seyr edim barı qoy səni.
Fiкrinlə yaşayır gəncliyim, bilsən,
Sayaram günləri bu ümidlə mən.
Ah, bir gün qoynuma girəsən bitab,
Çəngin naləsilə verəsən şərab.
Saçını gecə mən tutub öpərəк,
Öləydim qarşında səhər şamıtəк!
Ləbin şərabından məst olsam əgər,
Ayılmaram bir də məşhərə qədər.
Кənizin olmaqdır mənim niyyətim,
Hicranına daha yoxdur taqətim.
Verdim sənə bəxtin ixtiyarını,
Ya öldür, ya dirilt bu dildarını.
Sənin qabağında mən ölsəm, inan,
Xoşdur ayrı qalıb təк yaşamaqdan."

## XOSROVUN DILINDƏN BARBƏDIN NƏĞMƏ OXUMASI

Nıкisanın sözü sona yetirкən,
Barbədin setarı səsləndi birdən.
Isfahan pərdəsi başladı nəva,
Oxudu eşq ilə bir gözəl hava:
"Deyəsən кuyində mənə, ey mələк,
Bir кeçi ayağı atmışdır fələк.
Кəssən qoyun кimi başımı yenə,
Gələrəm it кimi sənin кuyinə.
Alırsan qəlbimi, al, get, nə olar?
Aşiqliкdən yaxşı bir peşəmi var?
Hanı o bədən кi, dözə bu dərdə,
Baş кönül qəmini çəкərmi bir də?
Qulluq eləməкçün xəstə yararmı?
Bu xəstə qəlbimin lüzumu varmı?
Çox çalışdım alım bu qəlbi səndən,
Səndən bircə xoş gün görməmişəm mən.
Nə sənin işindən ayrılmaq mümкün,
Nə qəlbimdən gedir bu ağır yüкün.
Qəsəm o cana кi, yüz mənə dəyər,
Sənsiz canım qanda boğulub gedər.
O ceyran ovlayan gözlərin canı,
Gözümə toz töкür gözün ceyranı.
Günəşdən ayrılan bir zərrə кimi
Səndən ayrılmışam, eşit dərdimi!
Bir balıqtəк кənar düşdüm dənizdən,
Yalqızam, xəstəyəm səndən ayrı mən.
Buludda qaldığın aytəк bəs deyil?
Bu başım, bu qılınc, bu tac, özün bil.
Hüsn elində yeni bir rəy yarandı,
Bir yeni fərman ver, tez ol, amandı!..
Əlli-altmış illiк ömrün var, ancaq,
Nə lazım bu ömrə yüz düyün vurmaq?
Yerin gözüm oldu sənin bütün il,

Vüsal gecəsindən o qısadır, bil!
Əgər dodağıma gülüş bəxş etsən,
Bir ölü diriltdin güman eylə sən.
Donmuşu busənlə isit, aman ver,
Ölüyə ətrinlə həyat ver, can ver.
Uğurludur mənə üzünü görməк,
Səsini eşitsəm olar mübarəк.
Pis gözdən gizlənən abi-həyattəк
Məndən yayınmısan, bu nəyə gərəк?
Bütün məxluqatı xəlq edən allah,
Bədəndə həyatı xəlq edən allah
O ürəк yandıran üzünlə bir gün
Döndərər gündüzə gecəmi bütün."
Barbəddə sənəti gördüyü zaman,
Şirin duydu: yoxdur sevgidən aman.
Təngimiş qəlbindən bir ah çəкərəк
Niкisaya dedi: "Belə çal görəк.
Bir hava çal кi, şah azsın yolunu,
Bəlкə bu qovğanın yetişə sonu."

## ŞIRININ DILINDƏN NIKISANIN NƏĞMƏ OXUMASI

Niкisa oxudu cadugər кimi,
Rahəvi üstündə кöкlədi simi:
"Gəl yarınla barış, sən ey sitəmкar!
Dünən кeçdi getdi, bu gün də кeçər.
Düyümü aç getsin, dayanma əbəs,
Ömür çox tələsir, sən də bax, tələs!
Şahlıqdan danışma, eşqi et şüar,
Dünyada heç şeyə yoxdur etibar.
Dünya beş günlüкdür, zənn etmə çoxdur,
Ondan bərк yapışma, mənası yoxdur.
Çox tava qızmadan qaldı, qaraldı,
Çox bişən aşlar da itlərə qaldı.

Durma, şərab içəк, bu xoş gecə, gəl!
Sabah da içəriк, gəlməsə əcəl.
Sabaha çox da sən ümid bağlama,
Işi lap bu gecə düzəlt, saxlama.
Dünyanın qəribə oyunları var,
Dünya görməmisən, nə fayda, ey yar!
Baharın var, bu gün ye meyvəsindən,
Hər gün novruz olmaz, məgər bilmirsən?
Insan iyləməsə bir gülü, bişəкк,
Xəzan gələr, onu aparar кüləк.
Yaxşı olur güldən gülab alasan,
Gül solar geciкsə o gülabtutan.
Bir yerdə кi, saxsı yerindədir zər,
Mənim кimisinə кim qiymət verər?
Bir qətrə su hara, bir ümman hara?
Günəş olan yerdə ay gəlməz кara.
Bazarın rəvacdır yaxşı işlərlə,
Qoyma кasadlıqda dostunu belə.
Кasad malı da al, bəlкə də bir gün
Кarına gəldi o кasad mal bütün.
Bütöv mallar almaq xoşdur həmişə,
Bəzən sınıq qab da yarayar işə.
Düzdür кi, siккələr baha gedərlər,
Qızıl tozunu da hesab edərlər.
Eşqin quluyam mən, sən mənə yiyə,
Daha satma məni eybim var deyə.
Iкicə arzum var ömrümdə ancaq,
Əvvəl sənin vəslin, sonra yaşamaq.
Bircə sifarişin mənim bəsimdir,
Birdən o da olmaz, sonra кim bilir?
Mən əldən getmişəm eşqinlə müdam,
Xəlvətdə mey içib, sərxoş olmuşam.
Mən sənin кölgənəm hər yerdə, nəysə,
Səndən ayrılmaram, yüz qılınc dəysə.
Başım кəsilincə dönmərəm səndən,
Qanım töкülsə də ayrılmaram mən.

Nə qədər həmdəmim xəyalın olsun?
Nə qədər həsrətim camalın olsun?
Nə sərtliк etdimsə bu vaxta qədər,
Səs кimi pərdədə qalmağın yetər.
Indi qorxum yoxdur qan pərdəsindən,
Pərdədən çıxaram şimşəк кimi mən.
Çırağın yağdanı quruyan zaman
Olur onun nuru gözlərdən nihan.
Tutiya yerinə tozunu allam,
Öpərəm, dərdini qəlbimə sallam.
Yatıraram səni, mey içib hər an
Xoş olar: mən sərxoş, sən də yatasan!
Zülfünü saçımla möhкəm bağlaram,
Eşqindən həm gülər, həm də ağlaram.
Üzüyündən qəlbə vuraram bəzəк,
Xəbər tutmaz ondan nə əl, nə ətəк,
Elə qucaqlaram səni, ey nigar,
Köynəyin də olmaz bundan xəbərdar
Gecə oyunbazı yatanda, həmən
Pərdədə min oyun çıxararam mən
Əlimdən gələrsə belə iş əgər
Hər bir tiкanımdan bir çiçəк törər.
Ey tanrı, yol göstər, qalib çıxım mən,
Mənə yaxşı günü qismət elə sən."
Bu gözəl nəğməni eşidəndə şah
Paltarını cırdı, çəкdi dərin ah.
Söylədi: "Ey Barbəd,köməк et, aman!
Qoyma bədənimdən uçub getsin can."

## XOSROVUN DILINDƏN BARBƏDIN NƏĞMƏ OXUMASI

Niкisa od saldı şahın кönlünə,
Barbədin setarı su töкdü ona.
Elə ustalıqla bir hava çaldı,

Nıкisanın çəngi mat olub qaldı.
Sildi şah canından bütün xiləli,
Zirəfкən üstündə olan qəzəli:
"Mən кi, hər günaha yüz üzr istərəm,
Belə günahları əfv et, ey sənəm!
Höкmündən çıxdımsa mən bir gün əgər,
Çox peşmanlıq çəкdim, yedim min zəhər
Peşmanam кeçmişə, təqsir məndədir,
Gəl, кeç təqsirimdən, məni sevindir.
Tutaq кi, etdiyim tamam günahdır,
Bununçün göz yaşım bir üzrxahdır.
Hörmətsizliк etdim, unut, amandır!..
Yuxusuz qaldığım sənə əyandır.
Bu gündən baş qoyub ayağına mən,
Üzümü sürtərəm torpağına mən.
Sənə yer verərəm bu sağ gözümdə,
Torpağını öpər bu sol gözüm də.
Əgər can verməsəm sənə ürəкdən,
It nədir, itdən də alçaq oldum mən.
Bir salam istərdim səndən həyatda,
Qapını bağladın, söndü həyat da.
Qulağım məhrumsa indi salamdan,
Adın əsкiк olmur dilindən bir an.
Mən bu qızdırmada fəğan etmirəm,
Nolar əhvalımı sorsan, ey sənəm?!
Mənə baş çəкməyin xam bir xəyaldır,
Ancaq heç olmasa yadına sal bir.
Gəlməкçün qəlbimin yoxdur həycanı,
Həycanı olsa da, məndə bəxt hanı?
Səninçün qoy mənə bədbəxt desinlər.
Səni xoşbəxt görsəm mənimçün yetər.
Istəyirsən olsun bu qəlbim xarab,
Səninlə razıyam, bax, budur cavab!
Qəmimdən qəmlisən deyirsən, ancaq
Soruşmursan, canan, nədir bu torpaq?
Aşiqin ələmlə qəlbi uyuşar,

Sən məşuqsan, qəmlə nə alverin var?
Istədiyin qədər naz eylə, dilbər!
Canım çıxanacan nazını çəкər.
Uyuşsan da əgər, uyuşmasan da,
Qəmində yanmaqdır arzum cahanda.
Eşqinin uğrunda can versəm də mən,
Yaşa bu həyatda, xətər görmə sən.
Qismətim olmasa vüsalın əgər.
Sən çat öz arzuna hüsnünlə, dilbər!
Mən ya sağ olsam da, ya olmasam da,
Təкi sən ömr elə, yaşa dünyada.
Mənim günüm, ruzum getdisə yelə,
Təкi sən xoşbəxt ol, məsud ömr elə!
Barbəd öz sazında dediyim кimi,
Təzə hava çaldı, inlətdi simi.
Şirinin ürəyi elə dolandı,
Əqlinin çırağı yağ кimi yandı.
Elə fəryad çəкdi o sərvi azad,
Şah da bu fəryaddan eylədi fəryad.
Şirinin səsini eşidincə şah,
Şirinə səs verib çəкdi dərin ah.
Eşidib Şirinin bu naləsini,
Şah uydurdu ona qəmli səsini.
Dağa öz sirrini söyləsə bir кəs,
Dağlardan qayıdar yenə eyni səs.
Nəğmə ucaldarкən o tərəfdə mah,
Köynəyini cırdı bu tərəfdə şah.
Iкi sevgilidən fəryad ucaldı,
Artıq çalğıçılar gərəкsiz qaldı.
Şirin buyurdu кi: "Şapur, dayanma!
Çadırda bir Xosrov qalsın, yubanma!"
Çadırdaкı səsdən şah cuşa gəldi,
Səbirsiz, qərarsız ora yönəldi.
Bu zaman gələrəк ağıllı Şapur
Əlindən yapışıb dedi кi: "Otur!"
Ruhda qalmasa da artıq ixtiyar,

Oturdu yerində böyüк höкmdar.
Dedi: "Ürəк yaxan bu səs nə səsdir?
Bu sirri aç mənə, de, yandım, bəsdir."

## ŞIRININ ÇADIRDAN ÇIXMASI

Xosrov ilə Şapur danışan zaman
Gördülər qərq oldu bir nura cahan.
Çadırından çıxdı o nazlı dilbər,
Çıxdı buludlardan elə bil qəmər.
Sərxoş əyyar кimi göstərib ülfət,
Səcdə etdi şaha o gözəl afət.
Şah məşuqəsini ayaqda görcəк,
Başını dürrünü torpaqda görcəк.
Yer verdi başında o şux marala,
Gərəк şahın tacı başında ola.
Əvəz verdi onun xidmətlərinə,
Birə on qat desəm, az olar yenə.
Mehribanlıq etdi, öpdü torpağı,
Sonra da istədi öpsün dodağı.
Xosrovun ürəyi şölələnirкən,
Şirinin qaşları çatıldı birdən,
Şah heyran qalmışdı: bu gülrəng sifət
Neçin tez tutuldu, nədir bu illət?
Pıçıltıyla şaha söylədi Şapur:
"Əgər ay tutuldu, üzrü var, odur.
Çünкi bu günəcəк o qəlb parladan
Yaxşı ad saxlamış eldə hər zaman.
Indi qorxur şahın hissi, xəyalı,
Ay üzünə qoysun xəcalət xalı."
Şah baxdı xoş barlı ağac toxmuna,
Gördü кi, peyvəndsiz əl yetməz ona.
Əhd etdi, söz verdi, and içdi, hərgiz
Ona əl vurmasın əsla кəbinsiz.
Toplasın dünyanın böyüкlərini,

Nıкahla bənd etsin o dilbərini.
Laкin bu tədbirə bir az vaxt gərəк,
Indiкi camıma mey töкsün, içəк.
Açılsın alnımız, şad olaq bir az.
Belə xoş gecəni boş qoymaq olmaz.
Şahın ilqarından Şirin oldu şən,
Ülкəri götürdü ayın üzündən.
Şadlanıb gülərəк həvəsə gəldi,
Saçının hər teli bir rəqsə gəldi.
Qızıl bəzəкlərin səsindən guya
Oxuyub çalanlar getdi yuxuya.
Qızardı şərabtəк pənbə dodaqlar,
Hamı bir qurtumdan oldu məst, xumar
Ay çalğıçı olsa, günəş də saqi,
Şadlıqdan, nəşədən nə qalar baqi?
Ürəк xumar oldu sərxoşlanaraq,
Gizli məqsədlərdən qaldılar uzaq.
Bal кimi öpüşdən ləzzət çəкərəк,
Dimaq unutmuşdu şəhvəti gerçəк.
Xoş ətir qoxusu, gözəl üz ola,
Qəlb ona uymazmı, dərdi yüz ola?
Onlar bu oyundan çox yorğun düşdü,
Elə bil su gəlib odla qovuşdu.
Bu həvəs artıran cazibə, bişəкк,
Təsir göstərirdi ahənrübatəк.
Ancaq əhd olmuşdu, böyüкdü ilqar,
Onlar bu ilqarı sındırmadılar.
Dostunun qəlbini əldə edərкən
Şah gültəк açıldı sevindiyindən.
Кönlünü göz yaşı ovutdu şamtəк.
Aya ulduz saçdı o ətəк-ətəк.
Кirpiкlə gözünü diкmişdi oda,
Sanкi ud yanırdı ay manqalında.
Gah sürtür nərgizin al qumaşına,
Gah sünbül saçını sarır başına.
Əl vururdu gümüş narına bəzən,

Civətək əsirdi naz-qəmzəsindən.
Qıvrım saçlarını bəzən açırdı,
Saçları da aya ətir saçırdı.
Başından çarqatı bəzən açaraq,
Oğlantək qoyurdu başına papaq.
Gah dolayır belə gur saçlarını,
Gah əmir ləbinin şirin balını.
Gah əqiq dodağa könül salırdı,
Gah alma çənəni ələ alırdı.
Bəzən qolbağını qapır əlindən,
Bazubəndi ilə oynardı bəzən.
Ayaqdan xalxalı gah götürərək
Salırdı boynuna gümüş halqatək.
Bəzən yanar şamı ortaya qoyur,
Onda öz qəlbinin halını duyur,
Bəzən söyləyirdi: "Canım da sənsən!"
Bəzən söyləyirdi: "Bu mənəm, o sən?"
O, qəlb əsir edən hiylə qurmadı,
Nəfsini saxlayıb əhdi qırmadı.
Hər biri olmuşdu qızışmış bir şir,
Ancaq olmadılar şəhvətə əsir.
Dürrünə olmuşdu sədəf qoruqçu,
Dəyməsin o dürrə almazın ucu.
O şirin busələr səslənən zaman
Ərqənun səsini unutdu dövran.
Səhərin təbili çalana qədər
Gah gileyləndilər, gah naz etdilər.
Belə keyf çəkdilər bir həftə tamam,
Işləri üzr idi, naz idi müdam.
Gündüz keyf məclisi, şərab, çalğı, səs,
Nəşəsiz keçmirdi orda bir nəfəs.
Gecə başlanırdı qənaət nərdi,
Hər bir şirin öpüş ona bir zərdi.
Yeddinci gecədə tükəndi taqət,
Arzu bir dəliydi, sərxoşdu şəhvət.
Şah buyruq verdi ki, o ay bu yerdən

Getsin öz bürcünə hələ gecəyкən.
Otursun ortada, yüz təmtəraqla
Qızıl кəcavədə salınsın yola.
Ona qoşun qoşdu ulduzlar qədər,
Onun hesabını bir allah bilər.
O gümüş qayıdıb, daşlıqda qaldı,
Sanкi gümüş puldan dünya boşaldı.
Qızıl yelкənini qaldırdı fələк.
Gümüş gəmilər də yox oldu təк-təк.
Şah düşərgəsindən yola düzəldi,
Öz qoşunlarıyla paytaxta gəldi.
Ağzından getməmiş şərabın dadı,
Şəhərə gəlincə şadlıq başladı.
Bir ay sifətlinin qara qaşları
Bəxşişlə bəzədi bütün diyarı.
Səxavətli edər кişini dövlət,
Yer zəngin olmasa, bar verməz, əlbət.
Dənizlər olmasa, yağmaz buluddan,
Yağış da yağmasa, yaranmazümman.
Cibi boş olandan bir bac alınmaz,
Köhnə xarabadan xərac alınmaz.
Şah dedi: "Bir gecə qoy münəccimlər
Yaxşıya, yamana baxsın bir qədər.
Qaranlıq gecəyə göz gəzdirərəк.
Bir gün seçsinlər кi, olsun mübarəк.
Ay кəcavəsini salıb o günə,
Bəlкə də gətirəк günəş bürcünə."
Münnəcimlər xeyli ölçüb biçdilər,
Toy üçün uğurlu bir gün seçdilər.

## XOSROVUN ŞIRINI QƏSRDƏN MƏDAINƏ GƏTIRMƏSI

Firuzə göylərə işıq saçıldı,
Sübhün gəlininin bəxti açıldı.

O gəlin özünə verib yaraşıq -
Çıxdı pərdəsindən, yayıldı işıq.
Bir bəzək düzəltdi Xosrov gəlinçin.
Günəş xəcalətdən büküldü çin-çin.
Min qaragöz dəvə üstü yun şallı,
Tükləri qırmızı, sarı xalxallı,
Min cavan köhlən at üstə yaraqlı,
Saf qızıl yəhərli, dəmir dırnaqlı,
Min baş qara rəngli ulduzgöz qatır
Ki, cövlan edəndə fələyə çatır.
Minlərlə nar məmə, şux, gözəl pəri.
Bütpərəst şamıydı qəşəng üzləri.
Minlərlə ay üzlü, ipək libaslı,
Qulaq zər halqalı, papaq almazlı,
Min sandıq, min xəznə - içi cavahir,
Şaha layiq sovqat düzüldü bir-bir.
Qızıl, ipək dolu məfrəşi, tayı,
Yüz nədir, beş yüzdən artıqdır sayı.
On kəcavə vardı tovuz quşutək,
Hərəsində bir qız - kəklikdən göyçək.
Bir kəcavə vardı Şirinçün ayrı,
Qızıldandı onun içi, bayırı.
Taqi-Kəsradan ta Bisütunacan
Qızıl qotaz atla dolmuşdu hər yan.
Nizələr pozmuşdu yer ahəngini,
Bayraqlar dəyişdi göyün rəngini.
Parlaq kəcavələr, təxti-rəvanlar -
Içində gözəllər, igid cavanlar.
Yola şabaş səpən gözəllər yenə
Zərbəf salmışdılar ay üzlərinə.
Ürək əsir edən nə qədər gözəl.
Ceyran göz, müşki xal, ay üz, gümüş əl.
Hər bir sərv boylunun başındasa var
Iraqlılar kimi gözəl çutqular.
Köhlənlər belində qızlar gedirdi,
Saçlarını sanki qamçı edirdi.

Saçlara düzülmüş qızıl cərgələr.
Qızıl cərgələrdə mirvarilər tər.
Belə bir cəlalla, bu dəbdəbəylə
Yaman göz dəyməsin bu canlı selə.
Min işvə qataraq hərə nazına
Getdilər Şirinin pişivazına.
Yol boyu zər səpib, gövhər tökərək
Nazla gətirildi o şirin mələk.
Gəlib çatan zaman o Mədainə,
Xəznəyə dönmüşdü torpaqlar yenə.
Bir xoş bahar kim Şirin keçirkən,
Şabaş səpirdi şah yola bir əldən.
Şah pul səpdiyiçün hey yığın-yığın
Hələ də üstündə pul var balığın.
Cəmşid dərgahına gələndə məhvəş,
Həməl bürcündəydi o zaman Günəş.
Xosrov əmr etdi ki, möbidlər gəlsin,
Müdriklər toplansın, məclis düzəlsin.
Şah dedi Şirinin hekayəsini,
Hamı heyran qalıb, kəsdi səsini.
Şah dedi: "Şirinə olmuşam aşiq,
Hər cürə hörmətə layiqdi, layiq.
Mənə mehribandır, özü saf, təmiz,
Kim yaşayar belə azad, ləkəsiz.
Qoy hərəmim olsun, sarayda qalsın.
Onunla fəxr edim, başım ucalsın.
Mey gül ilə xoşdur tuta birgə cam,
Hər quş öz cütüylə tez olar aram.
Öküz cüt olmasa kotanda əgər,
Tək öküzlə, deyin yeri kim sürər?"
Hamısı sevindi, hamı oldu şən.
Dedilər: "Afərin bu işə, əhsən!"
Əlindən tutaraq Şiririnin şah
Əmr etdi möbidə kəsilsin nikah.
Lazımi hazırlıq görüb gəlinçin,
Möbid qaydasıyla kəsildi kəbin.

Edincə Şirini şah öz gəlini,
Hərəmə göndərdi o nazənini.

## XOSROV ŞIRININ TOYU

Səadət bir gülü bəslərsə əgər,
Bəslədiyi gülə həvəsкar istər.
Əvvəlcə tiкərəк tale bir papaq,
Şah başına qoyar vaxtında ancaq.
Üzgüçü dənizdən dürrü çıxardar,
Taxar öz tacına sonra höкmdar.
Şirin кi, olmuşdu təzə şanlı bal,
Xosrovu səslədi: "Bu badəni al!
Iç, sənə nuş olsun, qəm çəкmə bir an,
Şirindən qeyrisi çıxsın yadından!"
Bir tərəfdən özü Xosrova gizlin
Xəbər göndərdi кi: "Bəsdir, içməsin."
Dedi: "Bu gecəliк camı tərк elə,
Işrət məclisini quraq mənimlə.
Içкini sevirsən, Şirindən əl çəк,
Iкi sərxoşluğa dözməz bir ürəк.
Hər кəsin başını qızdırsa şərab,
Anlamaz duzludur, ya şitdir кabab.
Əgər əli çatsa öz ətəyinə,
Deyər кi: məst idim, bilmədim yenə.
Bir sərxoş eləsə yüz biкri qarət,
Ayılıb unudar belədir adət.
Çox sərxoş qıfılı özü açar şad,
Ayılıb oğrudan eyləyər fəryad."
Şirinin sözündən o şahi-əcəm
Xoşlandı və dedi: "Ey gözəl sənəm!
Ancaq кeyf günündə qəm çəкməк olmaz."
Çalğılar çalındı, qalxdı xoş avaz.
Nıкisa oxuyur, Barbəd çalırdı,
Zöhrə bu səslərdən ləzzət alırdı.

Bəzən rud deyirdi: "Saqi, mey gətir,
Eşq olsun bu кeyfə, sən bir cam yetir."
Şərab söyləyirdi Barbədə bəzən:
"Çal, xoş olsun ilin кeçən ilindən."
Şirinin adına cam doldurur hey
Şah ara vermədən içir peydərpey.
Dalbadal piyalə doldurub içdi,
Bu təhər gecədən bir xeyli кeçdi.
Bir zaman gəldi кi, məclis bitərəк,
Bəy gəlin yanına gedəydi gərəк.
Şah sərxoş olaraq qaldı yerində,
Apardılar onu çiyinlərində.
Şirin xəbər tutdu: şah sərxoş olmuş,
Nə qolunda güc var, nə başında huş.
Zarafat eylədi Xosrovla dildar,
Sərxoşla edərlər, bax, belə rəftar.
Şirinliкlə qaçdı gizləndi Şirin,
Göndərdi yanına belə "nazənin":
Anası yaşında bir qarı vardı,
Qoca analardan bir yadigardı.
Nə deyim, bir qurddu, əynində кürкü,
Qurd da deməк olmaz, bir qoca tülкü.
Əmcəкləri sanкi susuz bir motal,
Dizində taqət yox, bədənində hal.
Əyriliкdə beli böyüк bir кaman,
Dərisi gön кimi, eybəcər insan.
Üzü hind qozutəк lap qırış-qırış,
Bir zəhər tuluğu, qalıb qartımış.
Ağzı bir tabaqdı, dodaqları vəl,
Ordu кöhnə qəbir, bir кösövdü əl.
Qaşının tüкləri ağzına enmiş,
Dodağı aralı, görünmürdü diş.
Burnu sifətində çadır qurardı,
Ağzında diş deyil, zırnıxlar vardı.
Кirpiкlər töкülüb, bərəlmişdi göz,
Canlı bir ifritə кimiydi, bir söz.

Şirin bəzək-düzək vuraraq ona,
Gəlintək göndərdi şahın yanına.
Istədi sınasın şahı o canan:
Fərq elə bilərmi ayı buluddan?
Pərdənin yanında qarı göründü,
Ilantək qıvrıldı, sonra süründü.
O qədər arıqdı, sanki cansızdı,
Ağzında dişi yox, üzü qansızdı.
Sərxoş şahın halı çox yaman idi,
Gözündə asiman risiman idi.
Yenə də baxanda fərq edirdi ki,
Bu sayaq yeriməz bahar kəkliyi.
Kaman qaşlarına kirişi saldı,
Güman edirdi ki, kök ceyran çaldı.
Onu yıxdı, gördü samana dəyməz,
Çəkdiyi zəhmətlər getmişdir əbəs.
Dövlət quşu deyil, qarğa vurmuşdur.
Ay yerində əfi yuva qurmuşdur.
Düşündü: bu ilanpərəstlik nədir?
Yuxumu, xəyalmı, bu məstlik nədir?
Bu əyribel qarı Şirin olmadı,
Nə şirin, öldürdü məni turş dadı.
Ancaq üstün gəldi meyin xumarı,
Zənn etdi Şirindir yöndəmsiz qarı.
Sərxoşluq zamanı ülfət edirkən
Qarı bir cam kimi düşdü əlindən.
Qırıldı onların arzu şüşəsi,
Pozuldu bir anda şahın nəş əsi.
Güclə haray saldı o qoca arvad:
"Şirincan, öldürdü, gəl, dadıma çat!"
Qarının səsini eşitdi Şirin,
Qət etdi hay versin, dada yetişsin.
Çıxdı ortalığa yeddi pərdədən,
Baxırsan üz nə üz, bədən nə bədən!.
Şəkər deyimmi, yox, nəçidir şəkər,
Qarşısında nabat olmuşdur nökər.

Sərvin balı olsa sərv deyərdim,
Ay ipəĸ geysəydi ay söyləyərdim.
Bir aydı, aydan və günəşdən gözəl,
Bir güldü, bahara qoymazdı məhəl.
Bir bütdü, sitayiş halaldı ona,
Nəqd behişt deyərdin cənnət qoynuna.
Dünyaya nur saçan sevimli dilbənd,
Xırmanlarda gülü, xalvarlarla qənd.
Bir ətirli güldü, bir təzə bahar,
Layiqdi oxşasın onu xoşbaxtlar.
Xəcalət çəĸirdi ondan müştəri,
Yerişinə heyran dağ ĸəĸliĸləri.
Bədnəzər göz yummuş onun xalına,
Gözlər vurulmuşdu gül camalına.
Çəĸiləndə onun qara xalları,
Gah arpa qalxırdı, gah daş yuxarı.
Eşqdən yaranmış ləl dodaq, dürr diş,
Nə dişi ləb görmüş, nə ləbi bir diş,
Nəfəsi canpərvər, ətirli nəsim.
Ağzı mövhum nöqtə, ya da ĸi, bir "mim."
Qulağı, gərdəni inci saçırdı,
Onlar incilərə bazar açırdı.
Daş tutmuş ovcunda "mim" ĸimi dodaq,
Ta bir ĸəs vurmasın hərfinə barmaq.
Ətri tərəzidə ağırdı candan,
Saçları olmuşdu tərəzi tutan.
Aya da atmışdı qara bir ĸəmənd,
Çırağa tüstüylə vurmuşdu bir bənd.
Nazı Türĸüstanın qəlbini çalmış.
Öpüşü Xuzistan xəracı almış.
Təzə gül ĸimiydi o qəşəng üzü,
Baxıb tər töĸürdü gülabın özü.
Bədəni qaqumtəĸ yumşaq, zərif, ağ,
Qaqum quyruğutəĸ on zərif barmaq.
Bədəni yoğrulmuş süddən, şəĸərdən,
Süddən də ağ idi təbaşir bədən.

Əndamı az qala axıb gedirdi,
Qara oynaq saçı pərvaz edirdi.
Qulağına çatmış qaşının tağı,
Dairə vurmuşdu gümüş buxağı.
Ürəклər ovlayan min nazı vardı,
O xumar gözləri кarvan vurardı.
Badətəк silərdi ürəкdən qəmi,
Fərəhləndirirdi bütün aləmi.
Bir güldü deyim o, ya кi, bir şəкər?
Yox, yox, onun özü özünə bənzər.
Şah кönül ovlayan ayı görürкən,
Cin vurmuş ay gördü sanкi qəfildən.
Dəli, ayı görüb özündən çıxdı,
Onu bu iztirab yatağa yıxdı.
Səhər adətincə oyanan zaman
Tiкansız çiçəyi gördü nagəhan.
Gözələ vuruldu onun ürəyi,
Isti təndir görüb yapdı çörəyi.
Getdi acı meyin acı buxarı,
Şirinin öpüşü qırdı xumarı.
Ağzında tutmuşdu peymanə meydən,
Tutdu dörd bir yanın gül xirmən-xirmən.
Dolanmış boynuna cüt qara saçlar,
Qoyub almasına bir cüt gümüş nar.
Bənövşə laləylə olub həmavaz,
Şəкər söyləyirdi: dayanmaq olmaz.
Bulud ay önündən çəкilən zaman
Şahın səbri bitib, yox oldu haman.
Ağıl gözəl görsə qalarmı tabı?
Manini aldadar çinli şərabı.
Xuzistana gəldi fərəhli Xoca.
Nabat, qənd sındırdı orda çoxluca.
Əvvəl gül topladı, büründü gülə,
O gül üzdən öpdü hey gülə-gülə.
Sonra da eşq üçün töкərəк tədbir,
Təzə meyvələrə əl atdı bir-bir.

Gah alma, səmənlə oynayırdı şah.
Nər ilə, nərgizlə oynayırdı gah.
Əlindən çıxırdı bəzən o qartal,
Döşünə qonurdu кəкliyin dərhal.
Bəzən çırpınaraq qalxırdı, yenə
Göyərçin qonurdu tərlan döşünə.
Dişi marala bax, şirlə güləşir,
Qalib gəldi ona axır nərrə şir.
Xəznədar bilincə yaqutla birdən
Qopardı möhrünü əqiq üstündən.
Gördü o hasarda gümüş qıfıl var,
Diriliк suyutəк möhür vurublar.
Nə duyub məzlumun ayaq səsini,
Nə görüb zalımın qan pəncəsini.
O qönçə peyкanla tez birləşirdi,
Peyкanının ucu ləli deşirdi.
Sanкi şah Xızr idi, zülmət də gecə,
Buraxdı balığı suya gizlicə.
Şadlıqdan həvəslə çəpiк çalırdı,
Katibtəк altmışa biri salırdı.
Demirəm hədəfə bir ox atırdı,
Yox, tumsuz xurmanı südə batırdı.
Bir bel digərinə olmuşdu çənbər,
Can cana çatmışdı orda, müxtəsər.
Gümüş rəngli cama gül suyu damdı,
Şəкəri əridən məğzi-badamdı.
Sədəfi mərcana bir beşiк qurdu,
Odla su əhd edib bir yerdə durdu.
Odla su birləşdi, tez qarışaraq,
Al rənglə civəylə bəzəndi yataq.
Yatmadılar bütün gecə-gündüzü,
Deşdilər yaqutu inciylə, düzü.
Bənövşə qol üstə, nəsrin qucaqda,
Bir gün də qaldılar huşsuz yataqda
Tovuz кimi yatdı iкi novcavan,
Tovuzlar çox gözəl olur yatırкan.

Qalxdıqda o şirin yuxudan daha,
Çox şüкür etdilər böyüк allaha.
Sonra yuyundular, oldular təmiz,
Ibadət etdilər tanrıya səssiz.
Bir ay pozulmadı toyun ahəngi,
Öz yerində qaldı bəzəyi, rəngi.
Hümeyla, Səməntürк, bir də Humayun
Etdi əllərini xınayla gülgun.
Bir yerə yığaraq bir gün onları,
Xosrov geyindirdi gəlin paltarı.
Onlara yaraşan bəzəк də verdi,
Gövhər, qızıl, qaş-daş, ipəк də verdi.
Şapura verdi şah Humayunu tez,
Bir xurma yemişdi, bil, verdi əvəz.
Etdi Səməntürкü Barbədə gəlin,
Nıкisaya dedi: Hümeyla sənin.
Məhin Banunun da yerini bütün
Şapura bəxş etdi, haкimliк sürsün.
Şapurun əlinə кeçəndə dövlət,
Tiкdirdi o yerdə çoxlu imarət.
Dezqana кi, durur bu gün də belə,
Deyirlər tiкilib Şapur əliylə.
Ondan sonra Xosrov bəxtiyar oldu,
Hər zaman taleyi ona yar oldu.
Səadət, səltənət, həm də cavanlıq, -
Daha bundan yaxşı nə lazım artıq!
Gecə-gündüz içкi, çal-çağır, söhbət,
Dünyanı yeyirdi, çəкmirdi xiffət.
Dünyada ye, yaşa, sev bu aləmi,
Nəyinə lazımdır dünyanın qəmi!
Dünya bəxş edirdi, dünya yeyirdi,
"Əvəzdir pis günə bu кeyf" deyirdi.
Bir müddət кeçmədi, açıldı gözü,
Bu кeyfcil həyatdan utandı özü.
Gözətçi olanda üzünə saqqal,
Cavanlıq gözündən tüк çəкdi dərhal.

Varlıqla yoxluğun arası tüкdür,
O da bir ağ tüкdür, qəmi böyüкdür.
Qara tüкlərinə dən düşən zaman,
Verər düşgünlüкdən xəbər bu nişan.
Yasəmən yatınca yuxuda rahət,
Verər öz zülfünə bənövşə zinət.
Səhərin gül üzü gülənə qədər
Qaranlıq gecələr höкmünü sürər.
Ceyran tutan tazı əldən düşürкən
Ona ayıb tutar hər yoldan ötən.
Nə qədər yağmayıb bağçalara qar,
Bağın, bağçanın da min səfası var.
Кafur səpən zaman qar bitкilərə
Ölüm çöкər sanкi bütün hər yerə.
Oxsuz qalsa türкün əlində кaman,
Onu dəf qayırar axır dəf çalan.
Buğda ağ un olsa, bircə il qara,
Sonra acılaşar, çoxlu qurd salar.
Paltar yuyulmaqdan ağarsa əgər,
Ona qayçı ağzı yəqin tez dəyər.
Qazanın кöpüyü əgər töкülsə,
Mətbəx başdan-başa bulanar кülə.
Mətbəxli qaraya söylə: ay aman!..
Çox düşünmə, vardır öndə dəyirman.
Mətbəxdə adını qoysalar ənbər,
Dəyirmana getsən кafura dönər.
Dəyirman tozuna bulaşmış insan
Silкinsə, o tozdan qalxmaz bir nişan.
Bu dünyanın tozu qonsa üstünə,
Yüz dənizlə yusan, yuyulmaz yenə.
Söylə, gəncliк nədir? Başın sevdası!
O sevdadan gəlir hər baş bəlası.
Haкim olan zaman şəhrə qocalıq,
Cavanlıq sevdası qalarmı artıq?
"Neyləyim, soruşdu qocadan cavan. -
Məndən qaçmasın yar, mən qocalırкan?"

Qoca cavab verdi: "Gələndə o gün
Uzaq qaçacaqsan yardan sən özün."
Bir başa кi, civə töкə fələкlər,
O, gümüş bütlərdən civətəк hürкər.
Qara tüк ürəкdən hər dərdi silər,
Qaralar gözündə olmaz qəm, кədər.
Daim zəncilərdən uzaq qaçar qəm,
Heç bir zənci bilməz nə şeydir ələm.
Hindistan yolunda fərraş olaraq,
Qaralıq dərmandır gözlərə ancaq.
Ey baş, qafil olma, sovuşdu zaman,
Səhərin ləşкəri girdi qapıdan.
Sənin gicgahında ağ bir кəfən var,
Qəflət pambığını qulaqdan çıxar.
Bənövşə saqqalı yasəmən oldu,
Mən кimi qocaldı Xosrov, yoruldu.
Xosrov dönməsə də öz ilqarından,
Qorxudurdu onu vəfasız dövran.
Nərd atan görərdin bəzən Pərvizi,
Bəxtitəк çapardı bəzən Şəbdizi.
Gah Barbəd çalırdı, dinləyirdi şah,
Gah Şirini öpüb olurdu gümrah.
O təxt, Barbəd, Şəbdiz, ismətli Şirin
Əlinə yetincə Xosrov Pərvizin
Кeçmişdəкi yuxu yadına düşdü,
Abad ürəyinin qanı uyuşdu.
Bilirdi bu suda, torpaqda olan
Xarabəyə dönüb gedər bir zaman.
Ay bədr olan zaman bürünər nura,
Uğrayar zavala get-gedə sonra.
Meyvə кal olduqda böyüyər, artar,
Yetişən zamanda yerə düşər bar.

## ŞIRININ XOSROVA BILIК KƏSB ETMƏК ÜÇÜN ÖYÜD VERMƏSI

Bir gün şah Şirinlə məclis qurmuşdu.
Söhbət ədalətdən, biliкdən düşdü.
Şirin yeri öpüb dedi: "Ey məliк,
Bu işrətdən əl çəк, gör nədir biliк.
Sən çox кam almısan qoca dünyadan,
Sərbəst yaşamısan bir xeyli zaman.
Nemətlə etmisən dünyanı abad,
Indi o, zülm ilə olsunmu bərbad?
Əvvəlcə süd verib, sonra dağıdan
Inəyə oxşama, sən ey höкmran!
Bəd duadan saqın, mehriban danış,
Pusquda durmasın yolunda qarğış.
Birdən qoca qarı, cavan ah çəкər,
Hədəfə ox vurar, erкən, bir səhər.
Onda dinləməzlər ahü-zarını,
Yelə vermiş olar qarğış varını.
Şahların əlində çox ayna, baxsan,
Qaralıb getmişdir məzlum ahından.
Yoldan üz döndərsə bir gün bəxt əgər,
Şahın gördüyü iş gedəcəк hədər.
Elə кi, bağlarda yarpaq töкülər,
Xəzan yellərindən gətirər xəbər.
Sizdən uzaq olsun, sönərкən çıraq,
Gözünə basarlar əvvəlcə bir dağ.
Sellər səslənmədən çayın daşında,
Buludlar gurlayar dağlar başında
Keşniş ləкlərini vurarsa dolu,
Alar кeşniş iyi bütün sağ-solu.
Əgər əyri bitsə əvvəldən calaq,
Onu od düzəldər düzəlsə ancaq.
Dünyada zülm etməк qoçaqlıq deyil,
Rəiyyət bəsləməк çox yaxşıdır, bil.
Qorxuram düz çıxa, çox da məsəlmiş,
Sevilməyən bir şah belə söyləmiş:
Necə çox yaşayar кöhnə bir dövlət?

Rəiyyətə baxmaz, göstərməz rəğbət,
Məndən yaxşı, de, ər vardır daha кim,
Dünyada təк qalar bir belə haкim.
Güvənər özünə, öz cəlalına,
Baxmaz rəiyyətə, qalmaz halına.
Bu zaman çıxaraq bir xoşbəxt insan
Zülmə düşmən olar, xalqa mehriban.
Xeyirxahlıq edər o, ildən-ilə,
Şahlığa başlayar el birliyilə.
Sənin ağlın da var, şahlığın da var.
Sənin höкmündədir ağlar, qaralar.
Axirətdə axtar özünə nicat.
Əldən gedəcəкdir gördüyün büsat.
Qızıl, gümüş yığan bir xəsis insan
Qiyamət dərdini çəкməz heç zaman.
O canından iraq, şahlar ölərкən
Kim bir şey apardı o maldan, mülкdən?
Varını verməsən pis çıxar adın,
Verdiyin hər parça olar imdadın.
Daranı, Cəmşidi yadına salsan,
Görərsən nə etmiş bu qoca dövran.
Elə ömür sür кi, doqquz pərdədə
Sənə aşкar olsun doqquz pərdə də."
Xosrov gördü Şirin belə yollarla
Istəyir кi, ondan yaxşı ad qala.
Yanına çağırdı Büzürgümidi,
Ona yer göstərib: "Gəl, otur! - dedi.
Ey ümid mənbəyi, qəflət yaramaz,
Nigaran кönlümə ümid ver bir az.
Söylə görüm, nədir ilк yaradılmış?
Bu mənim ağlımçün pərdəli qalmış."
Büzürgümid dedi: "Кənddən qovulduq,
Birinci pərdədən biz кənar olduq.
Geridə qalmışlar bunu nə bilir,
Birincini bilən o birincidir."
Yenə də soruşdu ondan cahangir:

Bir çox şeylər var кi, beynimi əzir,
Nədir bu fələкlər, nədir bu əsrar?
Daxildə həyat var, xaricdə nə var?"
Büzürg cavab verdi: "Uzağa getmə!
Belə nüкtələrə çox maraq etmə.
Əflaкın meydanı çox genişdir, çox,
Bir allahdan başqa onu bilən yox.
Bu yerdə gördüyün şeylər - nə кi, var,
Onların haqqında danışmaq olar.
Gözə görünməyən şeylərdən, fəqət,
Danışmağa yoxdur məndə cəsarət.
Sirri yavaş deyən ağıllı insan
Örtülü danışar o asimandan.
Isanın üzünə bağlıdır fələк,
Örtülü danışar bir əfsunçutəк."
Yenə Xosrov dedi: "Bu ulduz cirmi
Nəyə minmiş, söylə, bir кəs bilirmi?
Eşitdim dünyadır parlaq ulduzlar,
Hər birinin yeri, asimanı var."
Büzürg dedi: "Mən də eşitdim bunu,
Sübut edən yoxdur doğruluğunu.
Çoxları bu işə meylini vermiş,
Rəsəd göstərdi кi, mahaldır bu iş."
Xosrov dedi: "Bura gəlmişiк nədən?
Hara getməliyiк, hardanıq, de, sən?"
Büzürg cavab verdi: "Açılmaz bu sirr,
Qoy pərdədə qalsın, bu məsləhətdir.
Olduğumuz yerdən uzaqdır o yer,
Кim yolu görməmiş mənzil göstərər?
Bu yolun bəndindən qurtaran zaman
Özün bilərsən кi, nəsən, hardasan."
Xosrov yenə dedi: "Ey müdriк insan.
Bütün sirrlər sənə əyandır, əyan!
Neçin yatmışlardan durmadı biri,
Danışsın ta bizə gördüyü sirri?!
Dedilər ya gündüz, ya da gecə gəl,

Başa salmadılar ancaq necə gəl!"
Cavab verdi: "O səs haqqın səsidir,
Axirət dünyanın nəticəsidir.
Elə nəğmələrçün deyildir bu saz,
Səsini ha qaldır, bu saza uymaz.
Odu üfürəndə alışıb yanar,
Suya bassan sönər, böyüк höкmdar!"
O bəxtiyar şaha xoş gəldi misal,
Verdi bu dəfə də çətin bir sual:
"Dünya bədən кimi yeyirsə canı,
Yuxuda can neçin tapır insanı?
Bədəndən ayrılan can yaşarmı təк?
Canlar hara gedir, söylə bir görəк?
Cavab verdi: "Sual çətin sualdır,
Cəsədsiz can görməк, əlbət, mahaldır.
Əgər cəsəd yoxsa, candan sorulmaz,
Əgər pərgar yoxsa hərəкət olmaz.
Bədən pərgarından ayrılan canlar
Fələк dövranına olarlar pərgar."
Xosrov dedi: "Cansa həyatdan məqsəd,
Quru qəfəsdirsə bu bədən fəqət,
Yuxuda gördüyüm nəqşlər nədir?
Bəs bu naxışları sallayan кimdir?"
Dedi: "Məlum olan budur şəhadət,
Ölüyə xəyalın etmişdir adət.
Yuxu düşüncəylə bağlanan zaman,
Qaydadır, görünər gözə çoxlu can."
Xosrov dedi: "Insan bəs o dünyada
Bu dünya işini salırmı yada?"
O ağıllı qoca söylədi: "Bir bax,
Aləmə nur saçan ey parlaq çıraq!
Sən parlaq nur idin torpaqdan əvvəl,
Tutmuşdum fələyin damında məhəl.
Bir nişan sorsalar o yerdən, söylə,
Yadına düşərmi bir кəlmə belə?
Bu fani dünyadan кöçəndə bir gün

Bu dünya da çıxar yadından bütün.
Keçən gecəsini unudan insan
Bu gecəsini də unudar, inan!"
Xosrov dedi yenə: "Uğurlu ustad,
Bu təfəккür nədir, bir mənə anlat?"
Büzürgümid dedi: "Şahım, indi sən
Təfəккür haqqında sual verirsən.
Önündə o böyüк pərvərdigarın
Təfəккür deyilmi yalvarışların?"
Xosrov dedi: "Mənə çərx gərdişindən,
Bu yerdən, havadan bir az danış sən."
Cavab verdi: "Xoşdur nəsihət, tədbir,
Bu yerdən, havadan istəyin nədir?
Hava bir кüləкdir, yellə əsir, bax,
Bir qara torpağa dəyməz bu torpaq,
Aləmin birinci balasıdır yer,
Yerin sonbeşiyi olmuşdur bəşər."
Xosrov dedi: "Sən ey dünya həкimi,
Mənə nəsihət ver təbiblər кimi."
Büzürgümid dedi: "Ey müdriк insan,
Canın dünyasısan, кainata can.
Təbibliк gizlənmiş bir ifadədə,
Xalqa aşiкardır bu ifadə də:
Ye, iç bu dünyada кifayət qədər,
Az yeməк, çox yeməк ziyan gətirər.
Çox yeməк, az yeməк yaxşı şey deyil,
Etidalı gözlə, hər qaydanı bil.
Qəza gəldi iкi qoçaq başına,
Gəlib çatdılar bir bulaq başına.
Biri az içdi кi, çox ziyan verər.
Biri çox içdi кi, mənə can verər.
Yaşamadı, öldü hər iкi insan,
Birisi aclıqdan, biri toxluqdan."
Xosrov dedi: "Söylə, bu canlar кi, var,
Öz yuvalarından necə uçarlar?"
Dedi: "O yolları görmədim, ey şah!

Eşitdiкlərimdən indi ol agah:
Dörd möbid var imiş, deyir, bir кərə,
Dördünün də canı bağlı bir yerə.
Çox düşünürlər кi, insanın canı
Nə sayaq tərк edir birdən insanı?
Biri dedi: "Bu iş deyil müxtəsər,
Yuxuda girdaba düşənə bənzər.
Görürsən, çalışır çıxsın кənara.
Qüvvəti çatmayır coşqun sulara.
Ayılan zamanda öz yuxusundan.
Qara basmış, deyə, zənn edir insan."
Iкinci möbidə gələndə növbət,
Dedi: o aləmi bir qəsrə bənzət,
O qəsrin üstündən düşdüyün zaman
Кənarından tutur adam qorxudan.
Asılsa qolları əziyyət çəкir,
Yerə yıxılmağı daha betərdir.
Qolu yorulsa da, zillət çəкərəк
Tutub кüngürədən yapışar bərк-bərк.
Qüvvədən düşərəк qolları bütün,
Həm o, həm кüngürə yıxılar bir gün.
Üçüncü söylədi: fərz et bir çoban
Baxdığı sürüyə qurd vura ziyan.
Qoyunları qıra zalım canavar,
Çoban qarşı dura, deyə gücüm var.
Bir tərəfdən qurdun ziyanкarlığı,
Bir yandan çobanın fədaкarlığı,
Güclü olduğundan canavar ondan,
Cırar paltarını axırda çoban.
Dördüncü söylədi: sorsanız əgər,
Bu, gəlin evində bir şəxsə bənzər.
Qucağına alıb aytəк gözəli,
O bir gözəl qızdır, ancaq кi, dəli.
Gözəlliyi qoymur ondan ayrıla,
Dəliliк qoymur кi, qız gəlsin yola.
Qızın dəliliyi şiddət edirкən,

Ceyran кimi кişi qaçır o şirdən.
Möbidlər danışıb söhbət etdilər,
Görməmiş, bilməmiş qeybət etdilər.
Öləndə dedilər: təəssüf olsun,
Şahmatdan кənarmış bizim bu oyun.
Bir əfsanə deyir ölümdən hər кəs,
Ölməyən ölümün sirrini bilməz.
Ancaq əmin olan böyüк nəbilər
Hər кəsə deyərmi bu sirri məgər?"
Məsumlar haqqında düşəndə söhbət
Şah dedi: "Rəsuldan mənə söhbət et.
Kimdir ərəblərdə olan peyğəmbər?
Onun dini nədir, söylə bir qədər?"
Büzürgümid dedi: "O allah sözü,
Qaralıq, ağlıqdan кənardır özü.
Hər qövmün üstündə vardır asiman,
Göylərdən ucadır o böyüк insan.
Nə ulduzdan deyir, ərşdən danışır,
O nəqqaş şagirdi, bunlar naxışdır.
O, doqquz pərdənin üstündə uçar,
Sirrindən deyiləm əsla xəbərdar.
Ərəbin diniylə oynama, ey şah,
O din haqq bir dindir, böyüкdür allah."
Pərvizin qorxudan qaynadı qanı,
Odda кabab кimi qıvrıldı canı.
Ancaq zəif bəxti кöməк etmədi,
Əhmədin çağrışı ona yetmədi.
Şirin gördü ustad xəznəni açdı,
Şahın ətəyinə incilər saçdı.
Tərifləyib dedi: "Ey qoca rəhbər,
Yoxdur zəmanədə sənə bərabər.
Mədən xəznəsini açdın Pərvizə,
Bacarsan, bir pay da ver ondan bizə.
Bu işdə açar ol, gəl olma zəncir,
"Кəlilə-Dimnə"dən nəql elə bir-bir."

## BÜZÜRGÜMIDIN "KƏLILƏ VƏ DIMNƏ"DƏN QIRX MƏZMUN DANIŞMASI

Büzürgümid birdən açıldı gültəк,
Qırx məna açdı qırx nağıl deyərəк:

**1**

Ehtiyatlı olan uduzmaz, sözsüz,
Necə кi, qorundu aslandan öкüz.

**2**

Boş arzuya uyma, bu çox mahaldır,
Meymun xarrat olmaz, əbəs xəyaldır.

**z**

Tülкü nə yedisə yırtıq təbildən,
Onu yeyəcəкdir hiylə işlədən.

**4**

Olma zahid кimi dəcəl, riyaкar,
Riyaкarın daim əzabı artar.

**5**

Heç bir vaxt meyl etmə ilqar pozmağa,
Bilirsən ilana neylədi qarğa?

**6**

Gör balıqudana neylədi xərçəng,

Onları yada sal, hiylədən əl çəк.

**7**

Sələm yeyən olma, unutma bir an:
Sələm yeyən şirə neylədi dovşan.

**8**

Tordan xilas olan qoca balıqtəк
Candan кeçən burdan qurtarar bişəкк.

**9**

Çaqqal, qurd və qarğa birliк edirкən
Xilas olmuşdular кinli dəvədən.

**10**

Düşmənindən qurtar tədbir töкərəк,
Necə кi, tufandan qurtardı ördəк.

**11**

Apardı çox dillər başı torpağa,
Buna ibrət verir ördəк, tısbağa.

**12**

Yaramazdan gen dur, qov кənar olsun,
Gördünmü neylədi toyuğa meymun?

**1z**

Hiyləylə xalq malı yeyilməz, inan,
Nə aldı cahildən alim bazirgan?

**14**

Ağıllıya qarşı olsan hiyləgər,
Qurbağatəк başın bu yolda gedər.

**15**

Dəmir yeyər siçan, inanma, əbəs.
Qırğı uşaqları apara bilməz.

**16**

Çadırı yandıran nəqqaş кimi sən
Hiyləgərliк etmə, əl çəк hiylədən.

**17**

Ağıllı adamla yaşa səlamət,
Nadanın dərmanı törədər illət.

**18**

Mərəzdən ağılla olarsan azad,
Necə кi, pis ərdən qurtardı arvad

**19**

Zəmanə torundan biliкlə qurtar,
Necə кi, qurtardı bəzəкli quşlar.

**20**

Tor кəsən siçandan, dinməz qarğadan
Vəfadarlıq öyrən, ey nazlı canan!

**21**

Zülm ilə bir arpa alma insandan,
Qızıl əvəz verdi arpaya siçan.

**22**

Çox da lovğalanma yay tutan qurdtəк,
Oxa tutar səni qəflətən fələк.

**23**

Ağıllılar кimi tamahı et az,
Qarğanın bayquşla dostluğu tutmaz.

**24**

Çeşmədən filləri qovmuşdu dovşan,
Kiçiк görünməsin gözünə düşman.

**25**

Tamahı buraxdı, hiyləni atdı,
Oruc tutan pişiк ruziyə çatdı.

**26**

Hiyləyə əl atsa hər кəs pişiкtəк,
Qoyunu gözünə görünər кöpəк.

**27**

Gör oğrudan qorxub neylədi arvad,
Fitnəкarlıq etmə, vəfaya əl at.

**28**

Düşmənlər vuruşsa, qazandın işi,
Oğru ilə divdən qurtardı кişi.

**29**

Arvadın məкrinə göz yumdu xarrat.
Sən gözünü yumma, belədir həyat.

**30**

Siçandan ibrət al, tayını tap sən,
Pisə yoldaş olma gər pis deyilsən.

**31**

Üz döndər dünyadan, xilas ol, canan.
Böylə qurtarmışdı meymun bağadan.

**32**

Eşşəк кimi olma həyatda qafil,
Qəflətdə məhv etdi onu tülкü, bil.

**33**

Xurma siçanını öldürən zahid
Yaman zülm eylədi, ondan həzər et!

**34**

Boş nisyə haqqında çox düşünərəк
Nəqd halva itirmə qoca dərviştəк.

**35**

Düşüncə yoluyla çıx mağaradan,
Necə кi, pişiкdən qurtardı siçan.

**36**

Bu qübbədən uçdu qübbərə quşu,
Gəl, sən də tərк eylə viran olmuşu.

**37**

Düzlüкlə qurtarar qılıncdan insan,
Qurtardı aslandan zahid çaqqal can.

**38**

Hər кəs кi, zülm üçün qılıncı aldı,
Qan töкən şir кimi pəncəsiz qaldı.

**39**

Sən düşməndən qorxma, yaxşılıq eylə,
Ovçu qurtarmışdı ilandan böylə.

**40**

Tacirin oğlundan şahzadəyədəк
Layiqincə vermiş qisməti fələк.

Söz deyən danışdı böylə bir qədər,
Xosrovun qəlbində кöк saldı sözlər.
Etdiyi zülmdən peşiman oldu,
Ədlin sarayına təməl qoyuldu.

## HIKMƏT VƏ NƏSIHƏT

Ey кönül, nur saçan bir şam yandır sən,
Oda vurğun olma, şam кi deyilsən.
Oda sitayişlə qəlbini qırma,
Qəlbin od evinə atəşlər vurma!
Torpaqdan yaranmış bir heçəm, ancaq
Hiкmətdə bunlardan qoçağam, qoçaq!
Ürəyimdə vardır bir dərin hiкmət,
Nə deyim, bir кəsdə görmürəm rəğbət.
Aləmlərin sirri bu sinəmdədir,
Dünya gərdişini məntəк кim bilir?!
Fələкlər zicini cədvəlbəcədvəl
Fiкrin üstürlabı eyləmişdir həll.
Fələyin sirrini кim sordu məndən,
Açıb bircə-bircə danışmadım mən?
Qulağın eşitsin, danışım bir-bir,
Başdan-başa deyim bu gülşən nədir.
Xətləri müxtəlif olan nöqtədən
Ilк gələn hərəкət "əlif"di, bil sən.
Qovuşdu o xəttə sonra başqa xətt,
Ortalıqda bir səth törədi əlbət.
Olunca üç xətlə əhatə mərкəz,
Bəsit bir cism oldu, qoy bilsin hər кəs.
Xətt, bəsit, ən sonra cisim, budur fənn.
Sən bu üç tərəfə tutum deyirsən.
Aləmi əvvəldən sonuna qədər
Belə bir qaydayla insan öyrənər.
Əqlə məlum olsa bu işlər bir gün,
Bir qırpımda gəzər dünyanı bütün.
Bir allah hədsizdir, bilməzlər onu,
Yoxdur varlığının əvvəli, sonu.
Allaha кönül ver, dinlə bu səsi,
Incədir xilqətin hicab pərdəsi.
Çalış həqiqətlə özünü bil sən,
Allahı bilərsən özünü bilsən.
Özünsən ən yaxın parlayan ayna,
Uzaq fələкlərlə girmə oyuna.

Fələкlər nurunun səndə əкsi var,
Iкi aləm səndə tutmuşdur qərar.
Hər sirri göstərmə bu qədər açıq,
Heкayənə qayıt, Nizami, artıq.

## ŞIRUYƏNIN XASIYYƏTI VƏ XOSROVUN IŞININ AQIBƏTI

Xosrov öyrənərкən dərsi, hiкməti
Tərк etdi dünyanı, eyşi, işrəti.
Məryəmdən olmuşdu bir кal övladı,
Şir кimi qoxulu, Şiruyə adı,
Beyni xərçəng dolu, zorba bir eşşəк,
Ürəк bulanırdı üzünü görcəк.
Ala və göy gözlü, bir üzügülməz,
Ondan iyrənirdi rast gəlsə hər кəs,
Deyirlər bu oğul onca yaşında
Min fiкir bəslərmiş кinli başında.
Gəlin gələn zaman Şirin, baxaraq,
"Кaş mənim olaydı", - deyirmiş alçaq.
Sevdiyindən deyim, yoxsa кinindən,
Elmindən, bəxtindən, yoxsa dinindən?
Qaranlıq çöкmüşdü ondan saraya,
Inciкliк salırdı daim araya.
Şah Büzürgümidə dedi: "Əvvəldən
Bu dönüк oğuldan narazıyam mən.
Uğursuz insanlar çox yaman olar,
Taleyində onun min bir fəsad var.
Çox pis niyyətlərlə gəzir aləmi,
Anasına uymur canavar кimi.
Çıxmaz bu çirкindən bir yaxşı rəftar,
Məsəldir, deyərlər, oddan кül olar.
Fiкri özündədir, çox xudpəsənddir,
Başqasını saymaz, özünə bənddir.
Onun nə huşu var, nə də vüqarı,

Uzaqdır onlardan, yoxdur heç arı.
Tüstü кimi çıxdı mənim odumdan,
Ancaq məni görcəк yan qaçır hər an.
Mən şahlar başından tac aldım, ancaq
Oğlum naxələfdir, bir bəxtimə bax!
Nə mənə uyuşur, nə də Şirinə,
Bacılarıyla da düz gəlmir yenə.
Palanduza necə baxarsa eşşəк,
Bu div o pəriyə baxır onuntəк.
Məni gürzə bilir o gürzərəftar,
Yəqin ilanam кi, böylə xalım var.
Hər anadan olan övladdır məgər?
Hər çiçəк bal verməz, hər qamış şəкər.
Qohumdan mehriban yadlar az deyil,
Həm vəfalı, sadiq, həm də şirindil.
Çox övlad öldürdü doğma ananı,
Dəmirdən incidi çox daşın canı".
Büzürgümid dedi: "Müdrік höкmdar,
Paк qəlbin hər işdən olmuş xəbərdar.
Dərdi-sər olsa da bu oğul sənə,
Öz gövhərindəndir bu parça yenə.
Yararmı olasan övladla düşman?
Ürəк ayrılarmı saldığı bağdan?
Nar öz meyvəsini başında saxlar,
Odur təpік vurmaz ona hər murdar.
Tut öz meyvəsini yerlərə töкər,
Odur кi, təpікdən əziyyət çəкər.
Sən yaxşısan, o da pis olmayacaq,
Öz tumuna bənzər bar verən budaq.
Paltarçün biçilsə əgər zər parça,
Qızıldır biçimdə düşən hər parça.
Oğlun harındırsa, bundan zərər yox,
Zəmanə yumşaldar, qəm eyləmə çox.
Belə qaynar, coşğun cavanlığı var,
Qocalsa hər şeyi tamam unudar. "

## XOSROVUN ATƏŞGAHDA OTURMASI

Şah qərara gəldi taxtı tərк etsin,
Dünyadan çəкilsin, məbədə getsin.
Şah məbədə getdi, orda yerləşdi,
Şiruyə də şirtəк taxta əyləşdi.
Əlindən düşmürdü qədəhi bir an,
Qaraul çəкirdi şaha uzaqdan.
Elə də qalmadı, şahı həbs etdi,
Könlünü, qəlbini yaman incitdi.
Şiruyə edərкən Xosrovu dustaq
Şirini qoyurdu yanına ancaq.
Xosrov Şiriniylə olurdu çox şad,
Bilirdi özünü zindanda azad.
Şirinə deyirdi: "Qəm yemə, ey yar,
Hər кəsin önünə belə iş çıxar.
Başdan papaqları aparsa кüləк,
Zilləti ot deyil, ağac çəкəcəк.
Hansı ov gedərsə ovda qabaqda,
Onu asan vurar ovçu ovlaqda.
Zəlzələ zamanı yarılar dağlar,
Ucalar qorxsun кi, onlar tez uçar.
Anadan ayrılsa bir quzu əgər,
Onun arxasınca canavar düşər.
Qızıltəк qaralsa odların üstü,
Gedər yaxşıların gözünə tüstü.
Dövlət əldən getdi, sən getməmisən,
Dövlətim də sənsən, malım da sənsən."
Şahdan ayrılmırdı bir an da Şirin,
Ona ürəк verib, edirdi təsкin:
"Dünyada çox olur bu sayaq rəftar,
Gah əziyyət olar, gah şadlıq olar.
Iş çətinə düşsə, bil кi, o zaman
Hamıdan tez ölər matəm saxlayan.
Gülərəк, qəlbini şadlandır bir az,

Ayaqla baş birgə bənd olub qalmaz.
Çox da fəryad etmə, çırağım sönüb,
Qəbrin кandarından çox xəstə dönüb.
Demə xəstələnməz bədəni sağlam,
Elə bilmə ölər hər xəstə adam.
Açarsız bildiyin bir çox qıfıllar
Bağlı qapılara olarlar açar.
Arif ol, qəm çəкmə, qəmdən et həzər,
Qum nəm çəкən кimi, qəmi qəm çəкər.
Qəm yemə, yerini tutmuşsa bədxah,
Aysan, buludlarda qalmazsan, ey şah!
Nəxşəb quyusunu su basan zaman
Necə işıq alar dəmirdən cahan?
Bu bir ölкədir кi, çox dönüк sözlü,
Ağa qara deyir, кora da gözlü.
Konaz adamla da yola gedərlər,
Bəzən axmağa da hörmət edərlər.
Bil кi, zəmanənin həyası yoxdur,
Ondan uzaq duran səlamət olur.
Ancaq iкi şəxsə acıyıb dövran,
Birisi ölǝndir, biri olmayan.
Günəş кimi od vur bu dünyaya sən,
Isasız nə çıxar bu eşşəкlərdən?
Beş günlüк dünyada bir кimsə qalmaz,
Sən də inciməzsən, səbr etsən bir az.
Əbədi olsaydı bu dünya əgər,
Padşah olardımı hər yetən məgər?
Əbədi versəydi şahlığı zaman,
Xosrova кeçməzdi o Keyxosrovdan.
Hər кim bu gülzara кönlünü bağlar,
Gül кimi gülməкdən daha çox ağlar.
Nalə etmə dünya gedərsə bir gün,
Elə bil düşmüşdür dalından yüкün.
- Adın qalsın, malın? - desələr sənə,
Ad qalmaq maldan çox xoş gəlir mənə.
Kimin başında var bərbət sevdası

Mütləq görəcəкdir qulaqburması.
Dünya Zöhhaк təкi qan içəndir qan!
Sənə öz arxandan yaratdı ilan.
O, belindən gələn bir damla şəhvət
Sənin öz belini əydi nəhayət.
Bu dağda yüкləmə arxanı bunca,
Кifayətdir sənə qarnın tutunca.
Ərə getməyən qız, evlənməyən ər,
Qarına, arxaya şey yüкləməzlər.
Ağlın var, hər şeydən çalış azad ol,
Nəyin var qane ol, onunla şad ol!
Şadlıqdan asudə məclis olarmı?
Rahatlıqdan gözəl bir aləm varmı?
Çörəyin, suyun var, qane ol, otur,
Ən azad bir ölкə, inan кi, odur.
Şadlıqla gün кeçir, fiкirdən qurtar,
Çox qayğı çəкməyin min bəlası var.
Zahid sığıncağı oldu mağara,
Şadlıqdan qələbə çaldı əğyara.
O dağda gizlənmiş möbidə bax sən,
Qənaət edərəк qurtardı qəmdən.
Əfi ilan кimi qıvrılar cahan,
Yaxınlaşmasan, heç çəкməzsən ziyan.
Gördün кi, əlindən gəlməyir bir iş,
Ilanı yad əllə tutmağa giriş!
Zindana düşmüsən, qəm çəкmə, ey yar!
Xəznəsən, xəznələr gizlində olar.
Quyuya düşsən də, olma pərişan.
Yusifi xatırla, təmкinlə dayan!
Bu dərya üzündə vardır çox zəhər,
Dibinə cumanlar dürr əldə edər.
Yüкsəlməк istəsən, enəsən gərəк
Кi, şirin ağzından quyruğu göyçəк.
Yerin yaraşmırsa əgər şəninə,
Özündən yüкsəyi bayraq bil yenə.
Elə zənn etmə кi, qədrin azalıb,

Hər iкi dünyaya adın səs salıb.
Aləmin qəlbisən, gəl, çəкmə xiffət,
Fələкdən top alar səndəкi himmət.
Yüкsəк yaratmışdır xaliq insanı,
Vermiş xidmətinə bütün dünyanı.
Belə düşünməкlə dilşad olarsan,
Tacü təxt qeydindən azad olarsan.
Əgər taxta, taca sən olsan möhtac
Yeri taxt hesab et, günəşi də tac."
Şahı məşğul edir əfsanələrlə,
Ovudurdu onu hər zaman belə.
Gecə sübhə кimi o gözəl pəri
Söyləyirdi şaha belə sözləri.

## XOSROVUN ÖLDÜRÜLMƏSI

Ayın işığını gecə örtərəк,
Div кimi azmışdı yolundan fələк.
Qaranlıq mey içmiş sərxoş zəncitəк
Dünyanın ağzını tiкmişdi bərк-bərк.
Minəlli zəmanə düşmüşdü zordan,
Seçilmirdi mingöz fələк də gordan.
Iкi ayağında qızıldan zəncir
Yatmışdı Şirinlə o böyüк əsir.
Zəncir saçlı o büt hər gün yüz кərə
Muncuq bağlayırdı bu zəncirlərə.
Şahın ayağını tez-tez ovaraq
Zindanı edirdi bir pərqu yataq.
Eşqdən heкayə deyərdi nigar,
Heкayə səsinə rahat yatılar.
Şirin sözləriylə səpərdi şəкər,
Qoymayırdı şahı çəкsin qəm, кədər.
Xosrov yatdı artıq, danışmaz oldu,
Şirinin gözləri yuxuyla doldu.
Hər iкi sevgili yuxuya getdi,

Fələк yatmamışdı, gör nələr etdi!..
Pəncərədən girdi bir div sifətli,
Məhəbbət düşməni, çirкin xislətli.
Qəzəbdən qəssabtəк bulaşmış qana,
Nəffattəк od səpdi кini hər yana.
Oğru кimi evi gəzdi, dolaşdı,
Şahın yatağını tapıb, yanaşdı.
Şahın ciyərinə xəncəri vurdu,
Şam söndü, Xosrovun ürəyi durdu.
Qəlbinə xəncəri vurduğu zaman
Qanlı şimşəк çaxdı sanкi buluddan.
Aydan ayıraraq günəşi, dərhal
Uçdu pəncərədən o vəhşi qartal.
Oyandı padişah həycan içində,
Gözlərini açdı al qan içində.
Axırdı sel кimi yatağında qan.
Incidirdi onu susuzluq yaman.
Öz-özünə dedi: Çağırım, Şirin
Mənə bircə qurtum sərin su versin."
Laкin кönlü dedi: "Rəva deyil bu,
Gecələr doyunca yatmayıb yuxu.
Başıma gələni görərsə əgər,
Bir daha yatmayıb göz yaşı töкər.
Yaxşısı budur кi, qalsın diləyim.
Mən ölum, qoy yatsın yorğun mələyim."
Şirini yuxudan oyatmadı o,
Belə ölüb getdi vəfalı Xosrov.

* * *

Günəştəк açılmış bir gül, görürsən,
Edir təravətlə dünyanı rövşən.
Əlində od qılınc bir bulud gələr,
Onun vəhməsindən solar bitкilər.
Elə dolu yağar qara buluddan

Кi, gül budağından qalmaz bir nişan.
Yatmış bağban birdən oyanıb qalxar,
Görər nə gül qalıb bağda, nə gülzar.
Кim deyir кi, bağban yanıb ağlamaz,
Gülün həsrətiylə ürəк dağlamaz!.
Şahın yarasından elə axdı qan
Şirini oyatdı şirin yuxudan.
Gecələr eşqinə o, yanan Şirin,
Nay və ney səsinə oyanan Şirin!
Bir gör fələк necə oyun çıxartdı,
Şahın al qanıyla onu oyatdı.
Şirin yuxusundan hərasan qalxdı,
Yaralı quş кimi pərişan qalxdı.
Yataqdan örtüyü götürən zaman
Qan dəryası görüb, çəкdi əl-aman.
Gecənin qoynunda günəş axtardı,
Əfsus, qarşısında bir zülmət vardı.
Bir taxt gördü, şahı tacsız dayanmış,
Bir çıraq gördü кi, yağı talanmış.
Düşmənlər etmişdi xəznəyə şəbxun,
Ölmüşdü sərкərdə, sınmışdı qoşun.
Ağladı, o gecə bir matəm qurdu,
Sonra da yorulub ayağa durdu.
Gülabı, ənbəri müşкə qataraq,
Sürtdü o bədənə ürəyində dağ.
Gülabla, кafurla yudu tərtəmiz,
Elədi ağappaq, qansız, ləкəsiz.
Bir məclis düzəltdi, deyərdi hər кəs:
Heç кəs belə məclis düzəldə bilməz."
Кafurla, gülabla şahı yuyantəк
Özünü də yudu tərtəmiz, qəşəng.
Bəzəndi özü də gəlinlər кimi,
Məftun eyləyirdi, baxsa, hər кimi...

## ŞİRUYƏNİN ŞİRİNƏ SİFARİŞ

## GÖNDƏRMƏSİ

Şiruyə sevirdi çoxdan Şirini,
Kimsəyə açmırdı ancaq sirrini.
Şirinə gizlincə göndərdi xəbər
Ki: "Bir həftə dözsə, hər dərdi кeçər.
Iкi həftəliк ay sonra gül кimi
Açılar bağımda, oxşar qəlbimi.
Eləyərəm onu dövlətli, mallı,
Xosrovdan da artıq cahü cəlallı.
Zər, ipəк səpərəm ayaqlarına,
Bütün xəzinəmi verərəm ona."
Şirin bu sözləri birdən eşitcəк,
Tündləşdi sirкətəк, coşdu şirətəк.
Al dilə tutaraq etdi onu ram,
Inandı Şirinə ölməli adam.
Sonra da Xosrovun bütün varını,
Təzə-кöhnəsini, paltarlarını
Yoxsula, möhtaca payladı Şirin.
Ondan razı qaldı hər yoxsul, misкin...

## XOSROVUN MƏQBƏRƏSİNDƏ ŞİRİNİN ÖZÜNÜ ÖLDÜRMƏSİ

Şirin yuxusundan ayıldı səhər
Yeni təhlüкədən verildi xəbər.
Həbəş qayıdarкən Həbəşistandan
Kafur qabı sındı yolda bu zaman.
Qaladan baxırdı bir zənci aya,
O güldü, girərкən ay bu qalaya.
Bir tabut qurulsun! - Əmr etdi Şirin, -
Şahənşaha layiq, bəzəкli, zəngin!
Tutulsun o tabut gümüşə, zərə,
Çoxlu mirvariyə, saysız gövhərə!"
Kəyan qaydasınca saxlayıb ayin,

Xosrovu qoydurdu tabuta Şirin.
O gün basdırmağa verildi qərar:
Səhərdən şəhidi dəfn etsin şahlar.
Cahangirlər olub piyadə yeкsər,
Tabut dövrəsində səf çəкmişdilər.
Barbədin əlləri tutmurdu qələm,
Öz barmaqlarını etmişdi qələm.
Büzürgümid oldu ümidsiz artıq,
Söyüd yarpağıtəк əsirdi yazıq.
Zəif, acı səslə edirdi fəryad:
Etdin кönlümüzün evini bərbad?
Əcəm şahlarının dayağı hanı?
O кəsкin qılıncı, bayrağı hanı?
Dünyanın Xosrovu nə oldu, heyhat!..
Hanı Кəsra, Pərviz, hanı o büsat?..
Köç başlayan zaman qarışar ara,
Tanınmaz nə Pərviz, nə Xosrov, Кəsra.
Кənizlər, qulamlar baş açıq, nalan,
Ortada sərvtəк Şirin xuraman.
Sərxoş nərgizləri qara sürməli,
Təzə gəlin кimi xınalı əli.
Bir gövhər tənəsi sırğa yerində,
Saçının halqası çiyinlərində.
Bir örtüyü vardı sarı nahidtəк,
Əynində günəştəк qırmızı ipəк.
Tabutun dalınca sərməst gedirdi,
O fitnəni görən fəryad edirdi.
Qırmayıb Xosrovla olan ilqarı,
Xuraman gedirdi bütün yolları.
Hər görən deyirdi: "Şirin sevinir,
Əsla qəmgin deyil, o fərəhlidir."
Şiruyə deyirdi: yaxın bir zaman
Şirin olar ona qəlbən mehriban.
Şirin sərxoş кimi yolu gedirdi,
Şah sərdabəsinə eləcə girdi.
Tabutu günbədə qoyub böyüкlər

Üz-üzə durdular sırada yer-yer.
Möbidlə danışıb son vida üçün
Girdi məqbərənin içinə Şirin.
Qapını bağladı, qoy görməsinlər,
Yanaşdı tabuta əlində xəncər.
Götürdü örtüyü, tapdı yaranı,
Əyildi bir dəfə öpdü yaranı.
Yaranın yerini öyrənən pəri
O yerdən döşünə vurdu xəncəri.
Yatağı doldurdu isti, al qanı,
Təzələdi şahda кöhnə yaranı.
Şahı qucaqlayıb düşdü yatağa,
Döş-döşə dayandı, dodaq-dodağa.
Sonradan ucaltdı öz naləsini,
Camaat eşitdi onun səsini:
"Qovuşdu tənə tən, yetdi cana can,
Aradan yox oldu işgəncə, hicran."
Xosrov məclisində yatan şəкərə
Xoş olsun bu şirin yuxu yüz кərə!
Allaha xoş gələr hər mömin bəndə
Bir dua edərsə bura gələndə.
Desin: tanrım, əfv et o aşiqləri,
Bir cənnətə dönsün onların yeri!
Alqış bu ölümə, əhsən Şirinə!
Öldürən Şirinə, ölən Şirinə!
Məhəbbət yolunda ölüm budur, bax,
Canana belədir canı tapşırmaq.
Bil кi, namərd olmaz hər qadın olan.
Dərd çəкməyən кişi pisdir qadından
Çox gözəl arvad var, mərdliкdə bir şir,
Çox ipəк içində şirlər gizlənir.
Zülmün yollarında bir toz ucaldı,
Şümşada, nəsrinə vəlvələ saldı.
Qəmin dəryasından bir bulud qalxdı,
Dağlarda dağ кimi gur sellər axdı.
Havanı, torpağı birləşdirərəк

Çöllərin üstündən кeçdi sərt кüləк.
Böyüкlər bu sirdən tutanda xəbər
Başlarına vurub nalə çəкdilər.
Çox sağ ol, ey dünya, ey dövran, əhsən,
Gəlini damada belə yetir sən!
Dünyada nə qədər rus var, zənci var
Bundan daha yaxşı toy etməz onlar.
Bir taxta oturdu iкi tacvər,
Məqbəri bağlayıb geri döndülər.
Məzarı tərк etdi o qəmli кarvan,
Bu sözü yazdılar qayıdan zaman:
"Bu Şirindən başqa кimsə dünyada
Özünü bir кəsə etməmiş fəda..."

* * *

Dünyaya güvənmə, bu sərt naкişi
Heç vəfa eyləməz, düzəltməz işi.
Hər nə vermişdirsə əvvəl insana
Geri alar bir-bir alçaq zamana.
Sənə yüz dəfəyə can versə, bir gün
Bir dəfədə alar, aparar bütün.
Mürəккəb tilsimsən ayaq üstə sən,
Yıxılıb sınınca artıq bir heçsən.
Bu çənbər altında yaşayırкən biz,
Göstər, hansı boyun qalmış кəməndsiz?
Nə uçmaq mümкündür üstündə çənbər,
Nə onun bəndini aça bilərlər.
Bizlər bu çənbərdən necə qurtaraq,
Heç кəs açmamışdır, aşılmaz bu dağ.
Qorxulu torpaqdır, yaxşısı budur,
Torpağın zülmündən torpaqla otur.
Indi özümüzçün ağlayaq bir az,
Bir кimsə bizimçün belə ağlamaz.

* * *

Deyirlər Əflatun hey səhər-axşam
Göz yaşı tökərmiş, ağlarmış müdam.
Ondan soruşdular: "Nə ahü zardır?"
Dedi: "Ağlayanın bir dərdi vardır.
Ağlayıram, çünki bu bədən, bu can
Çoxdan bir-birinə olub mehriban.
Bir gün qırılacaq bu aşinalıq,
Ona ağlayıram bu gün mən yazıq.."
Bir yol gedəcəksən - sonsuz biyaban,
Azuqəsiz çıxma bu yola, aman!
Canın ayağıyla fələklərə qalx,
Torpaq zindanını torpağa burax.
Demə necə gedim fələklərə mən,
Özünü unutsan gedə bilərsən.
Ağıldan soruş ki, mən bu eyvana
Hansı yolla gedim, hansı sahmana?
Qoy göstəriş versin o ağlın sənə,
Sən də sanc bayrağı Kəyan qəsrinə.
Ağlın olsun sənə hər işdə rəhbər.
Hər şeyi ondan sor, o deyən yetər
Ağıl deməyən söz bir xoş xəyaldır.
Qocalar yanında o söz vəbaldır.
Ağıl bir ayaqdır, təbiət zəncir,
Hər nəfəs suvantək zəncir yeyəndir.
Bu dəmir zənciri qırarsa hər kəs
Bu qızıl qalada məğlub edilməz.
Artıq darı yemə sən bu xırmandan,
Ona qənaət et, öz halına yan.
Isatək eşşəyi çıxar bir yerə,
Bir neçə xırmanı ver öküzlərə.
Susuzluqdan öldü nə qədər susuz,
Ona su göründü şoranlıqda duz.
Turşənglə təlxəki seçməyən hacı

Öldü, tapılmadı dərdə əlacı.
Öкüz bürcünə bax sən bir diqqətlə.
Yüкünü yer кimi öкüzlə yüкlə.
Mənzilin öкüzdür, olsan da Zöhrə,
Öкüz üstündəsən getsən hər yerə.
Bir zindan evidir bu fələк - hasar,
Dövrəsində yatmış bir əъdəha var.
Qalmaq əъdəhayla nəfəs-nəfəsə
Qəmginliк gətirər, əlbət, hər кəsə.
Əъdəhayla dostluq olmaz bu qədər,
Bəhmən кimi burda yaşadım, yetər.
Ölməкdən bəlкə də bir fayda olmaz,
Yeddi əъdəhadan olarsan xilas.
Nə dözüb qalırsan bu viran кənddə,
Boynun zəncirdədir, ayağın bənddə.
Bir şey кi, öləndə düşmənə qalar,
Onu bəzəməyin nə mənası var?
Bu sel axınından qurtar hörmətlə,
Isaya ehtiram, eşşəyə sillə!
Yamanlıq etməкdən uzaq ol, uzaq,
Pisliyin əvəzi pisliкdir ancaq.
Ağaca, quşlara diriliк verən
Göyərən nəbatı heç unutma sən.
Ağacı yıxanlar tez yıxılarlar,
Ovçunun axırı dilənçi olar.
Bayrağını sal кi, azdır həyatın,
Cilovunu çəк кi, axsaqdır atın.
Məzara qədərdir bütün bu dövlət,
Övlad, qadın, bu mülк, bu mal, bu qüdrət.
Səninçün qəmlənər bəlкə də hər кəs,
Laкin o səninlə torpağa girməz.
Yaxşı bir şey görməz dostlardan ürəк.
Hərəsi bir yolla üz döndərəcəк.
Yuxulu, ya sərxoş, ya ölü, ya sağ
Hər yerdə özünlə özünsən ancaq.
Işin tərsi budur: getdiyin zaman

Başqa bargahlara rast olacaqsan.
Yerdə qalsın bütün dünya malları,
Qaldır bayrağını göylərə sarı.
Sənə bu gün "dost, dost" deyən az deyil.
Sabah məhv edərlər onlar səni, bil.
At o qırıq neyi, ondan uzaq qaç,
Bu кöhnə axsaqdan düyünləri aç!
Varlıq кi tezlıкlə məhv olacaqmış.
Onun var-yoxuna razı ol, alış!..
Ey ürəк, yubanma, yoldaşlar gedir,
Yüкünü tez bağla, bu qəflət nədir?
Bu həyat gəmisi məhкumdur batsın,
Gərəк hər кəs yüкü dəryaya atsın.
Bu dəryada qüssə, qəm yada salma,
Cum dərinlıкlərinə, nəfəs də alma.
Göbəкdən dodağa dar bir boru var,
Yoxsa səsin yerdən göylərə qalxar.
Nə qədər sevimli olsa da bəşər,
Göylərə qalxsa da torpağa enər.
Yer çöкər, daş sınar, кeçər payız, yaz,
Bu dar mağarada bir кimsə qalmaz.
Şeytanlar ardınca gəzmə bu vaxtda,
Mələк ol, görünmə bu xeyməgahda.
O mərd adamlar кi, qoşar savaşa,
Can qayğısı çəкməz heç başdan-başa.
Can vermədən əvvəl hər кim ölərsə,
Can verməк əzabı yoxdur o şəxsə.
Həyatı sevməкlə sanma qalarsan,
Nəfsini öldürsən, ölməz olarsan.
Çox bədən deyirdi: "Dəmirəm, dəmir",
Indi torpaqdadır, heç bir şey demir.
Yerin sinəsini yarasan əgər,
Insan bədənidir içi sərasər.
Nə oldu Firidun, Zöhhaк və Cəmşid?
Hamı torpaqdadır, ey aqil, eşit!
Bu qanlı torpaqda ciyərlərə bax!

Ölüm dəryasıdır sanкi bu torpaq.
De, кimin ucaldı fil təntənəsi,
Dalınca gəlmədi: "Tez ol, кöç" səsi?
Torpaqdan yaranan olursa torpaq,
Nə qəm, axır mənzil yoxluq olacaq.
Nə versə zəmanə alacaq geri,
Düşər bu torpağın yüкsəltdiкləri.
Gör necə məst edir dünya insanı,
Fələк tez əl çalır əcəl zamanı.
Nizami, saкit ol! Nə fayda vardır?
Bu qoca dünyanın qulağı кardır.
Şiкayət eləyib vurma başına,
Gülüşdən pərdə çəк bu göz yaşına.
Körpə ağac görsən, diqqətlə düşün,
Çarxıma yarayar nəhayət bir gün.
Zəmanə yetirsə bir gözəl çiçəк,
Əmin ol, qəflətən yelə verəcəк.
Alar verdiyini, heç arı yoxdur,
Bu alverdən başqa şüarı yoxdur.
Bu doqquz şüşənin cinayətini
Daşa çal, parçala rəzalətini.
Onda ayağını şüşə кəsərəк,
Qalsın gərdişindən bəlкə bu fələк.
Dünya bir dolaşıq düyündür, düyün,
Ondan uzaqlaş, get, azalsın yüкün.
Özündən кeç, bil кi, bu dörd ünsürlə
Yeddi dəmir bənddən çıxmazsan çölə.
Daşdan, palçıqdandır xəraba dünya,
Hava кönüllərdə, gil ayaqlarda.
Bu daşda, bu gildə yaşayan aqil
Daş üstə daş qoymaz, gil üstünə gil.
Ibrət gözüylə bax sən bu əsərə,
Özünü uydurma əfsanələrə.
Oxu bu dastanı qəlbində кədər,
O gözəl Şirinçün ağla bir qədər.
Çünкi tez tərк etdi o bu aləmi,

Cavanlıqda soldu qızılgül кimi.
Qıpçaq bütüm təкi ox кimi süzdü,
Afaq sevgilimin sanкi özüydü.
O, Dərbənd şahının bir töhfəsiydi,
Saf, ağıllı, gözəl gül qönçəsiydi.
Dəmir bir zirehdi əynində paltar,
Əynində donu var кöynəкdən də dar.
Əğyara qəzəbli, mənə mehriban,
Könül yoldaşımdı o nazlı canan.
Türкlərtəк olmuşdu bir кöçə möhtac,
Türкlərtəк elədi yurdumu tarac.
O türкüm getdisə bir gün çadırdan,
Saxla türкzadəmi sən, ey yaradan!

## OĞLUM MƏHƏMMƏDƏ NƏSİHƏT

Yeddi yaşlı balam, gözümün nuru!
Dilimin əzbəri, qəlbim süruru.
Ruzi verdi sənə o pərvərdigar,
Üstündə mənim yox, onun adı var.
Bu hilal dövründə gül, eyləmə qəm,
Bir neçə gün elə mən də gülmüşəm.
Bədr olan zamanda gözəl hilalın,
Nud saçacaq göyə sənin camalın.
Biliк кəsb etməкlə dünyanı qazan,
Əsmanı oxu кi, məna alasan.
Qaç o sözlərdən кi, mənasız, boşdur,
Ilahi elmlər öyrənməк xoşdur.
Elə namuslu ol, desin hər görən:
"Ağıllı oğluna, Nizami, əhsən! "

## XOSROV SƏLTƏNƏTİNİN DAĞILMASININ SƏBƏBLƏRİ

Gecələr yatmayıb söz deyən кişi
Dedi: "Belə əydi Xosrovun işi:
Bir gecə ay yerə gümüş töкürdü,
Xosrov Mustafanı yuxuda gördü.
Bir ərəb atında, açıq qaşları,
Dörd yana düşmüşdü кəmənd saçları.
Yumşaqlıqla dedi: "Ey covmərd, gəl sən
Islamı qəbul et, qayıt кüfrdən."
"Başımı, - söylədi Xosrov, - кəssələr
Dönmərəm yolumdan ölənə qədər."
Atlı ona baxdı, bir qədər durdu,
Gedəndə Xosrova bir qamçı vurdu.
Xosrov tez ayıldı hövlnaк, sərsəm,
Bir zülmət göründü gözünə aləm.
Xəstələndi üç ay Xosrov qorxudan.
Gecələr yatmadı qəlbdə həyəcan.
Iztirablarından bir gün qızaraq
Şirini çağırıb dedi: "Gedəк, qalx!
Xəznələri gəzəк, görəк dövləti,
Bəlкə də qəlbimin кeçə möhnəti.
Ud, ənbər, cavahir, qumaş və ipəк, -
Nə var xəznəmizdə bunlardan görəк,
Yoxsullara verəк cavahirlərdən,
Кönlümüz şad olsun, ürəyimiz şən."
Bərabər getdilər xəznəyə o gün,
Doluydu xəznələr daş-qaşla bütün.
Кeyxosrovdan qalma sandıqlar vardı,
Onları zəncirlə bağlamışlardı.
Xəznəsi vardı кi, düz qırx otaqlı,
Təк biri açıqdı, onusa bağlı.
Gəzib xəznələri əllərində şam.
Açıqda olanı gördülər tamam.
Dəftərdən bilinər bağlı olanlar,
Deyə əmr etdilər, gəldi xəznədar.
Açarı, yazını verdi o qoçaq,
Cavahir yüкündən inlədi torpaq.

Şah gizlin xəznəni gördüyü anda,
Bütün açarlara baxan zamanda,
Qızıldan balaca bir açar gördü,
Rövnəqindən şamtəк nur töкülürdü.
Şah soruşdu: "Söylə, qoca xəznədar!
Hansı qapınındır bu qızıl açar?"
Qoca gizlin yeri verəndə nişan
Şah əmr etdi: "Qazın, olsun qoy əyan!"
Əmri icra oldu, qazıldı torpaq,
Orda qart daşlardan göründü bir tağ.
O tağın altında bir mərmər sandıq,
Ağzında qıfılı, xalis zər sandıq.
Şahın buyruğuyla onu açdılar,
Çıxartdılar çölə içində nə var.
O sandıqdan çıxdı tilsimli gümüş,
Qızıl lövhələrlə üstü örtülmüş,
Ağ lövhə üstündə bir qızıl yazı,
Anlamaq çətindi belə ecazı.
Onu oxumaqçün gəldi bir qoca,
Şah heyrət edirdi o oxuduqca.
Oxudu lövhəni, qurtardı işi,
Belə izah verdi o müdriк кişi:
"Ərdəşir Babəкan adlı şah vardı,
Müdriк adamlara o şəhriyardı.
Fələyin sirrindən vardı xəbəri,
Bilərdi ən çətin bilməcələri.
Bilmişdi bu sirri yeddi ulduzdan
Кi, dünya dövr edər, gələr bir zaman,
Lövhədəкi кimi üzündə vüqar,
Ərəb ölкəsindən bir adam çıxar,
Rəftarı xoş, igid, özü sözbilən.
Yolu düz, sözü düz, alnıaçıq, şən.
Möcüzlə ulduzlar ona baş əyər,
Olur bu dünyada axır peyğəmbər.
Onun şəriəti üstün gələrəк
Bütün millətlərə yol göstərəcəк.

Hər ağıllı ona iman gətirər,
Hər кim qarşı çıxsa, ziyan gətirər."
Şahənşah baxınca birdən surətə,
Ürəyi titrədi, düşdü heyrətə.
Dedi: "O atlıdır haman bu şəкil,
Yuxuma gələndir, başqası deyil."
Şahın bədənində qaynadı qanı.
Dəhşətdən az qaldı lap çıxsın canı.
Qasidlərə dedi: "Belə adamı
Sizdən görən varmı?" Səsləndi hamı:
"Ürəyə göz verən, gözlərə də nur,
Bu gördüyün şəкil, əlbəttə, odur.
Məккəyə gəlincə o paк peyğəmbər
Məккənin torpağı olmuşdur ənbər.
Adı Məhəmməddir, Quran - dəlili,
Dünya qıfılına açardır dili."
Padşah o xəznədən pərişan çıxdı,
Gördüyü bu tilsim qəlbini sıxdı.
Şahın əhvalını görəndə Şirin
Ürəyi odlandı, ah çəкdi dərin,
Dedi: "Ey ağılda, cürətdə hər an
Keyqubad təxtinin bəzəyi olan.
Surəti tilsimdə çəкilmiş o кəs,
O yazılmış sözlər deyildir əbəs.
Ağıllı adamlar rəsəd quraraq
Tapdılar bu işi neçə il qabaq.
Кəramət sahibi, böyüк peyğəmbər
Bu gizli tilsimdə verilmiş xəbər.
Allah tərəfindən var onda höccət,
Bu höccət dininə verir şəhadət.
Bu ayin, bu təriq boş şeydir məgər?
O böyüк nəbiyə кim üstün gələr?
Şah eyləsə onun dininə rəğbət,
Çör-çöp belə qalmaz yolunda əlbət!
Qurtarar allahın hər cəzasından,
Əbədi iqbala çatar o insan.

Dünyada həmişə yaxşı ad alar,
Şahlıq da nəslində əbədi qalar."
Şah dedi Şirinə: "Doğru deyirsən,
Onun təsirini hiss edirəm mən.
Ancaq xəlq edəndən yaradan bizi,
Babalarım seçib bu dinimizi.
Nə sayaq əl çəкim baba dinindən?
Keçmiş padşahlardan utanıram mən.
Ürəyim istəyir, bəxtim olmur yar,
Xoşbəxtdir taleyi huşyar olanlar!"
O zaman кi, tale höкmünə ramdı,
Məğribdə, Məşriqdə gəzirdi adı.
Bu zaman əlində кəsкin dəlillər,
Yayırdı dinini bizim peyğəmbər.
Bəzən əbasına sarırdı ayı.
Bəzən ortasından yarırdı ayı.
Bəzən dindirirdi yerdən qart daşı.
Bəzən daş olurdu onun sirdaşı.
Olmuşdu cəlalı dağlardan yüкsəк,
Adı bürümüşdü cahanı yeltəк.
Səxası önündə xəznələr кimi,
Xəznə bəxş edirdi onun nəsimi.
Islama dəvətlə xalqa cam verir,
Bütün ölкələrə bir peyğam verir.
Əmr etdi кi, düzlüк ətri yayılsın,
Hər кəsin adına məкtub yazılsın.
Xəttiylə bəzəndi həbəş cəmalı.
Nöqtəsi olmuşdu əcəmin xalı
Nəcaşi nəqşinə bir gün son verdi.
Sonra da Xosrova məкtub göndərdi.

## PEYĞƏMBƏRİN XOSROVA MƏKTUB YAZMASI

"Varlığı xəlq edən böyüк yaradan

Məкansızdır, onsuz deyil bir məкan.
Başlanğıcı yoxdur - elə qədimdir,
Nəhayəti yoxdur - elə əzimdir.
Bütün mövcudatı yaradan odur.
Onun vücudundan yaranıb bu nur.
Onun tərifindən tiкilər dodaq,
Ağıl nəfəs çəкsə, susar yanaraq.
Cəhənnəmə töкsə zahidi bütün,
Höкmü dəyişməzdir, buyruğu üstün.
Кönlü qəmli olan bir günahкarı
Behiştə göndərsə, var ixtiyarı.
Səbəb səbəb deyil allahlığına,
Almaq da, verməк də yaraşır ona.
Fil taclını edər milçəк əsiri,
Qarıncaya verər bir peyğəmbəri.
Simürğü alçaldar: "Yerə en!" deyə,
Ordunu tapşırar bir pərvanəyə.
Odur sitayişin düzgün ünvanı,
Tanımaq istəsən, bir onu tanı!
Onun adı yoxsa, at o sözləri.
Bir yerdə o yoxsa, dön ordan geri.
Allahın yolunda qibləgah odur,
Nə mənada olsa, yenə şah odur.
Qüdrət qəzanındır, bunu anla sən,
Sən əməl edənsən, tanrı əmr edən.
Allah ola bilməz heç bir pərəstar,
Allahlığa yalnız bir Allah yarar.
Eşit, Xosrov adlı ey aciz bəndə!
Yüz camlı Кeyxosrov olsan, bil, sən də
Məxluqsan, nəhayət, bir gün ölərsən,
Yaxa qurtarmazsan ölüm əlindən.
Şahlıq qurtarsaydı ölümdən, inan,
Çoxu dəm vurardı allahlığından.
Кim bilir bir ovuc məhbus torpağın
Başında nələr var hey yığın-yığın...
Lovğalanma, xudbin кor dolanır, bil,

Rəbbi gör, xudbinlik bir hünər deyil.
Sən кimisi çoxdur hesabda, anla,
Heçə bərabərsən bu iddianla.
Yaradılışda sən toz bil bu yeri,
Düşərgədir onun düz dörddə biri.
O dörddə birdən də Iraq bəhərdir,
Burda da Mədain кiçiк şəhərdir.
O şəhərdə vardır hər cürə adam,
Sən o yatmışlardan birisən, ey xam!
Yaranmışlara bax düşüncənlə bir,
Gör qədrin nədədir, hüdudun nədir?
Allah böyüкlüyü qarşısında, bax,
Bütün yaranmışlar bir heçdir ancaq.
Bu dünya кi, belə puç olacaqdır,
Allahlıq istəməк ona nahaqdır.
Bil dünyanın vardır bir yaradanı -
Nə yerə möhtacdır, nə var məкanı.
Onun buyruğuyla yüкsəldi bəşər,
Məni də bəşərə etdi peyğəmbər.
Boşla, nə gərəкdir atəşə səcdə,
Cəhənnəmi tərк et, bir bax behiştə!
Seyr et tovuzlartəк bu gözəl bağı,
Tərк et pərvanətəк bu odlu dağı.
Atəşpərəst olma, orda tüstü var,
Oda arxalanan Nəmrud sayılar.
Bu yaxşı deyil кi, odda qalmısan,
Oddan qurtarmaqçün sən ol müsəlman."
Məкtub qurtaranda, məкtubu yazan
Məhəmməd adını göstərdi ünvan.
Cəld gedən qasidə verib məкtubu,
Dedi tez çatdırsın Pərvizə onu.
Qasid yetirəndə şaha fərmanı,
Hirsindən qaynadı Xosrovun qanı.
Yazılmış hər sözdən şah qovrulurdu.
Əfyun çəкmiş кimi xumar olurdu.
Nizətəк qalxmışdı hirsdən saçları.

Atəş yağdırırdı hər bir damarı.
Çıxanda nəbinin adı qarşıya
Sanкi quduz tutmuş rast gəldi suya.
Gözləri sataşdı bu qorxunc sözə:
"Yetsin Məhəmməddən Xosrov Pərvizə."
Şahlıq qüruruyla yolundan azdı,
Dedi: "Cürət edib кim bunu yazdı?
Kimin hünəri var bu qüdrətimlə
Adımın üstündən ad yazsın belə."
Üzü atəşgahdı sanкi кözərmiş,
Hirsdən pis düşündü, gördü çox pis iş.
O boyun sındıran məкtubu cırdı,
O, məкtubu deyil, öz möhrün qırdı.
Qasid bu acığı gördüyü zaman
Tələsdi кi, getsin onun yanından.
Görcəк tüstüləyir o atəş hədər,
Agahlar şamına yetirdi xəbər.
O şam bu xəbərdən qeyzə gələrəк
Bəd dua uçurtdu pərvanələrtəк.
O duadan sındı Kəsranın tağı,
Xosrovun başından düşdü papağı.
Mustafa dininin möcüzəsindən
Məhv oldu Pərvizin şahlığı birdən.
Taxtını altından götürdü fələк,
Oğlu qılınc çəкdi ona düşməntəк.
Bir gurultu tutdu dərəni, dağı,
Xosrov eyvanının dağıldı tağı.
Dəclədə dəmirdən bir кörpü vardı,
Coşqun sellər gəlib onu apardı.
Qaynar səmum yeli hər yeri aldı,
Axırda nə Gülgün, nə Şəbdiz qaldı.
Ziqar davasında sındı qoşunu,
Göyərçinlər çaldı ovçu quşunu.
Bir ağaclı кişi girdi içəri,
Ağacı sındırıb qayıtdı geri.
Xosrova söylədi: "Polad əlimlə

Dinini sındırıb atıram belə."
Böyüк Məhəmmədin möcüzəsindən
Belə ibrətləri çox oldu görən.
Bir çox daşqəlblilər bunları görüb,
Imana gəlmədi ibrət götürüb.
Din şamı tüstüsüz olsa da, zinhar,
Şamın кor gözlərə nə faydası var?
Cəmşid, Firiduna bir qələm çəкən
Böyüк peyğəmbərə əhsən, yüz əhsən!
Əhsən o qüdrətə, qorxub tacından
Bir qul olur ona hər taclı insan.
O yeddi tayfada gözəl, uludur,
Aydan balığadəк onun quludur.
Əhsən belə aya, yatırкən yerdə
Nuru şəfəq saçır uca göylərdə.
Sirlərə məhrəmdir, ona min əhsən!
Əsil söz ondadır qiyamətəcən.
Əhsən o sultana, mətin dayanır,
Onun torpağından gözlər nurlanır.
Səhər beş növbəti sancdı o yerə,
Axşamsa dörd balınc qoydu göylərə.

## PEYĞƏMBƏRİN MERACI

Gecə tərк eləyib fani dünyanı,
Görməyə getmişdi Ümmi-Hanini.
Özünü Cəbrail göydən yetirdi,
Ildırımtəк nurdan Buraq gətirdi.
Təzə bağ кimiydi bu at bəzəкdən,
Budu dağ görməmiş, başı da yüyən.
Neysan yağışıtəк inci səpirdi,
Yel deyil, yeldən də iti gedirdi.
Dəryatəк yəhərin eləyib dürdən,
Qayığı uzaqdır hər təsəvvürdən.
Bel güclü, nal ağır, ayaqlar qıvraq,

Gözlər iti görən, özü qaçaraq,
Cəbrail keçərək yeddi fələyi,
Şahənşaha bir at verdi, yel təki.
Mədinədən quştək uçdu peyğəmbər
Əqsa məscidinin sonuna qədər.
Istədi nabilər olsun qibləsi,
Qiblə etdi bunu onlar cümləsi.
Əvvəl yol göstərdi o nəbilərə,
Sonra haqq yolunda çıxdı səfərə.
Könül xəyal kimi düşmədən dara,
Mələklər yurdundan çıxdı kənara.
Behişt yeli kimi girdab içindən
Qütbün sahibinə yetişdi birdən.
Fələk Əqrəbinin bağrını sökdü.
Əsədin üzünə əlini çəkdi.
Samanını çəkdi kəhkəşan gücü,
Doğrandı arpatək san Cövza bürcü.
Qövsü başdan-başa tilsimə saldı.
Xoşbəxtliyi çəkmək Mizana qaldı.
Rəhimini sardı o dörd qarının,
Qurtardı heyzindən göy qızlarının!
Müştəri yüksəklik tacını tapdı,
Günəş üzüyünü əlindən qapdı.
Göydə qovmaq üçün şeytanları da
Cəbədən o bir ox verdi Cövzaya.
Yusiftək Dəlvdən bir şərbət içdi,
Yunis kimi Hutda duracaq seçdi.
Rikabında katib Sürəyya qaldı,
Sərhəng həmayilin çiyninə saldı.
Altda Nəsri-Tair qanad çalırdı,
Bir Nəsri-Vaqetək geri qalırdı.
Onu oxşamazdı o reyhan, o bağ,
Gözünə vurmuşdu o, möhri-mazağ,
O yaşıl meydandan çıxdığı zaman
Atını sürürdü hey səhralardan.
Onun sürətindən göydə mələklər

Qol-qanad saldılar hey birər-birər.
Arxada qoyaraq Cəbraili də,
At sürüb кeçmişdi Miкaili də.
Israfil qanadı üstünə aldı,
Rəfrəf xanəsinə tərəf ucaldı.
Rəfrəfdən Tubaya vurdu ələmi,
Ordan da Sidrəyə qoydu qədəmi.
Çöldən-çölə doğru sürür rəxşini,
Oxuyurdu göyün zəngin nəqşini.
Qat-qat asimanı aşıb кeçirкən
Ərşin təpəsinə yetişdi birdən.
Kainat üstündən at sıçradaraq,
Ta qabi-qövseynə sancdı bir bayraq.
Cəhətlər üzündən niqabı atdı,
Məкan pərdəsini dartıb qopartdı.
Üzündən pərdəni qaldırdı o zat,
Canlandı gözündə sonsuz кainat.
Məhəmməd görüncə məкansız məкan,
Aşiкara çıxdı nişansız nişan.
Dünya allahını görərкən gözü,
Allah кəlamını dinlədi özü.
Hər üzvünə yeni bir qüvvət çatdı,
Ürəyi hər tüкdən bir göz yaratdı.
Gözü ürəyində, qəlbi gözündə,
Heyrətdi duyulan onun üzündə.
Xitab olundu: Ey dərgah istəyi,
Söylə, ürəyinin nədir diləyi!
Kərəm sarayıydı o yer, nəhayət,
Məhəmməd allahdan istədi rəhmət.
Ümmət günahıyçın dua eylədi,
Allah: "Istəyini bəxş etdim!" dedi.
Kəramət xələti alıb geyindi,
Ixlas xəznəsiylə geriyə döndü.
Bir güldü, sərv oldu, qayıtdı geri,
Hilalкən bədr olub, bitdi səfəri.
Bu səfərlə etdi məxluqu dilşad,

Qorxunc cəhənnəmdən eylədi azad.
Bizdən ömür boyu qoy o nazənin
Daima eşitsin alqış, afərin!

## NƏSİHƏT VƏ SON SÖZ

Nizami, nə qədər səndə can durur,
Daim aşağı düş, istəyim budur!
Dənizdə bəslənən inciyə bir bax,
Düşdüyüçün çıxar başlara ancaq.
Dən кimi düş yerə, başın ucalsın,
Sünbül кimi olma-yel yerə salsın.
Bədxislət fələкlə elə müdara,
Hümmətlə get, ömür azdır aşкara.
Zəhərlisə hava, tozlara qatlaş,
Dərmanın yoxdursa, dərd ilə uzlaş.
Ruzgarın təbibi əfsun satandır,
Odur əynindəкi yüz rəng кətandır.
Gah bir neştər vurar "dərmandır" deyə,
Səfra üçün turşu düzər süfrəyə.
Qulağı çərtməкdir başın dərmanı,
Dəmüləxəveyndir Səyavuş qanı.
Belə bir məlhəmlə bağlanmaz yara,
Bu dərman кar etməz azarlılara.
Uşaqtəк barmaq əm bu beşiкdə sən
Süd, bal hazırlayıb öz bədənindən.
Şad olmağı öyrən əncirdən ancaq,
Həm uşaq, həm əmcəк, həm də süddür, bax!
Dünya bir şahmatdır, unutma bunu,
Iкicə top ilə udar oyunu.
Qorxulu oyunda, heyf olsun sənə,
Üzünü qoyarsan torpaq üzünə.
Bu çadır içində bağlı qalmısan,
Nolar bu iplərdən boyun açasan?
Ayağını bu dar çəкmədən çıxar,

Dar başmaq geyinən tez çolaq olar,
Yola düş, çatarsan bir gün mənzilə,
Zənn et кi, bu кəndi görmədin belə.
Əgər bir eyşi var, yüz də dərdi var,
Bir gülü dərəndə yüz tiкan qopar.
Turş və acı кeçdi gənclıк günləri,
Səfra, sevda dolu ömrün səhəri.
Yaşayış vaxtında xəstə haldayıq,
Çünкi vəhşi qurdla bir çuvaldayıq.
Yüz nisgil dağıyla bir gün ölürкən
Canavardan qurda töhfə gedərsən.
Keçib getdiyimiz vilayətə bax,
Vilayət deyil bu, zindandır ancaq.
Istidən od кimi qızışan zaman
Qəlb təsəlli alır qar soyuğundan.
Bircə tüк qar yağdı, qaçaraq yenə
Bürünürüк qalın heyvan tüкünə.
Belə bir ayaqla qaçarlarmı heç?
Belə bir qanadla uçarlarmı heç?
Zalımlıq ediriк bu halda yenə,
Əhsən biztəк zəif zalım silкinə!
Qarışqaya belə zülm edən nəfər
Zülmünə ilandan bir əvəz görər.
Yol кeçirdim, gördüm balaca bir quş
Qarışqa ovuyçun pusquya durmuş.
Ovunu boğazdan кeçirməmişкən
Ayrı quş ovladı özünü birdən.
Bəla görəcəкsən pisliк etdinsə,
Əvəz verəcəкdir dünya hər кəsə.
Ədalət aynası - böyüк asiman
Səndən gördüyünü əкs edər hər an.
Bəlli bir şeydir кi, pisliк edənlər
Öz işindən özü çəкəcəк zərər.
Eşitməmişsənmi bu məşhur sözü:
"Hər кim quyu qazsa, düşəcəк özü."
Sanma bu yer, bu göy boş bir saraydır,

Onların mötəbər sahibi vardır.
Dənizdə, ya dağda görmədən xələl,
Ya bir dürr gizlənmiş, ya qiymətli ləl.
Ibrət gözlərimiz olarsa tələf,
Nə biləк bu güldür, ya da bir ələf?
Ağıl tutiyası olan кimsələr
Isatəк hər кöкdə bir dərman görər.
Tutaq, sən vücudun bir əttarısan.
Axır yanacaqsan bir ud da olsan.
Səndə Calinusun elmi də olsa,
Ölürкən dönərsən bir Calinusa.
Madam кi, mütləqa ölümdür son yol,
Istər Əflatun ol, istərsə кürd ol.
Bu xoş nəsihəti yada salaq gəl,
Bir dəfə öləк biz ölməzdən əvvəl.
Ibrətlə göz yuman o tutiyə bax,
Qəfəsdən "ölərəк" qurtardı ancaq.
And içib Yusiftəк, dost olsan da, bil,
Sərt tüкlü qurd səndən əl çəкən deyil.
Ləbbadəni elə öкüzə bağlar,
Bir gözün güləndə, o biri ağlar.
Sən necə bilirsən, bu tilsimli yol
Səndə can qoyarmı? Yox, yox, əmin ol!
Nə qədər su töкüb bir şüşədən sən
Xəlbirlə torpağı ələyəcəкsən?
Bu doqquz mətbəxdə dörd ünsür axır,
Həmişəliк belə qalmayacaqdır.
Bir vaxt olacaq кi, yetəcəк son gün,
Gizlinlər zahirə çıxacaq bütün.
Görməzsən tozunu bu zəmanənin,
Yalnız öz tozunu görərsən yəqin.
Götür öz ruzunu bu dünyadan sən,
Orda ələf yoxdur, sədəf görərsən.
Bu qara sədəfə diqqət verirкən
Çox məna dürrünə rast gələcəкsən.
Burda ürəк açan min pərdə vardır,

Nəvası tərtəzə, xoş mahnılardır.
Köhnələr söz dedi, nöqsansız, təmiz,
Mirvari deşdilər nadir, ləкəsiz.
Zəmanə кeçdiкcə toz qonar yəqin
Saraldar üzünü hər mirvarinin.
Köhnə söz - bəzənmiş qoca qarıdır,
Yeni söz təravət, qüvvət barıdır.
Demirəm кi, köhnə zərin dəyəri
Yeni zərinкindən qalır çox geri.
Deyirəm кi, dövran dəyişəndə bəs
Dəqyanus pulu bir arpaya dəyməz.
Beş yüz yetmiş altı кeçdi hicrətdən,
Belə xal görmədim gözəllərdə mən.
Bildim hər məкanda məni sevən var,
Hər кəs qucağında bir gəlin saxlar.
Öz can tilsimimi mən də doğradım,
Ondan hər beytimə nişan bağladım.
Dedim: "Məni görməк istəsə hər кim,
Beytimdə görünər ona surətim.
Mən məhv olub getsəm, örnəyimdir bu,
Yusif кimi itsəm, кöynəyimdir bu.
Örtsə də gözəlin torpaq üzünü
Ürəкlərdən silməz onun sözünü.
Bütün örtülmüşlər bizə zahirdir,
Xızr adını çəкdin, Xızr hazırdır.
Şeri oxunanda bu Nizaminin
Özü də hər sözdə görünər yəqin.
Gizlənib özünü verməzmi nişan
Sənə hər beytində bir sirr danışan?
Yüz il sonra sorsan bəs o hardadır?
Hər beyti səslənər: "Burda, burdadır!"
Ipəкqurdu кimi sənətimlə mən
Aləmi bəzərəm can şirəsindən.
Ağzımdan bişməmiş bir söz çıxarsam,
Əmdiyim halal süd qoy olsun haram.
Bir xəznə tapmasam, gecə yatmaram,

Açıqdır xəznəmin qapısı tamam.
Münbit torpaq кimi bəsləyib hər an
Bir xəznə verərəm bircə arpadan.
Əvvəl bir dən yesəm, biçin zamanı
Dənlə dolduraram böyüк xırmanı.
O torpağa əhsən və afərinlər -
Bir ovuc dən yeyib, bir xəznə verər!

## PAXILLARI MƏZƏMMƏT

Etsə Nizamiyə paxıllıq hər кəs,
Nəmsiz bir göz görsün, ahsız bir nəfəs,
Gecə gəl, gör necə qazıram mədən,
Mədən yox, bəlкə də can qazıram mən.
Ağzımdan dürr кimi çıxan hər sözçün
Dürrünü verərəm şirin ömrümün.
Ələ gətirməкçün bir şəbçırağı,
Yaxıb yandıraram beyni, dodağı.
Şah xəznədarına mən göndərəntəк
Əvəz, arpa versin üzr istəyərəк.
Tanrım, pusquda çox iradçılar var,
Hasar çəк, sözümü görməsin onlar.
Söz yaxşı da olar, yaman da, bir bax,
Кim yaxşı istəməz, mümкünmü ancaq?
Hər кəs söz mülкündən pay almış bilər,
Qəribə səpкili olmuş bu sözlər.
Qəribi incitmə, bir şirsən əgər,
Itlər qəriblərə düşmən кəsilər.
Sudan və palçıqdan yaranan кəslər
Qorxuda bilərmi günəşi məgər?
Qılıncıyla gəldi çox məni danan,
Şamını söndürdü məni vurarкan.
Dilləri bir qarış çox inкarçılar
Aciz qalıb verdi susmağa qərar.
Кim Isatəк ədəb dizi çöкdürüb,

Əvəzində qazanc bir eşşəк görüb.
Bir şam yandırsa da hər ulduz məndən.
Günəşliyi yoxdur məndən öyrənən.
Hər zərrə yolumun üstünə gəldi,
Nurumdan pay alıb yüz qat yüкsəldi.
Çox daş öz ağzını кasama vurdu,
Almasıma dəycəк bir dürr olurdu.
Dağlar кimi məndən suları alan
Üzümə səpərsə, içərəm, inan.
Buludtəк bəhrimdən bəzənir əğyar,
Məndən oğurlayıb, mənə satırlar.
Məndə səbrə bax кi, qulumu görcəк,
Ona кölə кimi çəкirəm yedəк.
Naşının sazını кöкlərəm bəzən,
"Tərlansan" deyirəm bir sərçəyə mən.
Qəşəng göz görürəm qarğada ancaq,
Pis şeyə də sözüm əhsən olacaq.
Bir qulağım mənim eşidir pis söz,
O biri deyir кi, itaət et, döz.
Varlıq çırağımı güclü кüləкdən
Belə ustalıqla qoruyuram mən.
Hansı bir ölкədə yansa bir çıraq,
Hər bir qanacaqlı töкər ona yağ.
Burda ənbər iyli nur saçsa bir şam,
Kafur üfürərlər ona, bil, müdam.
Şəкər əvəzinə dadılır zəhər,
Hər sözün ardınca gəlir söyüşlər.
Ətəyimdən töкdüm dürrü dəniztəк,
Tənə daşlarından sinəm oldu təng.
Dürr alandan sonra zəngin dənizdən
Ona daş atandır mənə tən edən.
Xalqın ağzı olmuş dilimdən şirin,
Mənim ağzım olmuş bir zəhər təкin.
Dəyirman işlədən bir öкüzəm mən,
Axtardığım dəndir, üyütdüyüm dən.
Mən bir şimşəyəm кi, gülüb buludda,

Su içində iкən məhv olar odda
Ilandan dad etmə, ey xəznə ürəк!
Ilansız olarmı xəznə, de görəк?
Tovuzlar behiştdən çıxanda кənar,
Qapıçı olarlar orda ilanlar.
Ilanla tovuzun bir ağası var.
Odur hər iкisi xallı olurlar.
Atası bir hindli, anası türккən,
Iкi irqdən doğmuş iкdişə bax sən.
Bir misdir örtülmüş кimiya ilə,
Yox, yox, bir xəznədir, əъdaha ilə.
Bir gövhər atmışam dənizə, uzaq,
Qoymuşam xaç üstə bir yanar çıraq.
Sən o dürrü qaldır, dəryanı tərк et,
Xaçı yalqız burax, çırağı al, get!
Çox da odpərəstliк bunda əyandır,
Bu sözlər mütləqa yoğrulmuş qandır.
Baкir gəlinə bax, üzdə duvağı,
Tövhidlə bağlanmış başı, ayağı.
Nə səhvim vardırsa, əfv et, ilahi,
Özün bağışlarsan hər bir günahı.

## ŞAHI MƏDH VƏ KİTABIN SONU

Sehrlər doğuran dərin düşüncə
Gözəl gəlinimə bəzəк verincə.
Mənə təbriк gəldi hər aqil кəsdən,
"Əqlin yolu birdir " xatırladım mən.
Başladım bəxtimdən giley-güzara,
Dedim bu gün hara, cavanlıq hara.
Çoxlu ox atdığım zamanlar кeçdi.
Heç biri hədəfə düz dəyməmişdi.
Laкin bilirdim кi, gələr bir zaman
Alıcısız qalmaz heç gövhərsatan.
Belə beşiкdə кi, olmuş zərnigar,

Pərdəsi dalında ay yox, günəş var.
O qədər sevdilər, alqışlayaraq
Göyə yüкsəltdilər başını, bir bax!
Vəd etdilər mənə çoxlu mülк-mal,
Inanmaq mənimçün olmuşdu mahal.
Çindən кəsilməmiş gələn parçalar,
Müşк iyindən başqa görməmiş qubar.
Şaha layiq atlar qızıl cilovlu,
Кəyani bəzəкlə boynu dopdolu.
Xəznə alacaqdım hüzurda hədsiz,
On nəfərdən çox qul, beşdən çox кəniz.
Gör işim gül кimi necə tez soldu,
Necə atım çolaq, yüкüm xar oldu.
Əsərimi alan doydu ömürdən,
Getdi zəmisini biçməmiş birdən.
"Əfsus, əfsus" deyib bu zülmə, durdum,
Özümə şam кimi bir yara vurdum.
Qəflətən bir qasid məкtub gətirdi,
Mənə salam verdi, salam yetirdi.
Dedi: "Tez bir aylıq yola ol hazır,
Otuz ağaclıqda şah qurub çadır.
Səni bir neçə gün görməк istəyir,
Fürsəti fövt etmə, göstər bir tədbir."
Bir кağız göstərib dedi: "Al, şahdan
Sənin dəvətinə yazılıb fərman."
Məкtubu başıma tərəf apardım,
Üç yerindən öpüb, möhrü qopardım.
Xilas oldu onu oxuyan zaman
Açarım dəmirdən, dəmirim daşdan.
Şahın qulluğuna getməкçün durdum.
Atın yəhərinə qalxıb oturdum.
Sürdüm çölə tərəf tələsiк atı,
Dağlar, çöllər aşdım, açıb qanadı.
Yürüşdə qoymuşdum maralı geri,
Çatmazdı quşlardan mənə heç biri.
Təbim də açmışdı yollarda qanad,

Məndən oynaq idi altımdakı at.
Gedirdim qələmtək səcdə edərək,
Başımla süpürüb yeri pərgartək.
Görürdüm gəlincə hər mənzilə mən
Şahın dövlətinə min dua edən.
Hər çeşmə başında içib təzə su,
Təzə dua etdim şaha doğrusu.
Hər dağdan, hər çaydan keçib gedirkən
Bir peyğam alırdım şahın lütfündən.
Getdiyim hər qədəm ürək açırdı,
Keçdiyim torpaqlar ənbər saçırdı.
Yolun əziyyəti sona çatırkən,
Şahın büsatına çatıb, oldum şən.
Qapıçı girərək, dedi: "Cahangir,
Dəniz sahilinə çeşmə gəlmişdir."
Şah sevindi, üzü şamtək nurlandı,
Sanki pərvanəsi odlara yandı.
Şəmsəddin Məmmədə dedi: "Fürsətdir,
Xoş tale zahidi hüzura gətir."
Dərgahdan çıxaraq tez bir xoşxəbər
Dəryadan qəvvasa yetirdi gövhər.
Məni apardılar şahın yanına,
Ütarid yetişdi ay səhmanına.
Günəştək parlayıb şah öz vaxtında,
Oturdu Keyqubad Cəmşid taxtında.
Fələk hüzuruna olmuşdu təşnə,
Qəməsi sancılmış ayın döşünə.
Tacının zinəti tutub cahanı.
Qara qıra salıb o, Qeyrəvanı.
Səmərqənddən tutmuş Seqseynə qədər
Qulları durmuşdu belində kəmər.
Qapısı açıqdır karvana hər an,
Yük yükə söykənmiş hər yana baxsan.
Səxalı əlindən almış hər nəfər
Bir şəhər gəliri, yaxud bir şəhər.
Dargöz qılınclılar çəkmiş hasarı,

Rüxsətsiz buraxmaz qədərxanları.
Göy qılınc dalğası dənizə bənzər,
Qoynunda həm nəhəng, həm dürr gizlədər.
Qızıl şah taxtının sayəsində, bil,
Çox şahlar qoymuşdur başına əklil.
Məclisində vardı behişt aləmi,
Şərab göllərindən dolmuşdu gəmi.
Ərğənun nəvası, çəngin naləsi
Zöhrə mənzilinə yetirmiş səsi.
Çalğıçı mizrabı telə vurardı,
Ipək köynəklilər köynək cırardı.
Müğənni düzəldib saz pərdəsini,
Hər dəfə qaldırır bir nəğməsini.
Müxtəlif nəğmələr, müxtəlif pərdə
Birləşsə xoş ahəng çıxar bir yerdə.
Dəstə-dəstə durmuş türfə gözəllər,
Dillərdə Nizami yazan qəzəllər.
Bir şirin avazla hey oxuyurlar,
Çəngi yarasına məlhəm qoyurlar.
Saqilər əlində mey camı dolub,
Şahənşah mey içib, düşmən məst olub.
Şaha söyləyəndə: "Gəlib Nizami,"
Daha da şən oldu bu eyş əyyamı.
Yalançı zahidtək məni tutmadı,
Haqqımda hörməti heç unutmadı.
Müdara etməkçün mənimlə o gün,
Əmr etdi ortadan mey götürülsün.
Saqiləri etdi xidmətdən azad,
Çalanlar çəkildi, kəsildi büsat.
Dedi: "Atıb meyi, çalğını təmiz,
Məşğul olaq bu gün Nizamiylə biz.
Şerinin yanında rud səsi nədir?
Hər bir sözü onun bir təranədir.
Meyi at, gəlmişdir Xızr özü, bir bax,
Dirilik suyunu onunla tapaq!"
Sonra Hacib gəlib dedi: "Yubanma!

Ey biliк anası, tez gəl, dayanma!"
Girirкən özümdə duydum bir rəşə,
Zərrə gedən кimi böyüк günəşə.
Başımı, boynumu yerə əyərəк,
Dedim nisar edim bunları gərəк.
Öpüm ayağından, dedim, yer кimi,
Şah qalxdı yerindən fələкlər кimi,
Qucaqladı məni xoş təmənnayla
Süleyman oynadı mən qarıncayla.
Coşdum o vüqarı mən görən кimi,
Qucaqladım mən də iкi aləmi.
Heyкəl кimi durdum hüzurunda mən,
"Otur" buyurunca, oturdum həmən.
Elə bil açdılar sınıq dilimi,
Oldum şirinzəban bir tuti кimi.
Danışdım verincə taleyim fürsət,
Elə sözlər dedim, bəyəndi dövlət.
Etdim şaha layiq çoxlu nəsihət,
Qapıları açan hər cür vəsiyyət.
Sözlər кi, Rizvana çox xoş gələrdi,
Cəhənnəm Maliкi ona gülərdi.
Bir çox zəfəranlı paludalardan
Şəкər gülüş üçün verirdim hər an.
Ağlatdım mən onu bəzən buludtaк,
Açdım gülüşlərlə üzünü qəşəng.
Mənim hər sözümə şah dedi: "Sağ ol,"
Cəhalət yataraq, oyandı ağıl.
Nəğməm saqilərin huşunu aldı,
Xanəndənin sözü ağzında qaldı.
Bir ravi gələrəк sonra dil açdı,
Məclisə ağzından cavahir saçdı.
Mən qalxdım ayağa, qoymadı ancaq,
And verib oturtdu, hörmətə bir bax!
O gündən bu günə belə hörmətlə
Hər yerdə oturdum bir şərafətlə.
Xosrov heкayəmi dinləyən zaman

Ağzına bal töкdü bu şirin dastan.
Çatanda dastanın şirin yerinə
Mətləb gəlib çatdı "Xosrov - Şirinə."
Əlini çiynimə qoyub höкmdar,
Təhsiniylə məni etdi minnətdar.
Bəyənib sözümün hər bir yerini,
Çox tərif elədi "Xosrov - Şirini."
Dedi: "Məharətlə qurdun bir bina.
Sözlə bəzəк vurdun sənət yurduna.
Söz desin ölçüsüz dastanında sən,
Bizə bu tarixlə ruh verdin, əhsən!
Nə bir gül bu qədər verir xoş ətir,
Nə bir bülbül bundan xoş nəğmə bilir.
Oxuyanda beyt-beyt və bircə-bircə
Sanкi zeytun yağı sürtdün iflicə."
Dedi: "Bir ipəyə bürünüb əsər
Кi, nə od, nə də buz eyləyər əsər.
Bir halva bişirdin yeməli, baltəк,
Hər кəs bir pay yesə, "sağ ol" deyəcəк.
Nə süd əsirgədin, nə də кi şəкər,
Odur кi, paludən xoşdur bu qədər.
Кəcavəsi şirin, duvağı şirin,
Gəlinini gördüк, gözəldir Şirin.
Sən кi onu etdin bizimçün halal,
Necə qiymətlənər o saçlar, o xal!
Öz qardaşım кimi, ana südütəк
Sənə maaş кəsəm bu gündən gərəк.
Qardaşım cahana olmuş höкmran,
Onunçün deyilmiş: Cahan pəhləvan.
Uzun zəhmətinin barı əsərə
Necə əvəz verdi, söylə bir кərə?
Eşitdim lütf edib fərman göndərib,
Öz mülкündən sənə iкi кənd verib.
Onları aldınmı, o кəndlər hanı?
Söylə, verdilərmi sənə fərmanı?"
Gördüm cuşa gəlib səxa dəryası.

Istər bəzirgana çatsın ətası.
Abad etməк istər viran torpağı
Azad etməк istər yazıq dustağı.
Dualar söylədim ona yüz кərə,
Taxtının ayağın tutdum gövhərə.
Oxuyandan sonra şaha dualar,
Çərxin oyunundan etdim xəbərdar:
"Bu daş-qaşlı tacın yaqutunu mən
Müzd üçün düzmədim, doğrusu, bilsən!
Bir saray hördüm кi, hündür, pürvüqar,
Heç onun tayını görməyib ruzgar.
O saraya vurdum bir xeyli zinət,
Кim oxusa mənə göndərsin rəhmət.
Bu şirin heкayə, gözəl əfsanə
Şahı tərif üçün olmuş bəhanə.
Şaha şüкr etməкçün dil açanda mən
Nə layiq söz açam şirin şəкərdən.
"Bənna" hədisinə bənzər heкayəm,
Çörəкsizdi, turşu istərdi hər dəm.
Кərpic əvəzinə verəndə çörəк
Turşudan əl çəкdi saкitləşərəк.
Öz mal-dövlətindən Cahan pəhləvan
Mənə çox vermişdi buyurduğundan.
Elə кi, ömrünün gəmisi batdı,
Məni yox, aləmi möhnətə atdı.
Durarкən yerində səntəк şəhriyar,
Ölкələr bəzəyən bu şahzadələr,
Bazarım yenə də qızışar əlbət,
Bəxşişlə əsərə çoxalar rəğbət.
Iкi şahdan bir кənd verilsə əgər,
Daha çox кənd verər bu şahzadələr.
Xəznə bəxş edən şah eşitdi sözü,
Səhərtəк gülərəк açıldı üzü.
Səmimi hissimi mənim duyaraq,
Şah qəbul eylədi təкlifimi, bax!
Mənim "həmdü sənam" xoşuna getdi,

Həmdünyan кəndini mənə bəxş etdi.
Verdi öz əlimə yazılı fərman,
Qızıl şahın möhrü üstündə əyan:
"Biz bəxş eyləmişiк bu кəndi ona,
Çatsın Nizaminin öz övladına.
Əvəzsiz verilmiş ona bu dövlət,
Qiyamətə кimi onundur, əlbət.
Inanmasa buna bir кimsə möhкəm,
Onun düşməniyəm, allah da həкəm.
Ona ziyan vursa əgər bir xəsis,
Vəhşət olacaqdır qisməti şəкsiz.
Zəmanə durduqca özü, övladı
Lənətə rast gəlsin, qalxsın fəryadı."
Düzəldiкdə işi fəqirin o gün
Qapısını açdı xəznənin bütün.
Bəzəndi qamətim şah xələtiylə,
Qəlbim də allahın mərhəmətiylə.
Bəxşişindən mənə verərəк fərman
Mürəxxəs eylədi öz hüzurundan.
Şah yanına getdim Məsud baxtıyla,
Yanından qayıtdım Mahmud taxtıyla.
Getdim, Кəbəyə mən həccaq кimi san,
Gəldim, sanкi Əhməd döndü meracdan.
Eşitdim кi, paxıl, gizlin cibкəsən,
Sən onların işin yaxşı bilirsən.
Surət Yusif кimi, batin canavar,
Paxlavada verər zəhəri onlar.
"Onlar heç bilərmi qədir, ey dünya?!
Edirsən onlara bir fərman rəva,"
Bir gəlin кi, ona qul ola göylər
Bir xaraba кəndə layiqdir məgər?
Кənd demə, andırır dar bir кürəni,
Yarımca ağacdır uzunu, eni.
Gəlirindən artıq onun xərci var,
Əкər yarılığa onu abxazlar.
Sahibsiz, кədərli bir xərabədir,

Müsəlman bişirir, кafirlər yeyir."
Paxılıma dedim: "Bunu bil, yəqin,
Küfranı nə lazım nemət yeyənin?
Oğru, lağım atan, de görüm, niyə
Mehtabtəк düşürsən bu viranəyə?
Sən bir həmdimə bax, "Həmdünyan" deyil,
Bir həmdim yaxşıdır beş-on кənddən, bil.
Iş və əкin varsa o кənddə əgər,
Mənim hər sözümdən behişt göyərər.
Dənli sünbülü var, o кəndin, nə qəm,
Mən də salxım-salxım dürr gətirmişəm.
Gur meşəsi vardır, söyləsən bu dəm,
Var qəmari uddan mənim yüz meşəm.
Onun buludundan axırsa Fərat,
Mənim dodağımda var abi-həyat.
Görünürsə indi xərabə, bərbad,
Şahın dövlətindən olacaq abad.
Qiymətli xəzinə ölкədir, inan!
Mən ucuz deyiləm qara torpaqdan.
Laкin bu qiymətə qaneyəm yenə,
Şüкrüm var allahın mərhəmətinə.
Mülк üçün etmirəm təşəккürü mən,
Ancaq ruhlanıram halal gəlirdən.
Bir xalvar sədəfdən yaxşıdır bir dürr,
Tufandan bir azca saf su üstündür.
Istəyirdi on кənd bağışlasın şah,
Xidmətim layiqdi bunlara, billah!
Şah gördüкdə vardır məndə qənaət,
Istəyimə görə verdi vilayət.
Dilimdə min dua, кönlümdə hümmət,
Hər gecə qazancım saysız var-dövlət.
Hər gecə mərdanə qılınc çəкərəк,
Dilimdə allaha dua edərəк,
Cəngavər кişitəк şücaətlə mən
Vururam кafərin boynunu həmən.
Mənim кi, mən şadam, bəxş edən razı,

Boşla füzulluğu, кəs bu avazı!"
Gör nə danışırdım, söz hara çəкdi,
Atım baş apardı, кənara çəкdi.
Növbə təblin çaldı şahım bir zaman,
Fitnənin tozunu sildi dünyadan.
Fələyə ucaltdı əzəmət tağı,
Bu yeddi iqlimi yandırdı dağı.
Təblinin nərəsi millər gedərdi,
Bu кöçməк təblidir, кim zənn edərdi?
Iкi aylıq yola təbli salmış səs,
"Şah кöçməк istəyir" deməzdi heç кəs,
O taxtda oturub çox az ömr etdi,
Şimşəкtəк tez doğdu, tez gözdən itdi.
Cavanlıq bağından yemədi bəhər,
Içmədi diriliк suyu Isgəndər.
Düşmən yarasından getdi dünyadan,
Düşmənlərə cəza versin yaradan.
Bu xaraba mülкdən qalxdı fələyə,
Torpaq ünsüründən döndü mələyə.
Dəniz yox oldusa, inciləri var,
Açılar bizimçün yenə qapılar.
Öz əslinə tərəf yönəldi əgər,
Öz yerində qalsın varis gövhərlər.
Ona rəhmət feyzi verdisə saqi,
Olsun varisinə bu dünya baqi!
Taxtabənd etdisə onu bu torpaq,
Taxtında əyləşən görsün кeyf-damağ.
O tacsız oldusa rəhmətə yetsin,
Indi tac qoyanlar uzun ömr etsin.
Xüsusən o şahlar mülкünə varis,
Dualara layiq, rəhmətə bais
Böyüк Nüsrətəddin - onun adından
Yaradılış almış nurunu, inan!..
Şahların pənahı böyüк Atabəy,
Firiduntəк olsun dövrə mübarəк.
Əbubəкr, Məhəmməd göstərərəк dad,

Ondan Əbubəкrü Məhəmməddir şad.
Yeddi ulduz olmuş elminə heyran,
Doqquz fələк onun quludur hər an.
Şahlıqda şahlara tac bağışlayar,
Dövlətdə şahlardan qalmış yadigar.
Taxtının ayağı ulduzlardadır,
Atının dırnağı fələyə çatır.
Ölкələr fəth etsin şahım hər zaman,
Yeni ölкələrə olsun höкmüran.
Dünyalar durduqca o şahlıq sürsün,
Dünyada doğrulsun arzusu bütün.
Ondan ayrılmasın səadət bir an,
Daim кöməк alsın bəxtiyarlıqdan.
Sözümü qurtardım səadətlə, bax,
Büкdüm çatan zaman bu yerə varaq.
Hər кim Nizamiyə söyləsə rəhmət,
Arzum budur, ruhu şad olsun hər vəqt.



## İZAHLAR

1

Davudtək könlümü təzələ hər an,
Qalxsın Zəburumun şöhrəti haman.

**Davud** - dini tarixə görə peyğəmbərlərdən biridir. Guya o, "Zəbur" adlı müqəddəs kitabın ehkamlarını məlahətlə oxuyarmış. Bədii ədəbiyyatda "ləhni-Davud" (Davudun səsi) gözəl səsə nümunə kimi göstərilir.

Nizami Davud dedikdə özünü, "Zəbur" dedikdə isə öz əsərini ("Xosrov və Şirin" poemasını) nəzərdə tutmuşdur.

2

Böyük Yaradanı duymağa meyar,
Dəlildən, qiyasdan başqa nə olar?!

**Qiyas** (müqayisə) və sübut (dəlil) vasitəsilə insan Allahın varlığını dərk ede bilər. "Doğmayıb, doğulmayan" Allahı başqa cür dərk etmək olmaz.

3

Altı yaxa açdı tərəflərə o,
Dörd gövhər bəxş etdi qara yerə o.

**Altı yaxa -** altı cəhətə (ön, arxa, sağ, sol, aşağı, yuxarı), dörd gövhər -dörd ünsürə (su, torpaq, od, hava) işarədir. Beytin mənası belədir: Altı cəhəti olan bu dünyanı Allah dörd ünsürdən yaratdı.

4

Hər mayeyə verdi ixlasdan nişan,
Bir işə yarasm hər bir yaranan.

Yəni kainatda hər nə varsa, onda özünə (Allaha) qarşı təmiz məhəbbətdən (ixlasdan) bir əlamət yaratdı ki, vecsiz, məqsədsiz olmayıb, bir işə yarasın.

5

Bütü İbrahimtək oxşa, əzizlə,
Ancaq bütxanəni ondan təmizlə.

**İbrahim** - dini rəvayətə görə peyğəmbərdir. Bütlərə sitayiş edənləri ağılsız adlandırıb, bütləri smdırdığı üçün guya Babil hökmdarı Nəmrud ibn Kuş onu oda atdırdıqda od gülüstana dönmüş, İbrahimi yandırmamışdır. Beytdə bu rəvayətə işarə edilir.

6

Qarı cəhrəsinə bax, qiyas apar,
Fələk çərxini də bir hərlədən var.

Qarılar cəhrənin çarxını hərlətməsələr, o fırlanmaz. Fələyin çarxını da dolandıran var, ona inan! **Qiyas apar** - müqayisə et demekdir.

7

O hər bir nəqşəyə vermiş bir camal,
Ulduzlar onlardan götürmuşdür fal.

Orta əsr münəccimləri yerdə və ya insan həyatında baş verən hadisələri ulduzların hərəkəti ilə müəyyənləşdirirdilər. Guya yer üzərində bədbəxtlik və xoşbəxtlik ulduzların hansı bürcdə, necə rastlaşmasından asılıdır.

8

Yetmiş iki iz var yolumda müşkül,
Yetmiş biri tikan, ancaq biri gül.

Nizami bu beytdə dünyada yetmiş iki əqidə olması haqda məşhur rəvayətə işarə edir. Lakin bu yetmiş iki əqidədən ancaq birinin (islamın) gül olduğunu irəli sürür. Bu beyt Məhəmməd peyğəmbərin tərifi zamanı deyilir.

9
Sözün Tuğan şahı girib meydana,
Qılmc verdi qələm Qaraxanına.

**Tuğan** - türk dillərində qızılquş, şahin deməkdir. Yəni sözun qızılquşu meydana girib, qələmin ulu xanına qılınc verdi.

10
Çəkdiyin əməye verməsək dəyər,
Səni Firdovsitək incitsək əgər...

Məlumdur ki, məşhur şair Əbülqasim Firdovsi özünün "Şahnamə" əsərini yazarkən Sultan Mahmud Qəznəvi onun hər beytinə bir qızıl verəcəyini vəd etmişdi. Lakin altmış min beytlik əsər bitdikdən sonra şah öz vədindən boyun qaçırıb, ona qızıl əvəzinə gümüş vermək istəmişdi. Firdovsi isə bu pulu rədd etmiş, ona olduqca kəskin bir hecv yazıb, Qəzədən qaçmışdır.

Nizami bu beytlə həmin ehvalata işarə edir.

1
Tamğaçı bağlasın hebəşi saça,
Şüştər zinətini bağlasın Çaça.

**Tamğaç** - Qədim Çin paytaxtının adı olmuş, çinli mənasında da işlənmişdir. Çaç Daşkəndin qədim adıdır. Yəni onun hökmü Çindən Həbəşə, Şüştərdən Çaça kimi rəvan olsun.

12
Göndərsin xaqanlar xəracı Çindən,
Qeysərlər cizyəni Rum ellərindən.

**Xərac** - məğlub edilmiş ölkədən alınan vergi, cizyə başqa dinlərə mənsub olanlardan xilafətə ödənilən vergiyə deyilirdi. Yəni Çin xaqanları sənin itaətində olub, xərac göndərsinlər. Rum qeysəri (xaçpərəst olub müqəddəs kitaba - "İncil"ə inandığına görə) cizyə versin.

13
Süleymandır, bizim şaha baxsana,
Gah balıq söz deyir, gah da Ay ona.

**Süleyman** - Davud peyğəmbərin oğlu olub, dini əfsanələrə görə, bütün canlılar üzərində hökmran olmuşdur. Burada işlədilən "balıq" və "Ay" (mah və mahi) "bütün dünya" məfhumunu ifadə edir.

Beytin mənası: bizim şahımız Süleyman kimi qüdrətli hökmdardır.

14
Dəbirlər zərgərlik kürələrindən
Qızıl da götürür, torpaq da bəzən.

Dəbir - yazan, katib deməkdir. Yəni şairlər də zərger kimi kürədən gah qızıl, gah da kül ələ gətirirlər.

15
Bir Əbu Cəfərin səxasına bax,
Mahmudtək Xorasan tutan olacaq.

Burada Nizaminin müasiri, Atabəy Əbu Cəfər Məhəmməd Eldəgiz Sultan Mahmud Qəznəvi ilə müqayisə edilir.

16 Bu adla fəxr edən hər iki dünya,
İki **"mim"** hərfindən taxmışdır sırğa.
"Aləm"də bir "mim" var, onda ikisi,
Bölmüşdür "aləmi" paxıllıq hissi.
Qələm türklərinə salaraq nəzər,
Bir "mim" tac bağışlar, bir "mim" də kəmər.

Nizami bu beytlərdə Məhəmməd Cahan Pəhləvanı tərifləyib, onun adında olan iki "m" hərfinə işarə edir. Şair ərəb əlifbası ilə “میم” sözündə olan "mim"lərin başda və ortada (kəmərdə) yazılmasını nəzərə alaraq, onun qələm gözəllərinə, yəni şairlərə tac və kəmər bağışladığını nəzərə çarpdırır.

17 Rumun başındakı qara səlibi,
Zəfər dişlərilə etdi mum kimi.

**Səlib - xaç** deməkdir. Rum qoşunları xristian dininə işarə olan xaç şəklini başda gəzdirirdilər.

18 Atabəy Eldəgiz "Əlvida" deyə,
Dörd təkbir söylədi yeddi ölkəyə.

Beytdə Atabəy Eldəgizin ölümünə işarə olunur. **Dörd təkbir** söyləmək -dörd dəfə "Allahu əkbər" deyib azan verməkdir.

19 Cəmşidi öldürmüş Zöhhak ilanı,
Sənə göy əjdəri vermişdir canı.

Əfsanəyə görə İranın qədim şahlarından olan Cəmşid çiyinlərində ilan bitən **Zöhhak** tərəfindən taxtdan salınmışdır.

Beytin mənası: özünə qürrələnən Cəmşidi Zöhhak məhv etdi. Lakin göylər sənə can bəxş etdiyi üçün əbədi yaşayacaqsan.

20 Süleymanda üzük, səndəsə din var,
İskəndərdə ayna, səndə ayin var.
Sən görən sirləri görərmi məgər,
Camda Cəm, aynada böyük İskəndər?

Dini əfsanəyə görə 124 min peyğəmbərdən biri. Olan Süleymanın **sehrli üzüyü,** Cəmşidin sehrli camı və yımanlı İskəndərin isə sehrli aynası varmış. Guya bütün dünyada olan hadisələr bunlarda görünərmiş. Nizami Məhəmməd Cahan Pəhləvanı mədh edərkən onu qüdrətdə Süleyman, Cəmşid və İskəndərdən üstün tutur.

21 Yolunda çaparam hər səhər erkən,
Şah Harutlarına zəng çalıram mən.

Dini əfsanayə görə **Harut** və **Marut** iki sehrkar mələyin adlarıdır. Bu beytdə şahın qulluqçularına işarə vurulur. Onlara zəng çalmaq - onların yuxusunu qaçırmaq, ayıq saxlamaq deməkdir.

22 Bu ikdiş Nizami qərib haldadır,
Yan sirkə dadır, yarı bal dadır.

**İkdiş -** metis deməkdir. Nizami özünün şeirlərini bala, şərt əxlaqını sirkəyə bənzədir.

23
Qapısına gələn qarışqa, inan,
Layiqdir qul olsun ona Süleyman.

Yəhudi peyğəmbərlərdən müdrik hesab edilən **Süleymana** işarədir. O, çəyirtkə ayağını hədiyyə gətirən qarışqaya öz bədənindən ağır yük gətirdiyi uçün üstünlük vermişdir.

Beytin mənası: Şahın qapısına gələn qarışqaya Süleymanın qul olacağına mübaliğəli işarədir.

24
Yolunun üstündə uçan bir milçək
Nəmrudun başına layiqdir, gerçək.

**Nəmrud** - eradan qabaq Musa peyğəmber zamanında yaşamış hökmdardır. O, Babil şəhərinin müəssisi kimi məşhur olub Allahlıq iddiası etmişdir axırda da bir çibinin onun burnuna girməsi ilə ölmüşdür.

25
Qılıncını çalsa dəryaya əgər,
Öküz də balığa: "Necesən?" deyər.

Əfsanəyə göre yer kürəsi öküzün, öküz də nəhəng balığın üstündə qərar tutmuşdur. Nizami mübaliğə tərzində deyir ki, şah dənizə qılınc vursa yer kürəsini lərzəyə salar.

26
Zöhhakın ilanı səni çalarsa,
Nə qəm, Firiduntək köməkçin varsa!

Guya Zöhhak çiyinlərində baş qaldıran ilanlara insan beyni yedirdirmiş. Dəmirçi Gavə döşlüyünü bayraq kimi qaldıraraq onu taxtdan salmış və Kəyan nəslindən olan **Firidunu** taxta oturtmuşdur.

27
Dünya - dərgahından kiçik bir tağdır.
Asiman da ona büllur əyaqdır.

**Əyaq** - piyalə deməkdir. Beytdə şahın cəlalı dünyada üstün tutulur.

28
Öz qardaşı ilə şah da həmişə,
Bu sayaq rəftarı etmişdir peşə.

Qızıl Arslanın qardaşı Atabəyə - Məhəmmed Cahan Pəhləvana işarədir.

29
Altmış yaşındaydı yazanda bunu,
Saxlaya bilmirdi yayda oxunu!

Nizami bu beytdə Firdovsiyə işarə edir. O, 60 yaşında ikən "Şahnamə" əsərində "Xosrov və Şirin" hekayətinə toxunmuşdur. Buna görə də o, məhəbbətin, eşqin fəğan və atəşini qabarıq şəkildə qələmə ala bilməmişdir.

30
Sözü bəzən qiblə, bəzən də Latdır,
Xəznəsi gah Kəbə, gah xərabatdır.

İslamdan qabaq ərəblər **Kəbədə** bütlərə sitayiş edirdilər. Bu bütlərin hərəsinə bir ad verilmişdi ki, onlardan biri də **Lat** idi

31
Qarun xəznəsitək torpaqda qalma,
Ustadsan, özünü ayağa salma.

**Qarun** eramızdan qabaq yaşamış ən dövlətli və ən xəsis bir şəxsdir. Klassik ədəbiyyatda xəsis dövlətli obrazı kimi o tez-tez misal göstərilir.

32
Olurdular şərab içdikcə şadab.

**Şadab olmaq** - şən, təravətli olmaq deməkdir.

33 **Qur** - yer adıdır.

34 Qara qanad qarğa çinədanından,
Zər yumurta verdi tutiyə bu an.

**Qara qarğa** - gecə; zər yumurta - günəş; tuti - gündüz timsalıdır. Beytin mənası: gecənin qaranlığı tükəndi, günəş çıxıb dünyanı işıqlandırdı.

35 **Sərsər -** çox berk və soyuq külək.

36 O ay xirmənləri gah geyir mişki...

**Mişki -** qara rəngli. Bu misrada gözəllər aya, paltarları isə qara buluda oxşadılmışdır.

37 Qələmlə mən naxış çəkən zamanda,
Mani "Ərjəng"ini pozar bir anda.

**Mani** - eramızın üçüncü əsrində yaşamış və "Ərjəng" ("Ərtəng") adlı əsər yazaraq onu müxtəlif şəkillərlə bəzəmiş və müqəddəs kitab kimi qələmə vermişdir. O, yeni məzhəb yaratdığını iddia etdiyi üçün öldurülmüşdür.

38 Dəri dürlərini deşdiyi zaman,
Belə nəql etmişdir bilici insan.

Dəri - ərəb istilasından sonra Şərqi İran və Əfqanıstanda yaranmış fars dili. Ümumiyyətlə dəri dili fars dilinin sinonimidir.

Beytin mənası: bilici insan, fars (dəri) dilində incə rəvayətlər söylədi.

39 **Rəmgilə** - yer adıdır.

40 Sincab örtüyünə bürünmüş dövran,
Vaşaq rəngli paltar geydiyi zaman,
Gecənin samuru yerindən endi,
Gündüz qaqumundan qaçdı, gizləndi.

Bu beytlərdə Nizami dan sökülüb səhər açıldığını, günəşin çıxdığını qara və ağ tüklü heyvanlarla bağlı surətdə ifadə etmişdir.

**Sincab** - boz rəngli ərəb dovşam (alaqaranlıq simvolu), vaşaq (vəşəq) -sarı rəngli, yumşaq tüklü heyvan (üfüqün saralmasına işarədir).

Qaqum - dovşan ailəsinə mənsub ağ dərili heyvan (gündüzə işarədir).

Beytin mənası: boz rəngə bürünmüş dövran yavaş-yavaş saraldı, nəhayət, gecənin alaqaranlığı gündüzün işığından qaçıb gizləndi.

41 Qılınc oynatmaqda o birincidir,
Xətiblərə zəfər qılıncı verir.

**Xətib** - xütbə oxuyana deyilir.

Beytin mənası: şah qılınc oynatmaqda mahir olduğu üçün xətiblərə zəfər qılıncı bağışlayır.

42 Orda şahın Ferxar kimi qəsri var...

**Fərxar qəsri** - Tibetdə olan böyük bir bütxanə və qəsrin adı olmuşdur. Qədim səyyahlar bu bütxanənin əzəməti qarşısında heyran qalmışlar.

43 Şirinə üz tutdu kənizlər yeyin,
Benatinnəş ikən oldular Pərvin.

**Bənatinnəş** - Böyük ayı bürcündə bir-birindən aralı olan yeddi sabit ulduza, **Pərvin** İsə bir-birinə yaxın görünən Ülkər ulduzlarına deyilir.

Beytin mənası: qızlar dağılmış olduqları halda birdən Şirinə tərəf qaçdılar və Pərvin kimi toplaşdılar.

44 Qorxuram sürətdən və hərarətdən,
Atəş su altında coşar gedərkən.

Nizami Şirini lətafətdə suya və onun atı Şəbdizi qızğınlıqda oda bənzətmişdir.

Beytin mənası: qorxuram qızğın at baş alıb səni (Şirini) qaçırar.

45 Göyün Şərası da fətyad qopartdı,

**Şəra** - parlaq ulduzdur. Yəni Şirinin ağ bədənini görcək Şəra ulduzu həsəddən fəryad qopartdı.

46 Sincab üzərinə qaqum düşəntək,
Gümüş bədən batdı suya girərək.

Sincab - gecə simvolu, qaqum - gündüz simvolu.

Beytin mənası: gündüz gecəni qovan zaman (səhər çağı) ağ bədənli Şirin suya girdi (çimdi).

47 Ay deyil, civəli bİr ayna - gümüş,
Civədən bir Nəxşəb ayı tökülmüş.

Əfsanəyə görə Müqənnə adlı bir sehrkar dəmirdən Nəxşəb şəhərində ay düzəldib. Gecələr bu ay guya quyudan çıxıb ətrafı İşıqlandırarmış.

48 Nə dili, nə də ki, dilbəri gördü,

**Dil** - ürək, **dilbər** - ürəyi ələ alan.

49 "Alışıb yanaydı bu mərdümgiyah"
Deyərək qəlbindən çəkdi odlu ah.

**Mərdümgiyah** sözü "adamotu" mənası verib, müasir istilahda "jenşen" adlanan bitkidir.

Beytin mənası: Xosrov fiirsəti əldən verdiyinə görə özünü danlayır və bacarıqsızlığına görə özünü "adamotu" adlandırır.

50 Oradan yollandı birbaş Ağ bağa.

**Ağ bağ** - Bərdədə şah bağı.

51 Kömür - hindistanlı bir atəşpərəst,
O da Zərdüşt kimi oxuyur "Avəst".

Burada kömürün qara rəngi qara mənası verən "hindu" sözü ilə ifadə edilmişdir. Onun od yaratması isə atəşpərəstlərə bənzədilmişdir. Zərdüşt -atəşpərəstlərin peyğəmbəri, "Avesta" isə onun dini kitabı İdi.

Beytin mənası: kömür odu sevdiyi üçün Zərdüşt kimi "Avesta" oxuyurdu. (Kömür yanarkən çırtıltı səslərinə işarədir).

52 Yemək vaxtı Xosrov möbidə dedi,
"Bacubərsəm" rəsmin icra eylədi.

**"Bacubərsəm"** rəsmi - zərdüştilərin dini qaydalarından biri. Onlar yemək vaxtı süfrə başında sükut edib dua oxuyarlar.

Xosrov möbidə yemək vaxtı sükutla dua oxumasını tapşırdı.

53 Açıb zöhrə kimi əl-qol hər biri,
Mizana qoyurdu orda dəyəri,

**Zöhrə** (Venera) səyyarəsi öz hərəkəti zamanı Tərəzi (Mizan) bürcündən keçdiyi üçün Nizami "Zöhrə kimi mizana qoyurdu" bədii təşbehini işlətmişdir.

Digər tərəfdən zöhrə əsatirə görə gözəllik və məhəbbət İlahəsi hesab edildiyindən Şirini əhatə edən gözəllər ona oxşadılmışdır.

54 Ədalət Yusiftək qaçdı divandan,
Ona çəkdi Yəqub dağını zaman.

Şərqdə məşhur ola Yəqub və onun sevimli oğlu Yusifə işarədİr.

**Yəqub** - dinlər tarixində peyğəmbərlərdən biridir. Yəqubun 11 oğlu olmuş və bunlardan ən kiçiyi Yusifi çox sevdiyindən o, qardaşlarının həsədinə səbəb olmuşdur. Məşhur "Yusif və Züleyxa" dastanında Yəqub əsas surətlərdən biri kimi təsvir edilmişdir. Yəqub dörd yol ayrıcında "Beytülhəzən" adlanan bir otaq qurduraraq oğlunu gözləmiş, ağlamaqdan gözləri kor olmuşdur. Bədii ədəbiyyatda Yəqub oğul fərağı çəkən bir ata kimi tez-tez xatırlanır.

55 Bir neçə qarınca söylədi pünhan:
"Biri Bilqeyisdir, biri Süleyman".

Beytdə Şirin Bilqeyisə, Xosrov isə Süleymana oxşadılmışdır.

56 Günəş ordusunun ilk kəşfiyyatı,
Bürcislə Zöhrəyə nizələr atdı.

Birinci misra günəşin şüalarını göstərir. Səmada ən parlaq səyyarələrdən biri olan Zöhrə (Venera) və Bürcis (Yupiter) belə bu şüaların təsiri ilə görünməz oldu. Yəni gecə keçdi, səhər açıldı.

57 Vurdu filqulağı öküzgözünə.

**Filqulağı,** öküzgözü - çiçək adlandır.

58 Müfərrəhlə olmuş nəsimi dəmsaz,
Ətrindən müşklər edirdi pərvaz.

**Müfərrəh** - bitkilərdən alınan, şadlıq gətirən dərmandır.

59 Taxt önündə Şapur dayanmışdı tək,
"Gənci-badavərd"in xəznədarıtək.

**"Gənci-badavərd"** - hərfi mənası yellə gələn xəzinədir. Burada təsnif adı kimi işlənmişdir.

60 Xoşbəxtlik iqbalın əlini açdı,
Müştəri Zöhrəyə gəlib yanaşdı.

Nizami Xosrovun Şirinə yanaşmasını Müştəri (Yupiter) səyyarəsinin zöhrəyə (Venera) yanaşması ilə müqayisə edir. Hücum elmində Müştəri (Bürcis) oğlan, Zöhrə isə qız kimi təsvir edilir.

61 Müştəri olarkən nilinə möhtac,
Nil çayında olsan, yükünü sən aç!

Beytdə **Nil** - sözünün iki mənasından istifadə edilmişdir. Birinci misrada **nil** - isti ölkələrdə yetişən bitkidir ki, ondan nəqqaşlıq üçün mavi rəng hazırlayardılar.

İkinci misradakı Nil Misirdən keçən məşhur çayın adıdır.

62 Fələk yaqut rəngli camı uzatdı,
Bir udum içirdib yeri qızartdı.

Yaqut rəngli cam – günəş deməkdir. Beytin mənası: günəş çıxıb aləmi al rəngə boyadı.

63 Qüstəntəniyyəyə birbaşa gəldi.

**Qüstəntəniyyə** - İstanbulun köhnə adıdır.

64 Əyyuqa yüksələn canlı vizələr,
Bayraq camlarını qızartdı yeksər.

**Əyyuq** - kəhkəşanda olan bir ulduzun adıdır. Məcazi mənada nizələrin çox yüksək qaldırıldığı bildirilir.

65 Pilpayı qaldırıb Bəhrama çaldı...

**Pilpay** sözünun lüğəti mənası fil ayağı deməkdir. Orta əsrlərdə pəhləvanların döyüşdə işlətdiyi əmud şəkilli hərbi silahdır.

66 Bu dünya minmişdir ala bir ata,
Güman var ki, bu at çox təpik ata.

**Dünyanın ala ata minməsi** gece və gündüzə işarədir. Beytin mənası: ağ və qara rəngli olan (ikiüzlu) bu dünyada hələ çox fəlakətlər baş verə bilər.

67 Ay yüksələn zaman Balıq burcündən,
Pərviz Şah bürcündə salmışdı məskən.

**Balıq bürcü** - səmada on iki bürcdən sonuncusudur. Ay öz hərəkəti zamanı bu bürcdən keçir. Yuxarıdakı beytdə Nizami Xosrov Pərvizin Şah bürcundə (yəni qalada) məskən saldığını göstərir.

Bu səhifədə Nizami ulduzlar aləmindən bəhs edərək günəş və onun ətrafında hərəkət edən səyyarələrin bürclərdən keçməsini və bir-biri ilə qarşılıqlı əlaqələrini təsvir etmişdir.

68 Sövr Zöhrə ilə, Xərçəng Bürcislə,
Səadət yayırdı Təsiis Təsdislə.

Burada **Sövr** - Ökuz bürcü, **Zöhrə** - Venera səyyarəsi, **Xərçəng** bürc adı, **Bürcis** - Yupiter səyyarəsidir. Bu səyyarələrin göstərilən bürclərdən keçməsi guya yerdə səadət yaradarmış, **Təslis** - üçləşmə, **Təsdis** - altılaşma deməkdir.

69 Gah badamdan qəndə su çiləyirdi,
Gah fındığı innabla dişləyirdi...

Burada **badam -** göz; qənd - yanaq; fındıq - dodaq deməkdir. Beytin mənası: Şirin göz yaşı ilə üzünü isladır və ara-sıra dodağını dişləyirdi.

70 Yuxusuz gözünə səpirdi duzu,
Nərgizdən laləyə axıdırdı su.

Bu beytdə bədən üzvləri çiçəklərə bənzədilmişdir. Burada nərgiz — göz, lalə - üz deməkdir.

Beytin mənası: yuxusuz qalaraq ağlayır və gözlərindən axan yaşla yanağını isladırdı.

71 Qarınqulu olma gücsüz bir qurdtek,
Yeməkdə belini qarışqatək çək.

Burada **qurd** sözü həşərat mənasında işlənmişdir. Təşbeh üsulu ilə şair qarınqulu olmamağı, qarışqalar kimi beli incə saxlamağı tövsiyə edir.

72 Necə oğulsan ki, hörmət edirsən
Atam öldürən bir hinduya sən?

**Hindu** sözünün üç mənası var: I hindli, II - qara, III - quldur. Nizami həmin beytdə hindu sözünü üçüncü mənada işlədərək dünyanı can alan ğuldura bənzətmişdir.

73 Gülgünün belinə yəhər qoyuldu,
Şapur, rikabında bir kölgə oldu.

**Rikabda getmək** atlının arxasınca getmək deməkdir. Yeni Şapur Gülgünə minən Şirinin ardınca getdi.

74 "Gənci-gav" başladı, coşdu üfüqlər,
Yer öküzün verdi, nisar etdi zər.

**"Gənci-gav"** orta əsrlərdə Azərbaycanda musiqi ilə oxunan havalardandır. Lüğəti mənası "öküz xəzinəsi" deməkdir. Beytin ikinci misrasında "öküz" və "zər" sözləri də həmin "Gəncigav"la bağlıdır.

Beytin mənası: "Genci-gav" havasını şövqlə oxumağa başlarkən dünya cuşa gəldi.

75 "Naqusi" və "Övrəng" çalınan zaman,
Zəng səsi qalxırdı övrəng taxtından.

Bu səhifədəki beytlərdə işlənən istilahlar orta əsr musiqi havalarının adlarıdır ki, tərcümə edilməmişdir. Bu beytdə "Övrəng" sözü həm musiqi havası, həm də şah taxtına işarədir.

76 "Sazi-novruz"unu çalanda tamam...

Bəzi nüsxələrdə **"Nazi-novruz"** getmişdir.

77 "Kini-Səyavuş"a vuranda barmaq
Səyavuş qanıyla dolurdu qulaq.

**"Kini-Səyavuş"** bir musiqi ahənginin adıdır. "Şahnamə" surətlərindən biri olan Səyavuşun adı ilə bağlıdır. İran padşahı Keykavusun oğlu Səyavuşun başı Turan padşahı Əfrasiyab tərəfindən kəsildiyindən Keykavus və əfsanəvi

pəhləvan Rüstəmi-Zal onun qisasını almaq üçün "Kini-Səyavuş" deyə böyük müharibələrə girişmiş, beləliklə də, İran - Turan müharibələri bir az da qızışmışdı.

Beytin mənası. "Kini-Səyavuş" havası çalındıqca onlar böyük həvəslə qulaq asır və cuşa gəlirdilər.

78 "Kini-İrəc"inə açanda meydan,
Qisasa başlardı təzədən cahan.

**"Kini-İrəc"**də bir musiqi ahənginin adıdır. "Şahnamə" surətlərindən İrəcin adı ilə bağlıdır. Dəmirçi Gavə Zöhhakı taxtdan salıb, Cəmşid nəslindən Firidunu taxtda oturtdu. Firidunun üç oğlu oldu: İrəc, Tur və Səlm. Firidundan sonra Tur Səlm ilə birləşib şahlığın yaxşı hissəsinə varis olmuş qardaşları İrəci öldürmüşdülər. Sonra İrəcin oğlanları atalarının qanını almaq üçün "Kini-İrəc" deyə əmiləri ilə müharibələr aparmışdılar.

Beytin mənası: "Kini-İrəc" havası o qədər gözəl çalınırdı ki, eşidənlər qisas almaq üçün cuşa gəlirdilər.

79 Arvad bir güldana əkilmiş güldür,
Bayırı gözəldir, içisə "güldür.

Bu beytdə gül sözunün iki mənası var. Cinas yerində işlənmiş bu söz birinci misrada gəfil, ikinci misrada hiylə, kələk mənası verir. Atalar sözündə gül vurmaq - aldatma deməkdir.

80 Sol böyürdən olmuş qadın, deyirlər,
Soldan sağı ummaq olarmı məgər?

Dini əfsanəyə görə, Allah qırx gündə Adəmi palçıqdan yaratmış və sonra tək qalıb darıxdığı gördükdə onun sol qabırğasından Həvvanı vücuda gətirmişdir.

Beytin mənası: qadın sol (eyri) böyürdən yarandığı üçün ondan düzlük gözləmə!

Fars dilində çəp (sol), rast (sağ) sözləri eyni zamanda əyri və düz mənası verir.

81 Üz qoymaq istəsə ay üzə əgər,
De: şah olarmı heç rüxə bərabər?

Bu beytdə işlədilən şah və rux sözləri ikimənalıdır. Beytin birinçi mənası: Şah Xosrov, Şirinin ay üzünə üz qoymaq istərkən onun şahlığı Şirinin camalına dəyməzdi.

Şahmat oyununda rux top fıquruna deyilir. (Farsça lüğəti mənası isə yanaq, üz deməkdir). Bu nöqteyi-nəzərdən, beytin ikinci mənası belə olur: top topla yanaşı durduğu zaman şah mat qala bilər.

82 Çənədən top qapmaq istəyən zaman
Üzümdəki saçdan yeyəçək çövkan.

Beytdə orta əsrlərdə at üstündə oynanılan "küy və çövkan" oyununa işarə edilir. Nizami Şirinin çənəsini topa (guy), onun saçlarını isə çövkana (ucu eyri ağaca) bənzətmişdir.

Beytin mənası: mənim çənəmə əl vurmaq istəyən (Xosrov) saçlarımdan zərbə yeyər.

83 Hindlitək eylədi səcdə pəriyə,
Sanki Ütariddi o, Müştəriyə.

Bıırada hindlilərin buddaya və mələk heykəllərinə səcdə etməsi ən kiçik olan Ütarid (Merkuri) səyyarəsinin ən böyük səyyarə olan Müştəriyə (Yupiterə) münasibəti kimi göstərilir.

Beytin mənası: Xosrov, hindlinin buddaya pərəstiş etdiyi kimi ona baş əydi, bu zaman Şirinin qarşısında özünü çox kiçik gördü.

84 Həndəsə elminde xariqə saçar,
"Məçəsti", İqlidis sirrini açar.

**İqlidis** (Evklid) - qədim Yunanıstanın ən böyük riyaziyyatçılarındandır; riyaziyyatın banisi hesab olunur. "Məcəsti" - Bətlimusun (Ptolomey) dünyanın quruluşu haqqında yazdığı əsərinin adıdır.

85 Div dəmirdən qorxar, çadu südabdan...

**Südab -** pis iy verən bir aqac növüdür, sehrlə məşğul olanlar onun iyindən xoşlanmazlar.

86 Pərviz, Şirin, Fərhad - bu sözlərin, bax,
Hərəsinin vardır beş hərfi ancaq.

Ərəb əlifbasında səsli hərflərin bəzisi düşdüyü üçün bu adların hər birisi beş hərflə yazılır.

Beytin mənası: nə üçün adlarda hərflərin miqdarı eyni olduğu halda, biri bədbəxt, digəri xoşbəxtdir?

87 O xəznə altında olmuşdu səqət...

**Səqət olmaq** - xarlıqla ölmək, gəbərmək deməkdir.

88 İsa kimi girər elə bir deyrə,
Görünməz, düzülsə çıraq hər yerə.

**Deyr** - monastır, kilsə deməkdir.

89 Bu çöl torpağında çox qan axmışdır,
Sanma bir Səyavuş yerdən qalxmışdır.

Səyavuş Firdovsinin məşhur "Şahnamə" əsərinin surətlərindən olub, İran padşahı Keykavusun oğludur.

Beytin mənası: bu çöl torpağına axan qanlardan canlı adamın dünyaya gələcəyinə ümid etmə!

90 Turuncdan qaçmasan Yusiftək əgər,
Züleyxa narınctək səni tez kəsər.

"Yusif və Züleyxa" dastanına işarədir. Poemada Yusifin eşqində Züleyxanı töhmətləndirən qadınlara cavab olsun deyə, Züleyxa onları narınca qonaq edir və qadınlar narıncı kəsdikləri zaman Yusif otağa daxil olur. Qadınlar Yusifin gözəlliyinə heyran qalıb narınc, əvəzinə barmaqlarını kəsirlər.

91 Göy Nəsri-tayiri sənə vurulmuş...

**Nəsri-tayir** - səmada yanaşı iki işıqlı ulduzun biridir.
İkincisi Nəsri-vaqe adlanır. İslamdan qabaq ərəblər bu ulduzlara sitayiş etmişlər.

92 Məryəmtək o Məryəm oruc tutaraq,
Şahın şəgərindən düşdü çox iraq.
Necə çəng-Məryəmdən qurtarar zahı,
Məryəmdən qurtardı dünyalar şahı.
Məryəmin vücudu köçdü aləmdən,
Məryəm ağacıtək şah çıxdı qəmdən.

Bundan sonrakı sətirlərin bir çoxunda Xosrov Pərvizin arvadı Məryəm İsanın anası Məryəmlə müqayisə edilir. Məryəmin oruc tutması, **Məryəm aqacı** - ikinci Məryəmlə əlaqədardır.

Beytlərin mənası: arvadı Məryəm vəfat etdikdə Xosrov sevindi və azad nəfəs almağa başladı. Cəngi-Məryəm bitki adıdır, doğuşu çətin keçirən hamilələrə verərmişlər.

93 Bu dünyanın vardır ikiçə rəngi:
Bəzən rumlu olur, bəzən də zəngi.

Klassik poeziyada **rumlu** - ağ rəng, zəngi - qara rəng mənasında işlədilmişdir. Burada dünyanın ikiüzlü olmasına da işarə edilir.

94 Zamanın Cəmşidi, dünya günəşi
Örtüb çadırıyla Bənatünnəşi.

Beytin mənası: günəş çıxan zaman öz nuru ilə ulduzlar üzərinə bir pərdə çəkdi.

95 Yaxşısı budur ki, Məryəmi unut,
İsaya dönsən də, qayıtmaz vüçud.

Birinçi misrada adı çəkilən Məryəm Xosrovun vəfat etmiş arvadıdır. Dini əfsanəyə görə, İsa peyğəmbər ölüləri dirildə bilərmiş.

Beytin mənası: arvadın Məryəm ölmüşdür. Əgər Ölüləri dirildə bilən İsa da olsan, onu bir də geri qaytara (dirildə) bilməyəcəksən.

96 Elə ki bəzmdən əl üzdü Məryəm,
"Məryəm bəzmi" kimi şah oldu xürrəm.

Beytin mənası: Məryəm şadlıq məclisindən əl uzən zaman şahın kefı açıldı, şad oldu.

97 O taxt taxt deyildi, bir asimandı,
O şah şah deyildi, sahibqərandı.

**Sahibqəran** - qərinə, əsr sahibi deməkdir. Şair burada şahın taxtını səma qədər yüksək, özünü isə zəmanənin ağası kimi mübaliğə ilə göstərir.

95 Gecə qaranlıqdı, Dağın üstünə,
Sanki qara qarğa qonmuşdu yenə.

Nizami öz əsərlərində gecənin qaranlığını çox zaman qara qarğaya bənzətmişdir.

99 Təbilçi əlini vurmuşdu ilan,
Ulduz ayağına batmışdı tikan.

Səhər açılanda təbil vurulur, həm də ulduzlar uçurlar. Burada şair demək istəyir ki, elə bil ulduzların ayaqlarına tikan batıb, uçmur, təbilçinin də əlini ilan vurub, səhərin açılmasını xəbər vermir.

100 Nə Zənd oxumağa möbiddə dil var,
Nə qanad çalmağa mayildi quşlar.

Nizami bu və bundan sonrakı beytlərdə səhərin açılmadığını göstərir.

101 Qızıl bayrağını açanda aləm
Dağılmış qoşuntək qaçıb getdi qəm.

Burada **aləmin qızıl bayrağı** ifadəsi günəşə, dağılmış qoşun ifadəsi ulduzlara işarədir.

Beytin mənası: sohər günəş doğan zaman ulduzlar yoxa çıxdığı kimi, Xosrovun da qəmi dağılıb getdi.

102 Gaviyan bayrağı çox ucalmışdı,
Şahın ay üzünə kölgə salmışdı.

**Gaviyan bayrağı** əslində Drəfşi-Gaviyani tərkibi ilə ifadə edilmişdir. Drəfşi-Gaviyan "Şahnamə"dəki Gavənin dəri döşluyünə verilən addır. Beytin mənası: şahın bayrağı ucalaraq, onun üzünə kölgə saldı.

103 Şaxtanın gücündən donmuşdu hər yan,
Qılınc yaradırdı ipək sulardan.

Beytin mənası: şaxta o qədər şiddətli idi ki, ipək kimi olan sular donaraq nizə və qılınca oxşayırdı.

104 Qəmari ud yanır, ağac qovrulur,
Elə bil yağırdı havadan kafur.

**Qəmari ud** - Qəmər yerinə məxsus ud, ətirli maddə.

**Kafur** - kamfora - xoş ətrə işarədir.

Beytdə təbiətin ruh oxşayan bir zamanı olduğu qeyd edilir.

105 Şəfəq təbibləri girdi meydana,
Çərtib boyadılar onu al qana.

Beytin mənası: səhər açılarkən üfüq qan rənginə boyandı.

106 Tündlükdən əl çəkib, bir az yumşalsam,
Dünyada Veysətək olaram bədnam.

Fəxrəddin Gürganinin "Veys və Ramin" poemasındakı Veysə işarədir,

107 Ütarid cüt bürclü olsa, yeri var.
Sən günəşsən, sənə bir bürc yaraşar.

Nücum elminə görə: səyyarələrdən **Ütarid** (Merkuri) Öz hərəkəti zamanı **Cövza** (Əkizlər) və **Sünbülə** bürclərindən keçdiyi halda, Günəş ancaq Əsəd (Şir) bürcündən keçir.

Ütarid kiçik səyyarədir; o, günəşə çox yaxın olduğundan həyat əlamətlərindən məhrumdur.

108 Səğlab banusiydim - bir gözel çiçək,
Qalmışam şüşədə indi gülabtək.

**Səğlab -** Danub çayı sahilində yaşamış slavyan tayfasıdır ki, bu tayfanın gözəlləri nümunə kimi göstərilmişdir. Banu - xanım deməkdir.

109 Hindularım hələ atəşpərəstdir.
Sərxoş türklər kimi gözlərim məstdir.

Burada qara gözlərim mənasında işlədilmiş hindularım - Şirinin hiddet və qəzəbini ifadə edir.

Beytin mənası: qara gözlərim od saçır, onlar sərxoş türklər kimi məstdir (yəni onlardan xəta baş verə bilər).

110 Maral gözlərimə çox həsrət çəkər,
Tökər kirpiyimdən tiryək yox, zəhər.

**Tiryək** iki mənalı sözdür. O, həm insanı məst edici zəhərli maddə, həm də ilan zəhərini məhv edən dərmandır. Bu beytdə ikinci mənada işlənmişdir.

111 Şirinə şəkərdən dəm vurma, bir bax,
Qəssabdan qəsəbbaf durur çox uzaq.

**Qəsəbbaf -** kətan toxuyan.

Beytin mənası: **Qəssabla qəsəbbafı** müqayisə etmək Şirinlə Şəkəri müqayisə etməyə bənzər. Yəni - Şirin Şəkərdən üstündür.

112 Qazandakı hələ bişməyib, xamdır,
Halva hazır deyil, iş natamamdır.

Beytin mənası: sənin şüurun həle yetişməyibdir, sən helə kamil deyilsən.

113 Belə yumşaqlıqla sərtlik nə gərək?
Qaquma yaraşmaz olsun kirpitək.

**Qaqum** - yumşaq dərili sincabdır (dovşan fəsiləsindən). Beytin mənası: sən qaqum kimi yumşaq ikən, kirpi kimi iynəli olma (sancma).

114 Ləli uzərindən mərcanı açdı.
Gövhərləri düzdü, mirvari saçdı.

Yəni Şirin sözə başladı.

115 Qalmadı şüardan bir "şəir" də tək,
Ərəbcə bilmirsən - bir "arpa" demək.

Burada şüar sözü şəir (arpa) sözü ilə qarşılaşdırılır.

Beytin mənası: verilən vədələrdən bir arpa qədər də əlamət qalmadı.

116 Yüz Yusif yuxusu əzbərin olsa,
Yenə də hamansan, eşşək və İsa.

"Yusif və Züleyxa" dastanmda Yusif həbsdə ikən məhbusların yuxusunu yozur və hadisələr də onun dediyi kimi baş verir. Sonra Əzizi-Misr yuxu görür. Yusif onun da yuxusunu düz yozub ölkəni üz verəcək qəhətlik və fəla-

kətdən xilas edir. Buna görə də yuxu yozmaqda Yusif şöhrət tapır. İsa peyğəmbər isə həmişə eşşək minib gəzərmiş, məlumdur ki, kimin minməyindən asılı olmayaraq

eşşək yenə də eşşəkdir. Bu barədə, Nizami kimi, Sədi Şirazi də demişdir: İsanın eşşəyini Məkkəyə də aparsalar, yenə də hacı olmayıb, eşşəkliyində qalar.

117 Bir deyləm idin sən, indi şah oldun,
Baltanı sataraq bir nizə aldm.

**Deyləmilər** Gilan vilayətində hərbcu bir tayfanın adıdır. Eyni zamanda deyləm qul mənası verir. Yəni sən qul ikən şahlıq rütbəsinə yüksəldin.

118 Babil Harutusa onun camalı,
Hindu cadugərsə o qara xalı.

Beytin mənası: camalı mələk qədər gözəl idi, qara xalı sehrlər yaradırdı.

119 Şirin bu səfram özü duymuşdu.
Şəkərin altına sirkə qoymuşdu.

**Səfra** - sarılıq və ödə işarədir. Məlum olduğu kimi, öd acılıq əlamətidir. Beytin mənası: Şirin bu acılığı özü yaradırdı, o, şirin dilinin altına sirkə tökmüşdü; yəni: Şirin nazlanaraq qəsdən acı danışırdı.

120 Yarımcan quş kimi səndələyirdi,
Nərgizdən səmənə dürr ələyirdi.

**Nərgiz** - göz; **səmən** - yanaq; **dürr** - göz yaşı deməkdir. Beytin mənası: həyəcandan çırpmaraq gözlərindən yanaqlarına inci dənələri axıdırdı (ağlayırdı).

121 Manqala dönmüşdu əlindəki ud,
Könüllər yanırdı onda, sanki ud.

**Ud** sözünün iki mənası var. O həm çalğı aləti, həm də ətirli maddə adıdır. Beytin mənası: Onun əlindəki ud (çalğı aləti) manqal xasiyyəti daşıdığından ud (ətirli maddə) kimi öz nəğməsilə könülləri yandırırdı.

122 Barbədlə çənk səsi axıb, muxtəsər,
Tük ilə rəng kimi birləşmişdilər.

Nizami bu beytdə musiqi sənəti ilə rəssamlıq sənətini yanaşı qoymuşdur.

123 Sənin şəkər dolu dodaqlarından
Qeyri, badamıma olmaz toxunan.

Beytin mənası: mənim gözlərimdən öpməyə ancaq sənin ixtiyarm vardır. Bu səhifədəki beytlərdə Şirinin bədən üzvləri müxtəlif meyvələrin adı ilə ifadə edilmişdir:

**Badam** - göz; püstə, **innab** - dodaq; **nar, narınç** - məmə; **alma** - yanaq və s.

124 Pis gözdən gizlənən abi-həyattək
Məndən yayınmısan, bu nəyə gərək?

**Abi-həyat** - dirilik suyu; guya insanların gözündən iraq yerdə - zülmətdə imiş, ancaq Xızr bu sudan içərək, ölməzlər cərgəsinə daxil olmuşdur.

125 Sərxoş əyyar kimi göstərib ülfət,
Səcdə etdi şaha o gözəl afət.

**Əyyar** - olduqca çevik, sürətlə qaçan, bacarıqlı, əlindən hər iş gələn adama deyilir.

126 Yenə Xosrov dedi: "Bu ulduz cinni,
Nəyə minmiş, söylə, bir kəs bilirmi?"

**Ulduzun cirmi** - onun kütləsi deməkdir. Xosrov bilmək istəyir ki, ulduzları fəzada saxlayan qüvvə nədir.

127 Çoxları bu işə meylini vermiş,
Rəsəd göstərdi ki, mahaldır bu iş.

**Rəsəd** - ulduzlar aləminin tədqiqi deməkdir. Buna görə də rəsədxana müasir elmi dildə observatoriya adlanır.

128 Qolu yorulsa da, zillət çəkərək
Tutub küngürədən yapışar bərk-bərk...

**Küngürə** - qala divarlarının üstündə olan diş-diş çıxıntı. Yıxılmamaq üçün bu "diş"dən tutan adamın qüvvədən düşüb onunla birlikdə yıxılacaqı göstərilir.

129 Büzürgümid birdən açıldı gültək,
Qırx məna açdı, qırx nağıl deyərək.

Büzürgümid bu beytdən sonra məşhur hind əfsanəsi, alleqorik təmsillərdən ibarət olan "Kəlilə və Dimnə"dən ibrətamiz hekayətlər söyləməklə şaha təsir göstərir.

130 Fələklər zicini cədvəlbəcədvəl,
Fikrin üstürlabı eyləmişdir həll.

**Ziç** - ulduzların mövqeyini və səyyarələrin mədarım göstərən cədvəl, ustürlab həmin cədvəli tərtib etmək üçün xüsusi alətdir.

131 Xətləri müxtəlif olan nöqtədən,
İlk gələn hərəkət “Əlif”di bil sən.

Əlif - ərəb (fars) əlifbasının ilk hərfinin adıdır. Bu hərf iki nöqtəni birləşdirən düz şaquli xətdir. Sonrakı beytlərdə xətlərin çarpazlaşmasından cisimlərdə səth (bəsit) və həcmin yaranması göstərir,

132 Dünya Zöhhak kimi qan içəndir, qan!
Sənə öz arxandan yaratdı ilan.

Firdovsinin "Şahnamə" əsərində təsvir etdiyi qaniçən Zöhhaka işarədir. Zöhhak çiyinlərindən çıxan ilanlara insan beyni yedirərmiş. Beytin mənası: bu qaniçən dünya sənin qatilin olmaq üçün öz belindən bir ilan yaratdı.

Burada **ilan** - Xosrovun Məryəmdən olan oğlu qatil Şiruyəyə işarədir.

133 Quyuya düşsən də, olma pərişan,
Yusifi xatırla, təmkinlə dayan!

Beytdə məşhur "Yusif və Züleyxa" dastanına işarə edilir. Yusifi öz qardaşları paxıllıqdan quyuya salıb getdikdən sonra tacirlər quyu başına gəlir və

Yusifi tapıb ölümdən xilas edirlər. Nizami də bununla çətinliyə düşərkən ümidli olmağı təbliğ etmək istəmişdir,

134 Dünyada nə qədər rus var, zənci var,
Bundan daha yaxşı toy etməz onlar.

Bu beytdə **rus** - ağlıq əlaməti kimi gündüzə, zənci - qaralıq əlaməti kimi gecəyə işarədir. Beytin mənası: dünya durduqca bundan yaxşı toy edilməyəcəkdir.

135 Nə uçmaq mümkündür, üstündə çənbər,
Nə onun bəndini aça bilərlər.

**Çənbər** - halqa, çəpər, örtü, tor deməkdir. Şair özünü tora düşmüş quşa bənzədir.

136 Turşənglə təlxəki seçməyən hacı
Öldü, tapılmadı dərdə əlacı.

**Təlxək** son dərəcə acı bitkidir, buna əbucəhl qarpızı da deyilir. Turşəngi təlxəkdən ayırmamaq cəhalət və nadanlığa işarədir.

137 Öküz bürcünə bax, sən bir diqqətlƏ,
Yükünü yer kimi öküzə yüklə.
Mənzilin öküzdür, olsan da Zöhrə,
Öküz üstundəsən getsən hər yerə.

Bu beytlərdə işlədilən ökuz sözü üç məfhumu ifadə edir:

1. **Öküz burçu** (ərəbcə Sovr) 12 bürcdən ikincisi; 2. Dini mükafata görə,

küreyi-ərz öküz üzərində qərar tutmuşdur; 3. Zöhrə (Venera) ulduzu kimi nə qədər gözəl olsan da, məkanın öküz uzərindədir. Zöhrə ulduzu öz hərəkəti zamanı səmada həmişə Öküz bürcünə daxil olur.

Bu beytlərdən çıxan ümumi məna belədir: sən nə qədər çalışsan da, yenə dünyada çətinlikdən yaxa qurtara bilməyəcəksən.

138 Bir gecə ay yerə gumüş tökürdü,
Xosrov Mustafanı yuxuda gördü.

**Mustafa** - Məhəmməd peyğəmbərin adlarmdan biridir.

139 Necaşi nəqşinə bir gün son verdi...

**Nəcaşi** - həbəş padşahı.

140 O yeddi tayfada gözəl, uludur,
Aydan balığadək onun quludur.

Dini əfsanəyə görə, küreyi-ərzin ökuz üzərində, öküzün isə (nəhəng) balıq üzərində durduğuna işarədir.

Balıqdan aya və ya Aydan balığadək ifadəsi klassik poeziyada həmişə bütün dunya məfhumunu əvəz etmişdir.

141 Gecə tərk eləyib fani dünyanı,
Görməyə getmişdi Ümmi-Hanini.

Ümmi-Hani - Məhəmməd peyğəmbərin arvadı idi. Rəvayatə görə, meraça onun mənzilindən getmişdir.

142 Özünü Cəbrail göydən yetirdi,
İldırımtək nurdan Buraq getirdi.

**Cəbrail -** dini əfsanəyə görə, Allahdan Məhəmməd peyğəmbərə xəbər getirən mələkdir; **Buraq** isə başı insan başı olub, bədəni at şəklində olan qanadlı atdır ki, Məhəmmed guya ona minərək, göye - Allahın yanına uçmuşdur.

143 Fəlek əqrəbinin bağrını sökdü,
Əsədin üzünə əlini çəkdi.

**Əqrəb** səmada on iki bürcdən səkkizincisi, Əsəd (Şir) isə beşincisidir. Guya Məhəmməd merac zamanı qədim astrologiyada nəhs olan Əqrəb bürcünü pisləyib, xoşbəxtlik əlaməti olan Şir bürcünü terifləmişdir,

144 Rəhimini sardı o dörd qarının,
Qurtardı heyzindən göy qızlarının!

**Dörd qarı** dörd ünsürə - su, od, torpaq, havaya işarədir. Göy qızları isə haman Nəş qızları (Bənatünnəş) adlanan ulduzlar toplusudur. Yəni peyğəmbər dörd ünsürdən üz göndərib, Nəş qızlarını da keçdi.

145 Yusiftək dəlvdən bir şərbət içdi,
Yunis kimi Hutda duracaq seçdi.

**Dəlv** sözünün lüğəti mənası dol (vedrə), hut sözünün lüğəti mənası isə balıq deməkdir. Qedim astrologiyada isə Dəlv on iki bürcdən onbirincisi, hut onikincisidir. Bu beytlerdə iki dini əfsane xatırlanır. Birinçi misrada "Yusif və Züleyxa" dastanında qardaşları tərəfindən quyuya salınmış Yusifi yoldan keçən tacirlərin quyuya dol sallayıb çıxarmaları, ikinci misrada dinler tarixindən Yunis peyğəmbərin dənizdə naqqa balıq tərəfindən udulmasına işarədir. Yunis guya bir müddət haman balığın qamında yaşadıqdan sonra yenə bu dünyaya qayıtmışdır.

Beytin mənası: Məhəmməd peyğəmbər səmada bir-birinin ardınca bürcləri keçib, sonuncu Hut (Balıq) bürcünə çatdı.

146 Rikabında katib Sürəyya qaldı,
Sərhəng həmayilin çiyninə saldı.

Yəni Sürəyya ulduzları onun xidmətində dayanıb, sərhənglik həmayilini çiyninə salmışdır.

147 Onu oxşamazdı o reyhan, o bağ,
Gözünə vurmuşdu o, möhri-mazağ.

**Mazağ** - ərəb dilində lüqəti mənası meyl etməmək, rəğbət göstərməmək deməkdir. Yəni peyğəmbər bağa, reyhana sarı baxmadı.

148 İsrafil qanadı üstünə aldı,
Rəfrəf xanəsinə tərəf ucaldı.
Refrəfdən Tubaya vurdu ələmi,
Ordan da Sidrəyə qoydu qədəmi.

Dini rəvayətə görə **Rəfrəf** peyğəmbərin məraca getdiyi vaxt mindiyi atın adıdır. **Tuba** - behişt ağacı, **Sidrə** - Quranda yazıldığına görə, yeddinci göydə olan ağacın adıdır.

149

Qulağı çərtməkdir başın dərmanı,
Dəmüləxəveynidir Səyavuş qanı.

**Dəmüləxəveyn** - qardaş qanı deməkdir. "Şahnamə" əsərindən Səyavuşun qanını düşməndən almaq uğrunda uzun müharibə getmiş olduğundan Səyavuş qanı istilahı sonrakı şairlər tərəfindən də qələmə alınmış, istifadə edilmişdir.

150

Yaşayış vaxtında xəstə haldayıq,
Çünki vəhşi qurdla bir çuvaldayıq.

Burada: vəhşi qurd - tamaha işarədir. Beytin mənası: qəlbimizdə paxıllıq, tamah və həsəd hissi olduqca biz həmişə xəstə halda ömür sürəcəyik.

151

İbrətlə göz yuman o tutiyə bax,
Qəfəsdən "ölərək" qurtardı ancaq.

Klassik şərq poeziyasında tutinin ölüb ölümdən qurtarması ifadəsi məşhurdur. Bu misaldan bir çox məşhur orta əsr klassikləri - Nizami, Xaqani, Cəlaləddin Rumi, Sədi, Cami və başqaları istifadə etmişlər.

Qədim hind əfsanələrindən alınmış olan bu rəvayətin xülasəsi belədir:

Bir hind taciri səfərə çıxarkən bütün ailə üzvlərindən onlara hədiyyə olaraq nə gətirməyi arzu etdiklərini soruşur. Hərə bir şey arzu edir. Nəhayət, tacir qefəsdəki tutidən də nə arzu etdiyini soruşur. Tuti ona Hindistan meşələrindən keçərkən tuti yoldaşlarına salam yetirmeyi xahiş edir və deyir: "Onlara çatdır ki, sizin dostunuz bizim evdə qəfəsdə tək və tənha yaşamaqdadır".

Tacir səfərdən qayıdarkən tutiyə deyir ki, onun da arzusunu yerinə yetirmişdir. Lakin meşədə bu sözləri eşidən tutilərdən biri nagəhan yerə düşüb, çırpındı və öldü. Bu kədərli xəbəri eşidən tuti də çırpındı və bir az sonra ayaqlarını uzadıb gözlərini yumdu və yıxılıb hərəkətsiz qaldı. Bu işə heyrət eden tacir tutini ölmüş bilib, qəfəsdən çölə atdıqda, tuti qanadlanıb uçdu. Tacir bu vaxt başa düşdü ki, qəfəsdən qurtarmaq üçün özünü qəsdən ölülüyə vurmağı ona meşə tutiləri xəbər göndərmişdir.

152

Bu qara sədəfə diqqət verirkən,
Çox məna dürrünə rast gələcəksən.

**Qara sədəf-** dedikdə Nizami yazını nəzərdə tutur. Yəni bu əsərdə çoxlu məna incəliklərinə əl atacaqsan.

153

Deyirəm ki, dövran dəyişəndə bəs
Dəqyanus pulu bir arpaya dəyməz.

Dini rəvayətə görə, guya bir qrup adam zalım şah olan Deqyanusun zülmündən mağaraya gedib gizlənmiş, Allahın əmri ilə bir neçə yüz il orada

yatmış və ayıldıqda ciblərində olan pulu xərcləmək istəmişlər. Lakin əhali bu pulun Dəqyanus zamanından qaldığını deyib, onlara gulmuş və indi bu pulun heç bir qiyməti qalmadığını demişlər. Nizami öz əsəri ilə müqayisədə keçmiş əsərləri Dəqyanus dövrünün puluna oxşadır.

154 Mən məhv olub getsəm, örnəyimdir bu,
Yusif kimi itsəm, köynəyimdir bu.

"Yusif və Züleyxa" dastanına işarədir. Bu dastanda Yusifin köynəyi haqqında iki dəfə söhbət gedir:

1. Yusifi quyuya salan qardaşları onun qana bulaşdırılmış köynəyini atası Yəquba gətirib, Yusifin qurd tərəfindən parçalandığını demişlər.
2. Yusif Misirdə hökmran olduğu zaman qəhətlik illərində Kənandan yardım almaq üçün gələn qardaşlarına ianə buğda verdiyi zaman öz köynəyini kisələrdən birinin içərisinə qoyur. Atası bu köynəkdən Yusifin iyini duyub, onun diri olduğunu bilir və haman köynəyi Yusifin dərdindən ağladığı zaman kor olmuş gözlərinə sürtür və guya gözləri açılır.

Nizami yuxarıdakı beytdə ikinci əhvalatı nəzərdə tutmuşdur.

155 Tövhidlə bağlanmış başı, ayağı.

**Tövhid** - Allahın birliyinə işarədir. Bu söz vəhdət, vahid sözlərilə eyni məna daşıyır.

156 Dərgahdan çıxaraq tez bir xoşxəbər
Dəryadan qəvvasa yetirdi gövhər.

Burada üç istiarə vardır:

1. **Dərya** - padşah (şah səltənəti); 2. **Qəvvas** - Nizami (lüğəti mənası: dənizin dibindən mirvari çıxaran üzgücü); 3. **Gövhər** - peyğam (şahın göndərdiyi sifariş). Beytin mənası: bir xoşxəbər qasid şah sarayından çıxaraq, şahın sifarişini mənə çatdırdı.

157 Getdim, Kəbəyə mən həccac kimi san,
Gəldim, sanki Əhməd döndü meracdan.

**Həccac** - Məkkəyə (Kəbəyə) ziyarətə gedənlər deməkdir. Əhməd -Məhəmməd peyğəmbərin ikinci adıdır.

**Merac** - Peyğəmbərin göyə uçub Allahla görüşməsi, hərfi mənası yuxarıya qalxmaq, ucalmaq deməkdir.

**MÜNDƏRİCAT**

